**AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASININ**

# XƏBƏRLƏRİ

**BİOLOGİYA VƏ TİBB ELMLƏRİ**

**Cild 72 Nömrə 2 2017**

**Bu nömrənin elektron variantına www.jbio.az saytında baxmaq olar**



**MÜNDƏRİCAT СОДЕРЖАНИЕ CONTENTS**






*ISSN: 2078-3388*

**«ELM» REDAKSİYA-NƏŞRİYYAT VƏ POLİQRAFİYA MƏRKƏZİ**

Məqalələr **panas_bms@jbio.az** elektron ünvanına göndərilməlidir. Mümkün olmadığı halda çap olunmuş və diskə yazılmış versiyanı «Elm» Nəşriyyatına göndərə bilərsiniz.
Ünvan: «Azərbaycan Milli Elmlər Akademiyasının Xəbərləri (biologiya və tibb elmləri) Redaksiyası», İstiqlaliyyət küç., 10, Bakı AZ1001, Azərbaycan.

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 5-20 (2017)

# Azərbaycan Populyasiyasının STR Markerlərlə Tədqiqi: II. STR Markerlərin Allel Strukturu Əsasında Müqayisəli İnterpopulyasion Analiz

**N.Ş. Mustafayev[1,2,*], Ə.Ç. Məmmədov[1,2], E.R. Məmmədov[2], F.R. Hüseynova[1], Ə.B. Həsənov[2], İ.M. Hüseynova[1]**

*[1] AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu, Mətbuat prospekti, 2A, Bakı AZ1073, Azərbaycan;*E-mail: mustafayevn02@yahoo.co.uk*
*[2] Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin "Məhkəmə Tibbi Ekspertiza və Patoloji Anatomiya" Elmi-Təcrübi və Tədris Birliyi, Mirəsədulla Mirqasımov küç., 1, Bakı AZ1078, Azərbaycan*

**302 nəfərdən ibarət Azərbaycan populyasiyası əsas insan identifikasiyasının dəstini təşkil edən 15 ədəd STR markerlərlə tədqiq olunmuş, hər bir STR lokusun məhkəmə-tibbi və populyasion-genetik parametrləri müəyyən edilmişdir. Digər parametrlərlə yanaşı hər bir lokusun Hardy-Weinberg tənliyi (HWE) üzrə testlərin dəqiqliyinin *P*-kriteriyasının hesablanmış qiymətləri ($P_{HWE}$) göstərmişdir ki, populyasiyamız üçün ayrı-ayrılıqda yalnız vWA lokusu üzrə bu parametr statistik əhəmiyyətli qiymətə ($P_{vWA}$=0,0006) malikdir. 15 STR lokusun məcmusu üzrə kombinə edilmiş inkaretmə gücü (combined power of exclusion, *CPE*=0,99999935), kombinə edilmiş diskriminasiya gücü (combined power of discriminancy, *CPD*=0,9999999999999999965), kombinə edilmiş atalıq indeksi (combined paternity index, *CPI*= 1466339,18) və atalıq ehtimalı (*PP*=0,99999932) kimi parametrlərin qiymətləri isə göstərmişdir ki, tədqiq olunan populyasiya üzrə identifikasiya məsələlərində bu lokuslar toplusu tam əminliklə tətbiq oluna bilər. İlkin qiymətləndirmələr D21S11, D2S1338, D18S51 və FGA STR markerlərinin populyasiyamız üçün daha informativ olduğunu göstərir. Bundan başqa STR markerlərin allel tərkibi, allel tezlikləri və əsas populyasion-genetik parametrlər əsasında populyasiyamız ilə digər 14 dünya populyasiyaları arasında aparılan müqayisəli analizlərlə müəyyən edilmişdir ki, müqayisə olunan populyasiyalar arasında ayrı-ayrı STR lokusların allel tərkibi və aşkarlanan allellərin tezlikləri üzrə müxtəlif dərəcədə fərqlər mövcuddur. Əsaslı fərqlər STR markerlərin həm yüksək tezlikli major, həm də aşağı tezlikli minor allelər sahəsində müşahidə olunur.**

***Açar sözlər:*** *STR lokus, kombinə edilmiş diskriminasiya gücü, kombinə edilmiş inkaretmə gücü, kombinə olunmuş tipik atalıq indeksi, atalıq ehtimalı, interpopulyasion müqayisəli analizlər*

## GİRİŞ

Tədqiqatın birinci hissəsində (Mustafayev və b., 2016) qeyd olunduğu kimi autosom STR markerlərdən istifadə edərək populyasiyaların quruluşunun, başqa sözlə desək populyasiyanın genotipində rast gəlinən STR markerlərin allel tərkibinin keyfiyyət və kəmiyyətcə tədqiqi, onun genetik parametrlərinin təyini, eyni zamanda həm konkret populyasiyanı təşkil edən ayrı-ayrı qrupların öz aralarında (intrapopulyasion), həm də populyasiyaların bir-biri ilə (interpopulyasion) müqayisəli tədqiqi aktual olmaqla həm nəzəri, həm də praktiki əhəmiyyətə malikdir. Bunun başlıca səbəbi əsasən məhkəmə-tibbi ekspertiza təcrübəsində istifadə edilən və adətən 13-17 (nadir hallarda 26) ədəd STR markerdən ibarət olan multipleks topluların həddən artıq yüksək həs-saslığa, diskriminasiya (ayırdetmə) səviyyəsinə və informativliyə malik olmasıdır. Elə buna görə də adı çəkilən STR markerlər vasitəsi ilə populyasiya səviyyəsində tədqiqat işlərinin aparılması intensiv şəkildə davam etdirilir (Деренко и др., 2007; Al-Enizi et al., 2013; Butler, 2006; Dogan et al., 2014; Guang-Lin et al., 2017; Khrunun et al., 2013; Listman et al., 2010; Malyarchuk et al., 2007; Park et al., 2008; Schneider, 2007, 2012; Yingan et al., 2016 və s.).

Təsadüfi deyil ki, 2008-ci ildə 15-i tetramer (CSF1PO, D2S1338, D3S1358, D5S818, D7S820, D8S1179, D13S317, D16S539, D18S51, D19S433, D21S11, FGA, TH01, TPO və vWA), ikisi pentamer (Penta D və Penta E) olmaqla 17 ədəd autosom STR marker uzrə Beynəlxalq məlumat bazası yaradılmışdır (Pamplona et al., 2008, http://www.strdna-db.org/). Baza müvafiq STR-lərlə aparılan və çap olunan tədqiqat işlərinin nəticələrini özündə əks etdirir.

A.Jorge və həmkarları (2009) tərəfindən 50-yə qədər populyasiyanın 20 mövcud və yeni STR markerlər üzrə populyasiya tezlikləri əsasında açıq girişli "online" pop.STR adlı brauzeri yaradılmışdır (http://spsmart.cesga.es/popstr.php). Online brauzerə müxtəlif kommersiya identifikasiya kitlərinin tərkibinə daxil olan məlum 15 STR-lə yanaşı Avropa Standartları Şəbəkəsinin (ESS) tələblərinə

cavab verən 5 yeni STR marker də (D1S1656, D2S441, D10S1248, D12S391 və D22S1045) cəlb edilmişdir.

Qeyd olunan işləri davam etdirərək L.Pereira və həmkarları tərəfindən 2011-ci ildə istənilən şəxsin populyasiya mənsubiyyətini təyin etmək üçün göstərilən STR markerlərlə yanaşı cinsiyyətin təyini markeri Amelogenin də daxil olmaqla PopAffilator adlı sərbəst girişli online kalkulyator yaratdılar (Pereira et al., 2011, http://cracs.fc.up.pt/popaffiliator). Kalkulyatorun yaradılmasında rəsmi dövri jurnallarda çap olunan nəticələrlə yanaşı, ayrı-ayrı ölkələrin yerli bazalarında toplanan məhkəmə-tibbi ekspertiza materiallarından da istifadə edilmişdir. Proqramın ilkin variantı Avrasiya, Şərqi Asiya, Yaxın Şərq, Şimali Afrika, sub-Saxara (Afrika), Şimali Amerika və Mərkəzi-Cənubi Amerikanın 90-dan yuxarı subpopulyasiyasına aid və ümumi sayı 61212 olan genotip profillərinin əsasında yaradılmışdır.

Baxmayaraq ki, autosom STR markerlərin identifikasiya məsələlərində istifadəsinin yararlılığı dünya alim və mütəxəssisləri tərəfindən birqiymətli olaraq tərəddüdsüz qəbul edilmişdir, lakin bu markerlərin inter- və intrapopulyasion tədqiqatlarda populyasiya və subpopulyasiyaların bir-birindən fərqləndirmək məqsədi ilə istifadəsi birmənalı qarşılanmır. Belə ki, bu məqsədlər üçün Y və X-STR-lərin, mitoxondrial SNP-lərin tətbiqi daha məqsədəuyğun hesab edilir. Lakin, yuxarıda istinad edilən işlər, xüsusən PopAffilator-un yaradılması göstərir ki, kifayət qədər təcrübi materiala malik olmaqla və korrekt yanaşma tətbiq etməklə autosom STR markerlər də populyasiya tədqiqatlarında uğurla tətbiq edilə bilməsindən xəbər verir.

Təqdim edilən işin məqsədi Azərbaycan populyasiyasının "Human Identification Kit" reaktiv toplusuna daxil olan 15 ədəd autosom STR markerlə tədqiqini davam etdirmək olmuşdur. Bizə qədər də populyasiyamız bu aspektdə tədqiq edilmişdir, lakin öyrənilən populyasiyanın tərkib və əhatə baxımından keyfiyyəti bir qədər aşağı olmaqla, respublikanın yalnız cənub hissəsində yaşayan əhalidən ibarət olmuşdur (Nasibov et al., 2013). Hazırkı işdə biz bütün Azərbaycanı əhatə edən və 302 nəfərdən ibarət populyasiya nümunəsinin məhkəmə-tibbi və populyasion-genetik parametlərinin təyini, həmçinin allel strukturu və allel tərkibi əsasında digər dünya populyasiyaları ilə müqayisəli tədqiqinin nəticələrini təqdim edirik.

## MATERİAL VƏ METODLAR

Tədqiqat materialı olan qan nümunələri Azərbaycanın demək olar ki, bütün rayonlarında yaşayan və aralarında qohumluq əlaqələri olmayan, sorğu əsasında əcdadlarının bir neçə nəsil boyu Azərbaycan sakinləri olması güman edilən, təxminən eyni sayda qadın və kişi (153 kişi və 149 qadın) cinsinə aid 302 nəfər həddi-buluğa çatmış, sağlam könüllü şəxsdən razılığı əsasında alınmış qanlardan ayrılmış xromosom DNT-si nümunələri olmuşdur. Nümunələrin toplanması beynəlxalq bioetika qanunlarına əsasən aparılmış, bu normalara müvafiq olaraq donorların anonimliyi qorunmuş və nümunələr yalnız tədqiqat məqsədləri üçün istifadə olunmuşdur.

İstifadə olunan markerlərin xarakteristikaları, o cümlədən təcrübi hissənin bütün mərhələləri (*DNT-nin ayrılması, qatılığının təyini, polimeraza zəncir reaksiyası (PZR) və denaturasiya, elektroforez və genotipləşmə*) işin birinci hissəsində (Mustafayev və b., 2016) təsvir olunmuş və istehsalçıların təklif etdikləri uyğun metodikalarla (AmpF*l*STR®Identifiler®Di-rect PCR Amplification Kit User Guide, 2015), həmçinin Beynəlxalq Məhkəmə Tibbi Genetika Cəmiyyətinin (International Society for Forensic Genetics, ISFG) DNT Komissiyasının analoji işlərin həyata keçirilməsi üçün müəyyən etdikləri müvafiq rekomendasiyalar (Genetic diversity analysis…, 2003; Gusmao et al., 2006; Schneider, 2007) ciddi şəkildə gözlənilməklə həyata keçirilmişdir.

Tədqiqat üzrə əksər riyazi-statistik analizlər (Genetic diversity analysis with molecular marker data…, 2003) və W.Goodwin et al., (2010) işlərində göstərilən təlimatlara və riyazi aparata uyğun şəkildə aparılmışdır. Nəticələrin hesablanması əvvəlki his-sədə təsvir edilən qaydada (Botstein et al., 1980: Evett and Buckleton, 1996; Tereba, 1999) Power Stats v1.2 (Promega Corporation, USA) Microsoft Excel elekltron proqram-cədvəli ilə; müşahidə olunan ($H_{müş}$) və gözlənilən ($H_{göz}$) heterozigotluq, Bonferroni korreksiyasından sonra ($P$<0.05/15= =0.0033) Hardy-Weinberg tənliyi (Hardy-Weinberg equilibrium, HWE) üçün testlərin dəqiqliyinin $P$-kriteriyasının qiymətləri ($P_{HWE}$) təsadüfi addımlı Markov zənciri alqoritminin modifikasiya olunmuş versiyası əsasında 3.5 versiyalı Arlequin proqramı vasitəsi ilə hesablanmışdır (Excofer and Lischer, 2010).

15 STR lokusun məcmusu üzrə kombinə edilmiş inkaretmə gücü (combined power of exclusion, *CPE*), kombinə edilmiş ayırdetmə gücü (combined power of discriminancy, *CPD*), kombinə edilmiş atalıq indeksi (combined paternity index, *CPI*) və atalıq ehtimalı (paternity probability, *PP*) uyğun olaraq aşağıdakı düsturlarla hesablanmışdır:

$$CPD = 1 - \prod_{i=1}^{n}\left(1 - PD_i\right);$$

$$CPE = 1 - \prod_{i=1}^{n}\left(1 - PE_i\right);$$

$$CPI = \prod_{i=1}^{n} TPI_i; \qquad PP = {CPI}/{(1+CPI)}.$$

burada *i* – hesablamada iştirak edən lokusların sayıdır, $i_{max}$=*n*=15 (*Qeyd*: *Atalığın təyinində və şəxsiyyətin identifikasiyasında da oxşar düsturlardan istifadə olunur. Lakin onlar həmin hallarda bir qədər başqa mahiyyət daşıyırlar, burada isə hesablanmış parametrlər 15 autosom STR lokusun məcmusu üzrə həmin göstəricilərin baxılan populyasiya üçün ya-rarlığının qiymətləndirilməsinə xidmət edir*).

Müqayisəli tədqiqatlara müxtəlif sayda şəxsin tədqiq olunduğu (başqa sözlə populyasiya ölçüsünə malik) aşağıdakı populyasiyalar cəlb edilmişdir (bax: Şəkil 1):

ABŞ mənşəli hər dörd (Qafqaz (n=349), Afro-Amerika (zənci, n=357), İspan əsilli (n=290) və yerli Hindu (n=191)) populyasiya (Butler et al., 2003; AmpFlSTR®Identifiler®Direct..., 2015); Türkiyə (n=802) (Tökdemir et al., 2016); İraq (n=400) (Imad et al., 2014); Tamil, Hindistan (n=136) (Balamuru-gan et al., 2010); Əfqanıstan (n=348) (Älgenäs and Tillmar, 2014); Boliviya (n=200) (Rocabadoa et al., 2009); Sudan (n=498) (Babiker et al., 2011); Misir (n=265) (Omran et al., 2009); Rusiya (n=1118) (Semikhodskii et al., 2012); Çin, Han (n=446) (Wu et al., 2008) və Ruminiya (n=1910) (Florin et al., 2008). Müqayisəli təhlillər üçün istinad olunan məqalələrdən mövcud olan maksimum məlumatlar götürülmüşdür. Qeyd edək ki, yeri gəldikdə məqalələrdə təqdim olunan rəqəmlərin eyni formatda təqdim olunması üçün onlar ya yuvarlaqlaşdırılaraq, ya da sonuna sıfır əlavə edilərək adaptasiya edilmişdir.

Müqayisə üçün populyasiyaların seçimi aşağıdakı prinsiplərə görə aparılmışdır: 1) imkan daxilində əksər qitələri və bütün irqləri əhatə etsin; 2) tədqiqata cəlb olunan şəxslərin sayı (populyasiyaların ölçüləri) mümkün qədər böyük olsun; 4) populyasiyamızla indiyə qədər müqayisə olunmuş (Nasibov et al., 2013) populyasiyalardan fərqli olsun.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

İşin birinci hissəsindən fərqli olaraq bu tədqiqatda populyasiyamızın ölçüsü bir qədər böyüdülmüş və tədqiqata cəlb olunanların sayı 205 nəfərdən 302-yə çatdırılmışdır. Təcrübələr göstərir ki, bu addım STR markerlərin daha stabil və etibarlı göstəricilərinin əldə edilməsinə imkan verir. Buna görə də gələcək işlərimizdə tədqiqata cəlb olunan şəxslərin sayının daha da artırılması nəzərdə tutulur. Hazırkı işdə 302 nəfərdən ibarət populyasiya nümunəsinin 15 autosom STR marker üzrə əsas populyasion-genetik gösrəriciləri 1 saylı cədvəldə verilmişdir. STR markerlərin allel tərkibi və allellərin tezlikləri 2 saylı cədvəldə göstərilmişdir.

İlk öncə qeyd edək ki, Azərbaycan populyasiyası üçün 15 STR lokusun məcmusu üzrə kombinə edilmiş inkaretmə gücü (combined power of exclusion, *CPE*=0,99999935), kombinə edilmiş diskriminasiya gücü (combined power of discriminancy, *CPD*=0,999999999999999965), kombinə edilmiş atalıq indeksi (combined paternity index, *CPI*= =1466339,18) və atalıq ehtimalı (*PP*=0,99999932) kimi parametrlərin qiymətləri də hesablanmışdır. Adları çəkilən parametrlər üçün alınan qiymətlər isə göstərmişdir ki, populyasiya üzrə identifikasiya mə-sələlərində bu lokuslar toplusu tam əminliklə tətbiq oluna bilər.

Müqayisəli analizlər zamanı bir neçə hal istisna olmaqla bütün təhlil və hesabatlar STR markerlərin xarakteristikaları və istifadəsinə dair son (AmpF*l*STR ®Identifiler®Direct.., 2015) təlimatının 5-ci fəslin-də (səh. 66-72) verilən allel tərkibinə görə aparılmışdır. Başqa sözlə, standartlıq naminə yalnız allellərin reaktiv dəstinin təsvirində verilmiş "allel binləri" üzrə aşkarlanan allellər seçilmişdir. Belə hesab edirlər ki, STR markerlərin az rast gəlinən allelləri adətən tezliyi yüksək olan alllelərin müxtəlif yollarla mutasiyası sayəsində yaranır və indiyə qədər tədqiq olunan populyasiyalarda onların bir çoxlarına ya nadir hallarda rast gəlinir, ya da tamamilə rast gəlinmir. Lakin bu kommersiya reaktiv dəstlərinə (kitlərinə) daxil olan STR markerlərin siyahıda göstərilməyən allellərinin aşkarlanmayacağı anlamına gəlmir, əksinə bir qədər irəlidə belə halların, yəni nadir və unikal allellərin də bu kitlər vasitəsi ilə aşkarlana bildiyinin şahidi olacağıq. Həm buna görə, həm də bu tədqiqatın respublikamızda ilk dəfə həyata keçirildiyini nəzərə alaraq təqdim olunan məqalənin bu hissəsində biz müqayisəli təhlilləri dəstə daxil olan hər bir STR markerin allellərinin keyfiyyət və kəmiyyət göstəriciləri əsasında ayrı-ayrılıqda aparacaq və alınan nəticələri ətraflı şərh etməyə çalışacağıq (cədvəl 2 və 3).

**D8S1179:** Bu marker üzrə yalnız Sudan populyasiyası allellərin tam spektri ilə təmsil olunmuşdur. Azərbaycan populyasiyası da daxil olmaqla 11 populyasiyada 13 saylı allel, 3 populyasiyada (zənci əsilli ABŞ, Sudan və Misir) 14 saylı, bir populyasiyada isə (Tamil, Hindistan) 15 saylı allel dominantlıq təşkil edir. Boliviya populyasiyasında 8 saylı, Çin (Han) populyasiyasında isə 9 saylı allelə rast gəlinməmişdir. Baxmayaraq ki, İraq populyasiyası kifayət qədər böyük ölçüyə (n=400 nəfər) malikdir, bu populyasiyada 17, 18 və 19 saylı allellərə rast gəlinmir. Ümu-miyyətlə, nisbətən böyük ölçülü (17, 18 və 19 saylı) allellər yalnız məhdud sayda populyasiyalarda aşkarlanır. Qeyd edək ki, bu STR marker üzrə daha bir maraqlı cəhət aşkarlanmışdır - İraq populyasiyasında 8 saylı allelin tezliyi həddən artıq böyük olub (0,1270) yerdə qalan populyasiyalardan ~5-127 dəfə (uyğun olaraq, Azərbaycan və Sudan) yüksəkdir.




**Şəkil 1.** Tədqiqata cəlb olunan populyasiyaların dünya xəritəsində yeri: ✷ - Azərbaycan; ABŞ (Q, Z, İ, H) – müvafiq olaraq Qafqaz, Zənci, İspan və Hindu mənşəli ABŞ populyasiyaları; TŞ – Türkiyə (Şərqi); İ – İraq; TH – Tamil (Hindistan); Ə – Əfqanıstan; B – Boliviya; S – Sudan; MY – Misir Yuxarı; RF(A) – Rusiya Federasiyası (Avropa); Ç(H, Ş) – Çin (Han, Şanxay); RV – Rumıniya, Vallasiya

**Cədvəl 1.** Azərbaycan populyasiyası üçün 15 autosom STR markerin populyasion-genetik və forensik göstəriciləri (**n=302**).

| Göstəricilər | STR Lokuslar | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | **D8S1179** | **D21S11** | **D7S820** | **CSF1PO** | **D3S1358** | **THO1** | **D13S317** | **D16S539** | **D2S1338** | **D19S433** | **vWA** | **TPOX** | **D18S51** | **D5S818** | **FGA** |
| $H_{müş}$ | 0,8179 | 0,8841 | 0,8179 | 0,7152 | 0,8146 | 0,7781 | 0,7053 | 0,7815 | 0,8775 | 0,8113 | 0,7881 | **0,6358** | **0,8940** | 0,7185 | 0,8642 |
| $H_{göz}$ | 0,8166 | 0,8502 | 0,7980 | 0,7343 | 0,7722 | 0,7874 | 0,7635 | 0,7830 | 0,8727 | 0,8294 | 0,8008 | **0,6603** | **0,8793** | 0,7332 | 0,8738 |
| $P_{HWE}$ | 0,0670 | 0,2790 | 0,7841 | 0,5492 | 0,2441 | 0,0583 | 0,4038 | 0,0100 | 0,1171 | 0,0475 | **0,0006** | 0,2327 | 0,0091 | 0,3893 | 0,0042 |
| ***GD*** | 0,8194 | 0,8531 | 0,8007 | 0,7368 | 0,7748 | 0,7901 | 0,7661 | 0,7857 | 0,8757 | 0,8323 | 0,8035 | **0,6625** | **0,8823** | 0,7357 | 0,8768 |
| ***MP*** | 0,0560 | 0,0432 | 0,0731 | 0,1136 | 0,0998 | 0,0812 | 0,0878 | 0,0866 | 0,0321 | 0,0574 | 0,0700 | **0,1608** | **0,0306** | 0,1148 | 0,0327 |
| ***PE*** | 0,6326 | 0,7631 | 0,6326 | 0,4522 | 0,6264 | 0,5591 | 0,4365 | 0,5631 | 0,7497 | 0,6201 | 0,5571 | **0,3360** | **0,7833** | 0,4575 | 0,7231 |
| ***PD*** | 0,9440 | 0,9568 | 0,9269 | 0,8864 | 0,9002 | 0,9128 | 0,9122 | 0,9134 | **0,9679** | 0,9426 | 0,9300 | **0,8392** | 0,9664 | 0,8852 | 0,9673 |
| ***PIC*** | 0,7942 | 0,8328 | 0,7677 | 0,6875 | 0,7344 | 0,7554 | 0,7289 | 0,7500 | 0,8596 | 0,7987 | 0,7740 | **0,6119** | **0,8683** | 0,6895 | 0,8603 |
| ***TPI*** | 2,75 | 4,31 | 2,75 | 1,76 | 2,70 | 2,25 | 1,70 | 2,29 | 4,08 | 2,65 | 2,36 | **1,37** | **4,72** | 1,78 | 3,68 |

**İşarələmələr:** $H_{müş}$ – lokusların müşahidə olunan, $H_{göz}$ – gözlənilən heteroziqotluq; *GD* – genetik müxtəliflik (gene diversity); $P_{HWE}$ – Bonferroni korreksiyasından sonra ($P<0.05/15=0.0033$) Hardy-Weinberg tənliyi (Hardy-Weinberg equilibrium, HWE) üçün dəqiq testin *P*-kriteriyasının qiymətləri; *MP* – uyğunluq ehtimalı (matching probability); *PE* – lokusun inkaretmə gücü (power of exclusion); *PD* – lokusun seçicilik qabiliyyəti və ya ayırdetmə gücü (power of discriminancy); *PIC* – lokusun polimorf informasiya tutumu (polimorphic information content); *TPI* – tipik atalıq indeksi (typical paternity index); *CPE*=0,99999935; *CPD*=0,9999999999999999965; *CTPI*= 1466339,18; *PP*=0,999999932.

**D21S11:** Çoxsaylı allelə (24) malik bu STR lokus üzrə həddən artıq mürəkkəb mənzərə alınmışdır. Lokus üzrə allellərin tam dəstinə malik populyasiya yoxdur. Ən az sayda allel (10) Tamil (Hindistan), ən çox sayda allel (20) ABŞ (Zənci) və Misir (Yuxarı) populyasiyalarında aşkarlanmışdır. Allellərin əsas kütləsi (tezliyin ~80%-i) 28 (maksimumu ABŞ, zənci populyasiyasında) - 32.2 (maksimumu Boliviya populyasiyasında) saylı allellər yerləşən oblastda toplanır. 28.2 saylı allel nadir allell olub populyasiyamız da daxil olmaqla az sayda populyasiyalarda (Misir, Rusiya, Çin) rast gəlinir. Ümumiyyətlə, bəzi hallar istisna olmaqla 28-dən kiçik, 32.2-dən böyük allellər əksər populyasiyalarda aşağı tezliklərdə rast gəlinir. Lakin bəzi müşahidə olunan istisnalar, məsələn, 27 (f=0,0458, ABŞ, Qafqaz), 33 (f=0,0589, İraq), 33.2 (f=0,1100, Tamil, Hindistan), 34.2 (f=0,1066, İraq) saylı allellər hətta bəzi populyasiyalarda aşkarlanmasalar da belə, bəzilərində göründüyü kimi kifayət qədər yüksək tezliklərdə rast gəlinir (cədvəl 2). Cədvəldən göründüyü kimi öz spektrinə görə bu STR lokus yüksək interpopulyasion variabelliyə malikdir.

**D7S820:** Bu marker üzrə allellərin tam spektri ilə təmsil olunan populyasiya yoxdur. Azərbaycan populyasiyası da daxil olmaqla 7 populyasiyada 11 saylı allel, 8 populyasiyada isə 10 saylı allel dominantlıq təşkil edir. Ölçücə ən kiçik allel olan 6 saylı allel iki (ABŞ, Qafqaz və İspan), ən böyük allel olan 15 saylı allel isə cəmi bir (Rusiya) populyasiyasında müşahidə edilir. Tezliklər üzrə maksimumlar nəzərə alınmasa, ümumilikdə STR lokus özünün əsas allel spektri (7-13) boyunca stabil olub, populyasiyalarda o qədər də ciddi fərqlərə malik deyildir.

**CSF1PO:** Bu STR lokusun da allellərinin tam dəstinə malik populyasiya yoxdur. 6 saylı allel heç bir populyasiyada aşkar edilməmişdir. Ən çox təmsil olunan allellər 10, 11 və 12 saylı allellərdir. Qeyd edək ki, baxmayaraq 8 saylı allel Tamil, Hindistan populyasiyasında aşkarlanmayıb, həmin allell ABŞ, Zənci populyasiyasında kifayət qədər yüksək tezliklə (f=0,0756), eləcə də digər populyasiyalarda aşkarlanmayan və ya həddən artıq aşağı tezliyə malik 15 saylı allel İraq populyasiyasında nəzrəçarpacaq dərəcədə (f=0,0633) yüksək tezliklə özünü büruzə verir.

**D3S1358:** Baxmayaraq ki, az sayda allelə (cəmi 8 ədəd) malikdir, bu lokus üzrə mənzərə həddən artıq kontrastdır – bu kontraslıq həm allellərin tezliyi üzrə üfiqi istiqamətdə populyasiyalar boyu, həm də şaqulu istiqamətdə hər bir populyasiyada ayrı-ayrılıqda müşahidə olunur. 4 populyasiya (ABŞ (Zənci), ABŞ (İspan), Sudan və Rumıniya) tam allel dəsti ilə təmsil olunurlar. Azərbaycan populyasiyasında yalnız 13 saylı allel iştirak etmir.

**THO1:** Cəmi 9 allelə malik bu lokus üzrə də allellərin tam dəstinə malik populyasiya yoxdur və maksimumlar qeydə alınan allellərin tərkibinə görə həddən artıq maraqlı mənzərə müşahidə edilir (cədvəl 2, şəkil 2). 11 saylı allel populyasiyamızda olmasa da belə, Azərbaycan və Türkiyə (Şəqri) populyasiyalarının oxşarlığı hətta vizual olaraq nəzərə çarpır. Üç ABŞ (Qafqaz, Zənci və İspan) populyasiyasında 9 saylı allel aşkarlanmasa da, bu allel Çin, Han populyasiyasında yüksək tezliyə (f=0,5146) malikdir.

**D13S317:** Əvvəlki STR markerlərdən fərqli ola-raq bu markerdə allellərin tam dəsti ilə təmsil olunan 9 populyasiya var. Azərbaycan populyasiyası da daxil olmaqla 6 populyasiyada genotipdə markerin sonuncu alleli olan 15 saylı alleli iştirak etmir (cədvəl 2). Əksər STR lokuslarda ən kiçik (və ən böyük) ölçülü allellər adətən nisbətən kiçik (f<0,0100) təmsil olunsa da bu lokus üzrə iki populyasiyada ən kiçik allel (8) kifayət qədər yüksək tezliklərlə təmsil olunmaqla, iki populyasiyada (Tamil, Hindistan və Çin, Han) onlar maksimuma malikdirlər.

**Cədvəl 2.** Müxtəlif populyasiyalarda* autosom STR lmarkerlərin allellərinin tezliklərinin müqayisəsi.

| Allelər | Populyasiyalar (n – populyasiyanın ölçüsü və ya tədqiq olunan şəxslərin sayı) | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Azərbaycan (n=302) | ABŞ (Qafqaz, n=349) | ABŞ (Zənci, n=357) | ABŞ (İspan, n=290) | ABŞ (Aborigen (hindy), n=191) | Türkiyə (Şərqi, n=802) | İraq (14 əyalət, n=400) | Tamil (Hindis-tan, n=136) | Əfqanıstan (n=348) | Boliviya (n=200) | Sudan (18 popul-yasiya, n-498) | Misir (Yuxarı, n=265) | Rusiya (Avropa hissəsi, n=1118) | Çin (Han, Şanxay, n=446) | Rumınıya (Valla-siya, n=1910) |
| **1** | **2** | **3** | **4** | **5** | **6** | **7** | **8** | **9** | **10** | **11** | **12** | **13** | **14** | **15** | **16** |
| **D8S1179** | | | | | | | | | | | | | | | |
| **8** | 0,0248 | 0,0229 | 0,0042 | 0,0034 | 0,0052 | 0,0120 | 0,1270 | 0,0040 | 0,0120 | – | 0,0010 | 0,0150 | 0,0197 | 0,0022 | 0,0134 |
| **9** | 0,0116 | 0,0115 | 0,0042 | 0,0034 | 0,0026 | 0,0140 | 0,0064 | 0,0180 | 0,0060 | 0,0030 | 0,0030 | 0,0060 | 0,0228 | – | 0,0144 |
| **10** | 0,0911 | 0,0974 | 0,0238 | 0,0845 | 0,0471 | 0,0790 | 0,0760 | 0,1730 | 0,0910 | 0,0580 | 0,0270 | 0,0570 | 0,0815 | 0,0998 | 0,0657 |
| **11** | 0,0662 | 0,0602 | 0,0392 | 0,0586 | 0,0340 | 0,0890 | 0,1344 | 0,0660 | 0,0810 | 0,0650 | 0,0530 | 0,1080 | 0,0721 | 0,0751 | 0,0835 |
| **12** | 0,0960 | 0,1404 | 0,1331 | 0,1207 | 0,1152 | 0,1100 | 0,1153 | 0,0880 | 0,1360 | 0,1300 | 0,1130 | 0,1110 | 0,1620 | 0,1267 | 0,1029 |
| **13** | **0,2897** | **0,3252** | 0,2325 | **0,3293** | **0,3743** | **0,2430** | **0,2153** | 0,0960 | **0,2760** | **0,2900** | 0,2410 | 0,2080 | **0,3111** | **0,2287** | **0,3094** |
| **14** | 0,2500 | 0,2135 | **0,3011** | 0,2621 | 0,3063 | 0,2380 | 0,1420 | 0,1840 | 0,1850 | 0,2250 | **0,2980** | **0,2420** | 0,2099 | 0,1984 | 0,2414 |
| **15** | 0,1076 | 0,0989 | 0,2017 | 0,1086 | 0,0942 | 0,1550 | 0,0549 | **0,1950** | 0,1450 | 0,2130 | 0,1880 | 0,1910 | 0,0927 | 0,1760 | 0,1380 |
| **16** | 0,0513 | 0,0272 | 0,0462 | 0,0241 | 0,0157 | 0,0500 | 0,0181 | 0,1430 | 0,0580 | 0,0150 | 0,0600 | 0,0460 | 0,0237 | 0,0796 | 0,0291 |
| **17** | 0,0116 | 0,0029 | 0,0112 | 0,0052 | 0,0052 | 0,0100 | – | 0,0330 | 0,0120 | 0,0030 | 0,0100 | 0,0110 | 0,0031 | 0,0090 | 0,0024 |
| **18** | – | – | 0,0028 | – | – | 0,0010 | – | – | – | – | 0,0030 | 0,0040 | 0,0004 | 0,0045 | – |
| **19** | – | – | – | – | – | – | – | – | – | – | 0,0010 | – | – | – | – |
| **D21S11** | | | | | | | | | | | | | | | |
| **24** | – | – | – | – | – | – | – | – | – | – | – | – | – | – | – |
| **24.2** | – | 0,0043 | 0,0014 | 0,0017 | – | 0,0010 | – | – | – | – | 0,0030 | – | 0,0004 | – | – |
| **25** | – | – | – | – | – | – | – | – | – | – | – | – | 0,0004 | 0,0011 | 0,0003 |
| **26** | 0,0033 | 0,0014 | 0,0014 | 0,0017 | – | 0,0040 | – | – | – | – | 0,0020 | 0,0040 | 0,0022 | – | 0,0029 |
| **27** | 0,0248 | 0,0458 | 0,0504 | 0,0121 | 0,0052 | 0,0280 | – | – | 0,0040 | – | 0,0300 | 0,0360 | 0,0206 | 0,0022 | 0,0157 |
| **28** | 0,1556 | 0,1676 | **0,2297** | 0,0914 | 0,0628 | 0,1780 | 0,0614 | 0,1360 | 0,1110 | 0,0450 | 0,1230 | 0,1230 | 0,1490 | 0,0516 | 0,1285 |
| **28.2** | 0,0017 | – | – | – | – | – | – | – | – | – | – | 0,0040 | 0,0004 | 0,0112 | – |
| **29** | **0,2185** | 0,2049 | 0,1933 | 0,2121 | 0,1675 | **0,2100** | **0,1817** | **0,1910** | 0,1890 | 0,2150 | **0,2860** | **0,2680** | 0,1939 | 0,2388 | **0,2445** |
| **29.2** | 0,0017 | – | 0,0014 | 0,0052 | 0,0026 | 0,0010 | – | – | 0,0010 | – | – | 0,0020 | 0,0009 | 0,0045 | 0,0024 |
| **30** | 0,2053 | **0,2521** | 0,1723 | **0,2931** | **0,3429** | 0,2030 | 0,1393 | 0,1540 | **0,2730** | 0,1880 | 0,2260 | 0,2430 | **0,2401** | **0,2803** | 0,1924 |
| **30.2** | 0,0248 | 0,0330 | 0,0140 | 0,0293 | 0,0183 | 0,0280 | 0,1615 | 0,0220 | 0,0290 | 0,0200 | 0,0050 | 0,0130 | 0,0682 | 0,0146 | 0,0505 |
| **31** | 0,0497 | 0,0716 | 0,0798 | 0,0672 | 0,0576 | 0,0440 | 0,0596 | 0,0550 | 0,0510 | 0,0300 | 0,0820 | 0,0470 | 0,0655 | 0,1099 | 0,0529 |
| **31.2** | 0,1159 | 0,0946 | 0,0798 | 0,0862 | 0,1885 | 0,1230 | 0,0113 | 0,1140 | 0,1180 | **0,2200** | 0,0390 | 0,0890 | 0,0907 | 0,0807 | 0,1018 |
| **32** | 0,0083 | 0,0143 | 0,0112 | 0,0155 | 0,0079 | 0,0110 | 0,0485 | 0,0110 | 0,0250 | 0,0100 | 0,0170 | 0,0040 | 0,0103 | 0,0280 | 0,0071 |
| **32.2** | 0,1275 | 0,0716 | 0,0588 | 0,1293 | 0,0969 | 0,1040 | 0,0589 | 0,1840 | 0,1520 | 0,1950 | 0,0800 | 0,1060 | 0,1136 | 0,1345 | 0,1505 |
| **33** | 0,0083 | – | 0,0056 | – | 0,0052 | 0,0030 | 0,0589 | – | – | – | 0,0070 | 0,0020 | 0,0013 | 0,0022 | – |
| **33.2** | 0,0464 | 0,0330 | 0,0378 | 0,0414 | 0,0366 | 0,0560 | 0,0983 | 0,1100 | 0,0360 | 0,0600 | 0,0340 | 0,0400 | 0,0368 | 0,0359 | 0,0437 |
| **34** | 0,0033 | – | 0,0126 | – | – | – | 0,0029 | – | – | – | 0,0040 | 0,0040 | – | – | – |
| **34.2** | 0,0050 | 0,0029 | 0,0014 | 0,0086 | 0,0079 | 0,0060 | 0,1066 | 0,0220 | 0,0100 | 0,0130 | 0,0050 | 0,0060 | 0,0040 | 0,0022 | 0,0063 |
| **35** | – | – | 0,0294 | 0,0034 | – | – | 0,0112 | – | – | 0,0030 | 0,0260 | 0,0060 | – | 0,0011 | 0,0003 |
| **35.2** | – | 0,0014 | – | – | – | – | – | – | – | 0,0030 | – | – | – | 0,0022 | 0,0003 |
| **36** | – | – | 0,0084 | – | – | – | – | – | – | – | 0,0170 | 0,0020 | – | – | – |
| **37** | – | – | 0,0028 | – | – | – | – | – | – | – | 0,0050 | 0,0020 | – | – | – |
| **38** | – | – | 0,0014 | – | – | – | – | – | – | – | 0,0020 | 0,0020 | – | – | – |
| **D7S820** | | | | | | | | | | | | | | | |
| **6** | – | 0,0014 | – | 0,0017 | – | – | – | – | – | – | – | – | – | – | – |
| **7** | 0,0215 | 0,0129 | 0,0042 | 0,0172 | 0,0052 | 0,0310 | 0,0265 | 0,0400 | 0,0380 | 0,0030 | 0,0040 | 0,0110 | 0,0167 | 0,0011 | 0,0144 |
| **8** | 0,1457 | 0,1648 | 0,1877 | 0,1172 | 0,1309 | 0,1840 | 0,1896 | 0,2170 | 0,1730 | 0,0400 | 0,2280 | 0,1600 | 0,1509 | 0,1300 | 0,1482 |
| **9** | 0,1043 | 0,1762 | 0,1373 | 0,0621 | 0,0812 | 0,0920 | 0,1003 | 0,0590 | 0,0820 | 0,0500 | 0,1060 | 0,0940 | 0,1536 | 0,0639 | 0,1584 |
| **10** | 0,2235 | **0,2722** | **0,3445** | 0,2741 | 0,2199 | **0,2640** | **0,3304** | **0,2460** | 0,1980 | 0,2530 | **0,3430** | **0,3420** | **0,2936** | 0,1637 | 0,2474 |
| **11** | **0,2699** | 0,1805 | 0,1989 | **0,2879** | **0,2880** | 0,2480 | 0,2054 | 0,2100 | **0,3120** | **0,3980** | 0,2120 | 0,2450 | 0,2164 | **0,3610** | **0,2636** |
| **12** | 0,2152 | 0,1476 | 0,1078 | 0,2017 | 0,2408 | 0,1510 | 0,1115 | 0,2020 | 0,1720 | 0,2300 | 0,0910 | 0,1230 | 0,1369 | 0,2365 | 0,1398 |
| **13** | 0,0182 | 0,0372 | 0,0154 | 0,0345 | 0,0340 | 0,0260 | 0,0363 | 0,0180 | 0,0220 | 0,0280 | 0,0150 | 0,0210 | 0,0266 | 0,0404 | 0,0257 |
| **14** | 0,0017 | 0,0072 | 0,0042 | 0,0034 | – | – | – | 0,0040 | 0,0010 | – | – | 0,0020 | 0,0027 | 0,0022 | 0,0016 |
| **15** | – | – | – | – | – | – | – | – | – | – | – | – | 0,0005 | – | – |
| **CSF1PO** | | | | | | | | | | | | | | | |
| **6** | – | – | – | – | – | – | – | – | – | – | – | – | – | – | – |
| **7** | – | 0,0014 | 0,0462 | 0,0034 | – | 0,0010 | – | – | 0,0040 | – | 0,0070 | 0,0080 | 0,0009 | 0,0034 | 0,0003 |
| **8** | 0,0066 | 0,0029 | 0,0756 | 0,0017 | 0,0052 | 0,0030 | 0,0158 | – | 0,0030 | 0,0050 | 0,0480 | 0,0210 | 0,0013 | 0,0022 | 0,0037 |
| **9** | 0,0248 | 0,0172 | 0,0378 | 0,0086 | 0,0838 | 0,0250 | 0,0360 | 0,0070 | 0,0220 | 0,0080 | 0,0370 | 0,0150 | 0,0382 | 0,0448 | 0,0267 |
| **10** | 0,2450 | 0,2421 | 0,2787 | 0,2310 | 0,3089 | 0,2710 | 0,2636 | 0,2430 | 0,2660 | 0,2230 | **0,3160** | 0,2640 | 0,2776 | 0,2545 | 0,2636 |

*2 saylı cədvəlin davamı*

| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 | 9 | 10 | 11 | 12 | 13 | 14 | 15 | 16 |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **11** | 0,2997 | 0,3191 | 0,2059 | 0,2828 | 0,2199 | **0,3300** | **0,2858** | 0,3130 | 0,2700 | 0,3280 | 0,2420 | 0,3110 | 0,2817 | 0,2377 | **0,3280** |
| **12** | **0,3311** | **0,3281** | **0,2913** | **0,3966** | **0,3272** | 0,2980 | 0,2633 | **0,3530** | **0,3630** | **0,3700** | 0,2920 | **0,3380** | **0,3167** | **0,3688** | 0,3157 |
| **13** | 0,0712 | 0,0731 | 0,0532 | 0,0638 | 0,0471 | 0,0670 | 0,0622 | 0,0700 | 0,0610 | 0,0600 | 0,0480 | 0,0360 | 0,0674 | 0,0762 | 0,0518 |
| **14** | 0,0215 | 0,0143 | 0,0098 | 0,0086 | 0,0079 | 0,0040 | 0,0110 | 0,0070 | 0,0100 | 0,0080 | 0,0080 | 0,0080 | 0,0148 | 0,0101 | 0,0086 |
| **15** | — | 0,0029 | — | — | — | 0,0010 | 0,0633 | 0,0040 | 0,0010 | — | — | — | 0,0013 | — | 0,0008 |
| **D3S1358** | | | | | | | | | | | | | | | |
| **12** | 0,0017 | — | 0,0056 | 0,0017 | — | — | — | — | — | — | 0,0010 | — | — | — | 0,0003 |
| **13** | — | 0,0029 | 0,0070 | 0,0017 | — | 0,0020 | 0,0037 | — | 0,0040 | — | 0,0030 | 0,0060 | 0,0031 | 0,0011 | 0,0031 |
| **14** | 0,0629 | 0,1576 | 0,1204 | 0,0741 | 0,0681 | 0,0590 | 0,0400 | 0,0550 | 0,0620 | 0,0250 | 0,0650 | 0,0720 | 0,1168 | 0,0504 | 0,0715 |
| **15** | 0,2566 | **0,2536** | **0,3053** | **0,3914** | **0,4084** | **0,2840** | 0,2267 | 0,2830 | **0,3050** | **0,5100** | **0,3050** | **0,3080** | 0,2601 | **0,3655** | 0,2712 |
| **16** | 0,2500 | 0,2278 | 0,2857 | 0,2672 | 0,3298 | 0,2790 | 0,2394 | **0,2900** | 0,2730 | 0,3100 | 0,2630 | 0,2620 | **0,2645** | 0,2982 | **0,2911** |
| **17** | **0,2715** | 0,1819 | 0,1947 | 0,1603 | 0,0995 | 0,2330 | **0,3471** | 0,2280 | 0,2440 | 0,1230 | 0,2710 | 0,2280 | 0,2180 | 0,1951 | 0,1723 |
| **18** | 0,1474 | 0,1618 | 0,0672 | 0,0897 | 0,0838 | 0,1300 | 0,1231 | 0,1360 | 0,1040 | 0,0300 | 0,0820 | 0,1170 | 0,1267 | 0,0893 | 0,1764 |
| **19** | 0,0099 | 0,0100 | 0,0084 | 0,0103 | 0,0079 | 0,0110 | 0,0200 | 0,0070 | 0,0040 | 0,0030 | 0,0050 | 0,0090 | 0,0081 | 0,0022 | 0,0134 |
| **THO1** | | | | | | | | | | | | | | | |
| **4** | — | — | — | — | — | — | — | — | — | — | 0,0010 | — | — | — | — |
| **5** | — | 0,0043 | 0,0028 | 0,0017 | — | — | — | — | — | — | — | — | 0,0009 | — | 0,0003 |
| **6** | **0,3113** | 0,2049 | 0,1106 | 0,2276 | 0,2068 | **0,2730** | 0,0455 | 0,3240 | 0,2230 | 0,2260 | 0,2280 | 0,2060 | 0,2229 | 0,0841 | **0,2639** |
| **7** | 0,1639 | 0,2178 | **0,4286** | **0,3362** | **0,4398** | 0,1730 | 0,1713 | 0,1180 | 0,2180 | **0,5630** | **0,3970** | 0,2040 | 0,1484 | 0,2702 | 0,1534 |
| **8** | 0,1192 | 0,1146 | 0,2073 | 0,0845 | 0,0524 | 0,1370 | 0,1326 | 0,1070 | 0,1040 | 0,0150 | 0,0910 | 0,1150 | 0,1063 | 0,0583 | 0,1204 |
| **9** | **0,2053** | **0,1619** | **0,1232** | **0,1414** | 0,0628 | 0,2180 | **0,2362** | **0,3050** | **0,2930** | 0,0280 | 0,1670 | **0,3740** | 0,1969 | **0,5146** | 0,1955 |
| **9.3** | 0,1788 | **0,2908** | 0,1162 | 0,2034 | 0,2356 | 0,1810 | 0,1344 | 0,1400 | 0,1560 | 0,1680 | 0,0830 | 0,0810 | **0,3112** | 0,0437 | **0,2558** |
| **10** | 0,0215 | 0,0043 | 0,0098 | 0,0052 | 0,0026 | 0,0140 | 0,1800 | 0,0070 | 0,0060 | 0,0030 | 0,0340 | 0,0190 | 0,0126 | 0,0258 | 0,0094 |
| **11** | — | — | — | — | — | 0,0030 | — | — | — | — | — | 0,0020 | 0,0004 | 0,0011 | 0,0013 |
| **D13S317** | | | | | | | | | | | | | | | |
| **8** | 0,1175 | 0,1218 | 0,0308 | 0,0966 | 0,0497 | 0,1160 | 0,2318 | **0,2500** | 0,1690 | 0,0130 | 0,0690 | 0,1260 | 0,1261 | **0,2870** | 0,1723 |
| **9** | 0,0646 | 0,0774 | 0,0252 | 0,2172 | 0,1780 | 0,0620 | 0,0373 | 0,1070 | 0,0790 | **0,3450** | 0,0480 | 0,0940 | 0,0803 | 0,1244 | 0,0908 |
| **10** | 0,0828 | 0,0444 | 0,0378 | 0,0914 | 0,1361 | 0,0790 | 0,0546 | 0,0590 | 0,0980 | 0,1380 | 0,0270 | 0,0470 | 0,0552 | 0,1289 | 0,0565 |
| **11** | **0,3278** | 0,2980 | 0,2451 | **0,2310** | **0,2435** | 0,2570 | 0,2248 | 0,2240 | 0,2570 | 0,1600 | 0,3110 | 0,2280 | **0,3407** | 0,2220 | 0,2704 |
| **12** | **0,3113** | **0,3080** | **0,4622** | 0,2086 | 0,2304 | **0,3390** | **0,3430** | 0,2430 | **0,2900** | 0,1230 | **0,3840** | **0,3380** | 0,2531 | 0,1794 | **0,2974** |
| **13** | 0,0844 | 0,1117 | 0,1541 | 0,1017 | 0,0785 | 0,1190 | 0,0534 | 0,0630 | 0,0840 | 0,1430 | 0,1280 | 0,1190 | 0,0974 | 0,0460 | 0,0893 |
| **14** | 0,0116 | 0,0372 | 0,0434 | 0,0534 | 0,0812 | 0,0290 | 0,0551 | 0,0370 | 0,0220 | 0,0730 | 0,0310 | 0,0470 | 0,0444 | 0,0112 | 0,0225 |
| **15** | — | 0,0014 | 0,0014 | — | 0,0026 | — | — | 0,0040 | — | 0,0080 | 0,0010 | 0,0020 | 0,0018 | — | 0,0008 |
| **D16S539** | | | | | | | | | | | | | | | |
| **5** | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — |
| **8** | 0,0182 | 0,0172 | 0,0322 | 0,0172 | 0,0079 | 0,0520 | 0,1788 | 0,1140 | 0,0260 | 0,0050 | 0,0390 | 0,0360 | 0,0242 | 0,0056 | 0,0115 |
| **9** | 0,1573 | 0,1046 | 0,1905 | 0,0931 | 0,1230 | 0,1440 | 0,1012 | 0,1250 | 0,2070 | **0,3180** | 0,1890 | 0,1510 | 0,1113 | 0,2522 | 0,1194 |
| **10** | 0,0695 | 0,0559 | 0,1092 | 0,1579 | 0,1545 | 0,0870 | 0,2185 | 0,1320 | 0,1110 | 0,2380 | 0,0690 | 0,1040 | 0,0507 | 0,1143 | 0,1073 |
| **11** | **0,2930** | **0,3195** | **0,3151** | **0,3017** | **0,3089** | 0,2940 | **0,2510** | **0,2720** | **0,2860** | 0,1700 | **0,3200** | **0,2680** | 0,2819 | **0,2556** | **0,3126** |
| **12** | 0,2715 | 0,3023 | 0,1877 | 0,2948 | 0,2775 | **0,2990** | 0,0987 | 0,1950 | 0,2330 | 0,1900 | 0,2050 | 0,2550 | **0,2980** | 0,2410 | 0,2670 |
| **13** | 0,1639 | 0,1676 | 0,1485 | 0,1155 | 0,1073 | 0,1100 | 0,1003 | 0,1470 | 0,1180 | 0,0730 | 0,1470 | 0,1620 | 0,1943 | 0,1177 | 0,1545 |
| **14** | 0,0265 | 0,0301 | 0,0154 | 0,0207 | 0,0209 | 0,0130 | 0,0515 | 0,0110 | 0,0140 | 0,0080 | 0,0310 | 0,0250 | 0,0346 | 0,0123 | 0,0264 |
| **15** | — | 0,0029 | 0,0014 | — | — | 0,0010 | — | 0,0040 | 0,0040 | — | 0,0010 | — | 0,0045 | 0,0011 | 0,0013 |
| **D2S1338** | | | | | | | | | | | | | | | |
| **15** | 0,0099 | — | 0,0014 | — | — | 0,0010 | 0,0583 | — | — | — | 0,0010 | — | **0,0013** | — | 0,0005 |
| **16** | 0,0281 | 0,0473 | 0,0532 | 0,0241 | 0,0262 | 0,0400 | **0,2015** | 0,0070 | 0,0200 | 0,0100 | 0,0510 | 0,0400 | 0,0436 | 0,0045 | 0,0374 |
| **17** | 0,1722 | **0,1734** | 0,1078 | 0,2121 | 0,0995 | 0,1900 | 0,1383 | 0,0660 | 0,1160 | 0,1780 | 0,1390 | **0,2320** | **0,1855** | 0,0572 | **0,2042** |
| **18** | 0,0762 | 0,0630 | 0,0560 | 0,0414 | 0,0707 | 0,1170 | 0,0785 | 0,2210 | 0,1260 | 0,0680 | 0,0910 | 0,1360 | 0,0854 | 0,1344 | 0,1086 |
| **19** | 0,1308 | 0,1375 | **0,1415** | **0,2276** | **0,2958** | 0,1120 | 0,1513 | 0,1360 | **0,1560** | **0,3430** | **0,2090** | 0,1130 | 0,1321 | 0,1648 | 0,0804 |
| **20** | 0,1142 | 0,1461 | 0,0602 | 0,1379 | 0,0969 | 0,1350 | 0,0587 | 0,0920 | 0,1470 | 0,1350 | 0,1280 | 0,1510 | 0,1509 | 0,1256 | 0,1539 |
| **21** | 0,0248 | 0,0258 | 0,1401 | 0,0259 | 0,0238 | 0,0540 | 0,0388 | 0,0368 | 0,0230 | 0,0280 | 0,0600 | 0,0620 | 0,0413 | 0,0202 | 0,0262 |
| **22** | 0,0248 | 0,0401 | 0,1317 | 0,0741 | 0,1518 | 0,0460 | 0,0612 | 0,0700 | 0,0490 | 0,0450 | 0,1280 | 0,0620 | 0,0220 | 0,0404 | 0,0238 |
| **23** | **0,1904** | 0,1146 | 0,1078 | 0,1136 | 0,1178 | **0,1530** | 0,0083 | **0,2320** | 0,1500 | 0,1380 | 0,0910 | 0,0920 | 0,0889 | **0,2242** | 0,1230 |
| **24** | 0,1275 | 0,1175 | 0,0980 | 0,0845 | 0,0785 | 0,0830 | 0,0717 | 0,0630 | 0,1080 | 0,0450 | 0,0560 | 0,0580 | 0,0997 | 0,1570 | 0,1165 |
| **25** | 0,0828 | 0,1060 | 0,0812 | 0,0517 | 0,0314 | 0,0540 | 0,0617 | 0,0670 | 0,0940 | 0,0100 | 0,0350 | 0,0430 | 0,1208 | 0,0605 | 0,1105 |
| **26** | 0,0132 | 0,0272 | 0,0196 | 0,0069 | 0,0079 | 0,0090 | 0,0717 | 0,0070 | 0,0070 | — | 0,0090 | 0,0080 | 0,0225 | 0,0067 | 0,0131 |
| **27** | 0,0033 | 0,0014 | 0,0014 | — | — | 0,0050 | — | — | 0,0030 | 0,0030 | 0,0010 | 0,0020 | 0,0022 | 0,0034 | 0,0013 |
| **28** | — | — | — | — | — | 0,0010 | — | — | — | — | 0,0010 | — | 0,0022 | — | 0,0005 |
| **D19S433** | | | | | | | | | | | | | | | |
| **9** | — | 0,0014 | — | 0,0017 | — | 0,0010 | 0,0939 | — | — | — | 0,0020 | — | 0,0004 | 0,0011 | 0,0003 |
| **10** | — | — | 0,0154 | — | — | — | 0,0082 | — | — | — | 0,0140 | 0,0080 | — | — | — |
| **11** | 0,0166 | 0,0072 | 0,0714 | 0,0052 | 0,0052 | 0,0060 | 0,1834 | 0,0040 | 0,0060 | 0,0080 | 0,0190 | 0,0110 | 0,0054 | 0,0011 | 0,0037 |
| **12** | 0,0778 | 0,0774 | 0,1078 | 0,0621 | 0,0314 | 0,1000 | 0,1570 | 0,0660 | 0,0610 | 0,0280 | 0,0750 | 0,1130 | 0,0960 | 0,0325 | 0,0976 |

*2 saylı cədvəlin davamı*

| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 | 9 | 10 | 11 | 12 | 13 | 14 | 15 | 16 |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **12.2** | — | 0,0057 | 0,0630 | 0,0190 | — | — | 0,1148 | 0,0150 | 0,0040 | 0,0130 | 0,0100 | 0,0080 | 0,0013 | 0,0067 | 0,0021 |
| **13** | 0,2285 | 0,2894 | **0,2983** | 0,1603 | 0,1780 | 0,2460 | 0,0726 | **0,3350** | 0,2570 | 0,1630 | 0,2250 | 0,2280 | 0,2511 | **0,2982** | 0,2874 |
| **13.2** | 0,0397 | 0,0172 | 0,0574 | 0,0862 | 0,1545 | 0,0210 | **0,2169** | 0,0110 | 0,0390 | 0,1630 | 0,0550 | 0,0340 | 0,0179 | 0,0471 | 0,0162 |
| **14** | **0,2815** | **0,3410** | 0,2101 | **0,3172** | **0,2487** | **0,2660** | 0,0745 | 0,2170 | **0,2850** | **0,3300** | **0,2610** | **0,2470** | **0,3417** | 0,2422 | **0,3024** |
| **14.2** | 0,0248 | 0,0086 | 0,0420 | 0,0500 | 0,0366 | 0,0410 | 0,0424 | 0,0590 | 0,0490 | 0,0600 | 0,0780 | 0,0530 | 0,0193 | 0,1065 | 0,0335 |
| **15** | 0,1507 | 0,1576 | 0,0476 | 0,1345 | 0,1335 | 0,1130 | 0,0109 | 0,1180 | 0,1210 | 0,1480 | 0,0920 | 0,1430 | 0,1498 | 0,0807 | 0,1361 |
| **15.2** | 0,1225 | 0,0272 | 0,0336 | 0,0879 | 0,1073 | 0,1020 | 0,0598 | 0,0920 | 0,1040 | 0,0400 | 0,0820 | 0,0570 | 0,0422 | 0,1379 | 0,0401 |
| **16** | 0,0331 | 0,0415 | 0,0238 | 0,0431 | 0,0393 | 0,0580 | — | 0,0550 | 0,0390 | 0,0350 | 0,0330 | 0,0530 | 0,0390 | 0,0123 | 0,0505 |
| **16.2** | 0,0149 | 0,0172 | 0,0238 | 0,0293 | 0,0183 | 0,0360 | — | 0,0260 | 0,0270 | 0,0080 | 0,0330 | 0,0400 | 0,0215 | 0,0280 | 0,0236 |
| **17** | 0,0033 | 0,0029 | — | 0,0017 | 0,0079 | 0,0060 | — | 0,0040 | 0,0030 | 0,0030 | 0,0080 | 0,0040 | 0,0040 | — | 0,0024 |
| **17.2** | 0,0066 | 0,0029 | 0,0028 | — | 0,0288 | 0,0050 | — | — | 0,0040 | 0,0030 | 0,0070 | — | 0,0054 | 0,0045 | 0,0031 |
| **vWA** | | | | | | | | | | | | | | | |
| **11** | — | — | 0,0028 | 0,0017 | — | — | — | — | — | — | — | — | — | — | — |
| **12** | — | — | — | — | 0,0026 | 0,0020 | — | — | — | — | 0,0020 | — | — | — | 0,0005 |
| **13** | 0,0033 | 0,0043 | 0,0126 | — | 0,0026 | 0,0110 | — | — | 0,0040 | 0,0080 | 0,0030 | 0,0020 | 0,0031 | 0,0011 | 0,0016 |
| **14** | 0,1192 | 0,0831 | 0,0714 | 0,0690 | 0,0445 | 0,0820 | 0,0917 | 0,1770 | 0,0910 | 0,0130 | 0,0770 | 0,0870 | 0,0932 | **0,2433** | 0,1487 |
| **15** | 0,0960 | 0,1132 | 0,2003 | 0,1000 | 0,0707 | 0,0940 | 0,0594 | 0,1140 | 0,0690 | 0,0450 | 0,1560 | 0,1040 | 0,1102 | 0,0381 | 0,0932 |
| **16** | 0,1937 | 0,2335 | **0,2675** | **0,3431** | 0,3298 | 0,2240 | **0,2824** | 0,2060 | 0,2340 | 0,3480 | **0,2590** | **0,2920** | 0,1850 | 0,1895 | 0,1929 |
| **17** | **0,3195** | **0,2450** | 0,2059 | 0,2155 | **0,3351** | **0,2900** | 0,2806 | **0,2570** | **0,2720** | **0,4000** | 0,2450 | 0,2720 | **0,2666** | 0,2276 | **0,2940** |
| **18** | 0,1589 | 0,2249 | 0,1471 | 0,1845 | 0,1545 | 0,1960 | 0,0588 | 0,1320 | 0,2170 | 0,1380 | 0,1550 | 0,1640 | 0,2348 | 0,1659 | 0,1908 |
| **19** | 0,1043 | 0,0831 | 0,0672 | 0,0707 | 0,0471 | 0,0860 | 0,0212 | 0,0990 | 0,0910 | 0,0480 | 0,0750 | 0,0660 | 0,0936 | 0,1121 | 0,0668 |
| **20** | 0,0033 | 0,0115 | 0,0196 | 0,0138 | 0,0105 | 0,0140 | 0,2059 | 0,0150 | 0,0140 | 0,0030 | 0,0240 | 0,0130 | 0,0134 | 0,0213 | 0,0097 |
| **21** | 0,0017 | — | 0,0028 | 0,0017 | 0,0026 | 0,0010 | — | — | 0,0030 | — | 0,0030 | — | — | 0,0011 | 0,0018 |
| **22** | — | — | 0,0028 | — | — | — | — | — | — | — | 0,0010 | — | — | — | — |
| **23** | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — |
| **24** | — | 0,0014 | — | — | — | — | — | — | — | — | — | — | — | — | — |
| **TPOX** | | | | | | | | | | | | | | | |
| **6** | — | 0,0014 | 0,0672 | 0,0034 | — | 0,0020 | — | — | — | 0,0030 | 0,0060 | 0,0090 | 0,0004 | — | 0,0003 |
| **7** | 0,0017 | — | 0,0224 | 0,0034 | 0,0026 | 0,0020 | — | — | 0,0040 | — | 0,0050 | 0,0060 | **0,0013** | — | 0,0021 |
| **8** | **0,4983** | **0,5330** | **0,3613** | **0,4966** | 0,3796 | **0,4990** | 0,0197 | 0,2320 | **0,5250** | **0,6630** | **0,3900** | **0,4830** | **0,5739** | **0,5101** | **0,4890** |
| **9** | 0,0960 | 0,1160 | 0,2115 | 0,0724 | 0,0419 | 0,1260 | 0,0383 | 0,2210 | 0,1170 | 0,0200 | 0,2920 | 0,2110 | 0,0824 | 0,1480 | 0,1128 |
| **10** | 0,1076 | 0,0430 | 0,0924 | 0,0466 | 0,0340 | 0,0970 | 0,1013 | 0,0960 | 0,0770 | 0,0100 | 0,1000 | 0,0620 | 0,0676 | 0,0123 | 0,0589 |
| **11** | 0,2632 | 0,2593 | 0,2143 | 0,2724 | **0,3927** | 0,2380 | **0,2637** | **0,4150** | 0,2430 | 0,2000 | 0,1890 | 0,2170 | 0,2498 | 0,3016 | 0,3047 |
| **12** | 0,0364 | 0,0473 | 0,0308 | 0,1052 | 0,1492 | 0,0340 | 0,2005 | 0,0290 | 0,0290 | 0,1050 | 0,0170 | 0,0110 | 0,0242 | 0,0247 | 0,0317 |
| **13** | — | — | — | — | — | 0,0010 | 0,1985 | 0,0070 | 0,0060 | — | 0,0010 | — | 0,0004 | 0,0022 | 0,0005 |
| **14*** | — | — | — | — | — | — | 0,1780 | — | — | — | — | — | — | 0,0011 | — |
| **D18S51** | | | | | | | | | | | | | | | |
| **7** | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — |
| **9** | — | — | 0,0014 | — | — | — | — | — | — | 0,0030 | 0,0020 | 0,0020 | — | — | — |
| **10** | 0,0033 | 0,0086 | 0,0028 | 0,0052 | 0,0079 | 0,0050 | 0,0086 | 0,0150 | 0,0070 | 0,0050 | 0,0040 | 0,0020 | 0,0094 | 0,0045 | 0,0079 |
| **10.2** | — | — | 0,0014 | — | — | — | 0,0208 | — | — | — | 0,0010 | 0,0020 | — | — | — |
| **11** | 0,0199 | 0,0115 | 0,0028 | 0,0121 | — | 0,0320 | 0,0454 | 0,0330 | 0,0250 | 0,0080 | 0,0100 | 0,0080 | 0,0153 | 0,0056 | 0,0113 |
| **12** | 0,1258 | 0,1390 | 0,0700 | 0,1034 | 0,1492 | 0,1270 | 0,1782 | 0,0220 | 0,0620 | 0,0950 | 0,1010 | **0,1660** | 0,0930 | 0,0348 | 0,1092 |
| **13** | 0,1258 | 0,1218 | 0,0434 | 0,1448 | 0,0916 | 0,1390 | **0,2459** | 0,1580 | 0,1330 | 0,1700 | 0,0870 | 0,1040 | 0,1096 | 0,1839 | 0,1254 |
| **13.2** | — | — | 0,0042 | — | — | — | — | — | 0,0010 | — | 0,0020 | 0,0020 | — | — | — |
| **14** | **0,1887** | **0,1676** | 0,0686 | 0,1552 | **0,2696** | **0,1930** | 0,1700 | **0,2720** | **0,2300** | **0,2500** | 0,0960 | 0,1280 | 0,1608 | **0,2186** | **0,1715** |
| **14.2** | — | — | 0,0028 | — | — | — | — | — | — | — | 0,0010 | 0,0020 | — | — | — |
| **15** | 0,1358 | 0,1361 | **0,1937** | **0,1655** | 0,1204 | 0,1450 | 0,1044 | 0,1910 | 0,1620 | 0,1730 | 0,1110 | 0,1280 | **0,1824** | 0,1558 | 0,1450 |
| **16** | 0,1275 | 0,1361 | 0,1653 | 0,1172 | 0,1073 | 0,1220 | 0,1471 | 0,1100 | 0,1130 | 0,1150 | 0,1360 | 0,1340 | 0,1491 | 0,1379 | 0,1552 |
| **17** | 0,0894 | 0,1232 | 0,1821 | 0,1414 | 0,1466 | 0,1080 | 0,0473 | 0,0740 | 0,0950 | 0,1180 | **0,1400** | 0,1020 | 0,1262 | 0,0717 | 0,1503 |
| **18** | 0,0712 | 0,0774 | 0,1190 | 0,0672 | 0,0262 | 0,0590 | 0,0111 | 0,0550 | 0,0610 | 0,0300 | 0,1140 | 0,0740 | 0,0746 | 0,0381 | 0,0529 |
| **19** | 0,0629 | 0,0444 | 0,0602 | 0,0414 | 0,0393 | 0,0470 | 0,0064 | 0,0480 | 0,0430 | 0,0200 | 0,0780 | 0,0620 | 0,0364 | 0,0549 | 0,0403 |
| **20** | 0,0331 | 0,0172 | 0,0490 | 0,0224 | 0,0183 | 0,0180 | 0,0112 | 0,0110 | 0,0380 | 0,0080 | 0,0590 | 0,0300 | 0,0229 | 0,0392 | 0,0154 |
| **21** | 0,0132 | 0,0100 | 0,0210 | 0,0103 | 0,0131 | 0,0030 | 0,0112 | — | 0,0190 | 0,0050 | 0,0340 | 0,0260 | 0,0108 | 0,0336 | 0,0110 |
| **22** | 0,0017 | 0,0043 | 0,0070 | 0,0052 | 0,0079 | 0,0020 | — | 0,0040 | 0,0090 | — | 0,0130 | 0,0080 | 0,0049 | 0,0123 | 0,0026 |
| **23** | 0,0017 | 0,0014 | 0,0043 | 0,0052 | 0,0026 | 0,0010 | — | 0,0040 | 0,0010 | 0,0030 | 0,0030 | — | 0,0040 | 0,0034 | 0,0010 |
| **24** | — | 0,0014 | — | 0,0017 | — | — | — | 0,0040 | 0,0010 | — | — | — | 0,0040 | 0,0034 | 0,0003 |
| **25** | — | — | — | 0,0017 | — | — | — | — | — | — | — | — | — | — | 0,0003 |
| **26** | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | 0,0011 | 0,0003 |
| **27** | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — | — |
| **D5S818** | | | | | | | | | | | | | | | |
| **7** | 0,0033 | — | 0,0014 | 0,0672 | 0,1571 | — | — | 0,0040 | 0,0190 | 0,1580 | 0,0010 | — | 0,0076 | 0,0135 | 0,0018 |
| **8** | 0,0132 | — | 0,0546 | 0,0069 | — | 0,0030 | — | — | 0,0010 | — | 0,0840 | 0,0510 | 0,0013 | 0,0011 | 0,0008 |

güclənməsi quraqlığa davamlı noxud sortlarında (Гунес и др., 2008), soyuğa davamlı noxud (Kumar et al., 2011), düyü (Huang, Guo, 2005) və arpa (Dai et al., 2009) genotiplərində müşahidə olunmuşdur. Lakin bu zaman müdafiə sisteminin digər komponentləri də (prolin, qlisin-betain, antioksidant fermentlər və s.) aktivləşir ki, bu da stres zamanı həmin genotiplərdə AsT-nun rolunu dəqiq qiymətləndirməyə imkan vermir. Quraqlıq zamanı ekzogen AsT təsirindən buğda bitkisində transpirasiyanın intensivliyi artır. Bu zaman askorbat turşusunun miqdarının artması ağızcıqların keciriciliyini artırır. Agızcıqların vəziyyətinin tənzimlənməsində AsT-nun iştirakı molekulyar genetik metodların köməyi ilə təsdiqlənmişdir (Chen, Gallie, 2004). Belə ki, dehidroaskorbatreduktazanın güclü ekspressiyasına malik bitkilərdə agizciqların baglı olduğu hüceyrələrdə hidrogen peroksidin miqdarı ağızcıqları açıq olan hüceyrələrlə müqayisədə daha az olur. AsT həm də askorbat peroksidazanın substratı kimi fotosintetik aparatın oksidləşdirici zədələnmələrdən müdafiəsində iştirak edir (Kaur, Nayyar, 2014). Ekzogen AsT soya bitkisinin agır metalların təsirinə davamlılığını artırmaqla yanaşı, həm də lipidlərin peroksidləşmə məhsulu olan malondialdehidinin (MDA) miqdarının azalmasına və antioksidant fermentlərin fəallığının artmasına səbəb olmuşdur (Саиди-Сар и др., 2007).

**Qlutation:** Bitkilərdə qlutationun (GSH) ümumi miqdarı təqribən 0,1–10,0 mM təşkil edir (Wonish, Schaur, 2001). Qlutationun və onun sintezində iştirak edən fermentlərin əsas kütləsi xloroplastlarda toplanmışdır. GSH həm də sitoplazmada sintez oluna bilir. Qlutation 307 kDa molekul çəkili polifunksional tripeptid olub bitki və heyvan orqanizmlərində iştirak edir. Oksidləşmə stresi zamanı o, OFF və eləcə də disulfid rabitələri olan birləşmələrlə əlaqəyə girərək onları zərərsizləşdirməklə yanaşı həm də askorbat-qlutation tsiklinin fermentlərindən olan qlutation peroksidaza, qlutation-S-transferazanın substratı kimi də funksiya göstərir. Bilavasitə antioksidant xassəyə malik olmaqla yanaşı qlutation həm də hüceyrənin redoks homeostazının tənzimlənməsində siqnal funksiyasını da həyata keçirir (Han et al., 2013a).

Antioksidant maddə kimi qlutation (GSH) sərbəst radikalları tutaraq GS-radikal əmələ gətirir və sonra dimerləşərək disulfidə (oksidləşmiş forma – GSSG) çevrilır:


$$GSH + HO^{\bullet} \rightarrow H_2O + GS^{\bullet}$$
$$2\ GS^{\bullet} \rightarrow GSSG$$

Bundan başqa qlutation qlutation peroksidazanın iştirakı ilə hidrogen peroksidin və üzvi peroksidlərin detoksifikasiyasında iştirak edir:


$$2GSH + H_2O_2 \rightarrow GSSG + 2H_2O$$

$$2GSH + ROOH \rightarrow GSSG + H_2O + ROH$$

Hal-hazırda xloroplastlarda hidrogen peroksidin qlutationun iştirakı ilə detoksifikasiyasının iki yolunun mümkünlüyü nəzərdən keçirilir (Гришко, Сыщиков, 2012). Birinci halda GSH hidrogen peroksidi qlutation peroksidazanın iştirakı ilə reduksiya edir. $H_2O_2$ reduksiyasında ikinci yol askorbat turşusunun askorbatperoksidaza fermentinin təsiri ilə dehidroaskorbat turşusuna qədər oksidləşməsi nəticəsində baş verir. Əmələ gələn dehidroaskorbat askorbat turşusuna ya GSH-ın qeyri fermentativ oksidləşməsi hesabına, ya da fermentativ yolla dehidroaskorbat və yaxud qlutationdehidrogenazanın iştirakı ilə reduksiya oluna bilər.

Qlutationun oksidləşmiş və reduksiya olunmuş formaları arasındakı nisbət müxtəlif təbiətli stressorların təsirindən dəyişə bilir. Bitki hüceyrələrində onların miqdarı stressorun təbiətindən və təsir müddətindən asılıdır. Orta dərəcəli quraqlığın təsirindən yazlıq buğda yarpaqlarında qlutationun reduksiya olunmuş formasının miqdarının azalması, lakin bu zaman GSH/GSSG nisbətinin artması müşahidə olunmuşdur (Chen et al., 2004). Bununla yanaşı müəlliflər qeyd edirlər ki, quraqlığa cavab olaraq bitkidə sistein və qlutamilsisteinin miqdarı, eləcə də qlutamilsisteinsintetaza, qlutationsintetaza, qlutationreduktaza fermentlərinin fəallığı artmışdır. Müxtəlif buğda genotiplərinin istiyə davamlılığı ilə qlutationun reduksiya olunmuş forması arasında müsbət korelyasiyanın olduğu müəyyən olunmuşdur (Dash, Mohanty, 2002). Wang və həmmüəllifləri (2012) öz tədqiqatlarında qeyd edirlər ki, quraqlığın təsirindən davamlı düyü genotiplərində GSH-ın miqdarının azalması davamsız genotiplərlə müqayisədə az nəzərəçarpan olmuşdur. Müxtəlif bitkilərdə duz stresi zamanı qlutationun və onun sintezini və çevrilmələrini kataliz edən fermentlərin rolu haqqında ədəbiyyatda məlumatlara rast gəlinir (Waskiewicz et al., 2014). Ümumiyyətlə, müxtəlif kənd təsərrüfatı bitkiləri üzərində aparılan tədqiqatların nəticələri göstərir ki, bitkilərin stressorun (torpağın ağır metallarla çirklənməsi (Smirnoff, 2000), radiasiya (Horemans, 2000), quraqlıq (Esfandiari et al., 2008), şoranlıq (Joseph and Jini, 2011) təsirinə davamlılığı askorbat turşusunun və qlutationun miqdarından asılıdır.

Bir çox müəlliflər bitkilərin ağır metalların təsirindən müdafiəsində qlutationun rolunu tədqiq etmışlər. Belə ki, Arabidopsis bitkisinə Cd ionlarının təsiri qlutationun sintezində iştirak edən fermentlərin genlərinin mRNT-nin və fitoxelatinsintaza fermentinin geninin induksiyasını gücləndirmişdir (Semane et al., 2007). Eyni zamanda qlutationun reduksiya olunmuş formasının miqdarının azalması, fitoxelatinlərin miqdarının isə artması qeyd olunmuşdur. Hal-hazırda müəyyən olunmuşdur ki, agır metalların təsiri zamanı qlutation nəinki bitkini oksidləşdirici stresin təsirindən qoruyur, həm də fitoxelatinlərin sintezi üçün ilkin material

olaraq ağır metalların tutulmasında iştirak edir (Гришко, Сыщиков, 2012).

Qlutation həmçinin hüceyrədə redoks siqnal funksiyasını da yerinə yetirir. Hüceyrədə hidrogen peroksidin miqdarının artması qlutationun oksidləşmiş formasının toplanmasına və sistemdə oksidləşmə-reduksiya potensialının çoxalmasına gətirib çıxarır ki, bu da öz növbəsində qlutationun *de novo* sintezi üçün siqnal olur (Noctor et al., 2012). Qlutation redoks-siqnalın iştirakçısı kimi bitki hüceyrələrinin genetik aparatının transduksiyasında salisil turşusuna siqnal ötürülməsində iştirak edir (Han et al., 2013a). Müəyyən olunmuşdur ki, yabanı arabidopsis bitkisində ekzogen qlutationun təsirindən PR1 geninin ekspressiyası güclənir. Ekzogen salisil turşusu yabanı tip arabidopsis bitkisində PR1 geninin ekspressiyasını gücləndirir, lakin qlutation olmayan cad2 mutantlarda bu effekt çox zəif olmuşdur. Qlutation həm də jasmin turşusuna siqnal ötürülməsində iştirak edir. Arabidopsis mutantlarında (cad2) jasmin turşusunun nəzarət etdiyi VSP2 və PDF1.2a genlərinin ekspressiyasının zəif olması müşahidə olunmuşdur (Han et al., 2013b). Eyni zamanda müşahıdə olunmuşdur ki, ekzogen qlutation jasmindən asılı genlərin (LOX3, JAZ10, VSP2) ekspressiyasını stimullaşdırır (Han et.al., 2013b).

Beləliklə, qlutation bitkilərin adaptasiya reaksiyalarında çoxşaxəli funksiyaları yerinə yetirir: hüceyrədə siqnalların transduksiyası, ağır metalların tutulması, ksenobiotiklərin detoksifikasiyası, zülal molekullarında tiol qruplarının reduksiyası və s. (Szalai et al., 2009; Han et al., 2013a; b).

**Tokoferol:** Tokoferol (vitamin E) yağda həll olan antioksidantlardandır. Molekulunda olan metil qruplarının sayından və yerləşdiyi vəziyyətdən asılı olaraq onun bir neçə formasına rast gəlinir: α-, β-, γ-tokoferollar (Путилина и др., 2008). Tokoferol-lar ali bitkilər, yosunlar və sianobakteriyalar da da-xil olmaqla yalnız fotosintez qabiliyyətinə malik orqanizmlər tərəfindən sintez olunur (Waskiewicz et al., 2014). Bitkidə onun miqdarı quru çəkiyə görə yarpaqda 1 mkq/q, isə 0,1 mq/q-a qədər olur. (Munne-Bosch, Alegre, 2002). Adətən vegetativ orqanlar α-tokoferollarla, toxumlar isə γ-tokoferol-larla zəngin olur, β- və δ-tokoferollara isə nisbətən az rast gəlinir (Velasco et al., 2013; Waskiewicz et al., 2014).

Tokoferolun sintezi plastidlərin membranında baş verir. Onun əsas funksiyası oksidləşdirici stresin təsirindən hüceyrənin lipid fazasında əmələ gələn oksigenin fəal formalarını zərərsizləşdirməkdən ibarətdir. Bir tokoferol molekulu 120 sinqlet oksigen molekulunu neytrallaşdmaq qabiliyyətinə malikdir (Jaleel et al., 2009). OFF ilə (superoksid anion radikal, hidroksil radikal) qarşılıqlı təsirdə olaraq α-tokoferol α-tokoferolxinona cevrilir ki, bu da öz növbəsində xloroplastda yenidən α-tokoferola reduksiya olunur (Kobayashi et al., 2008; Kruk et al., 2008).

Hüceyrədə tokoferolun sintezi müxtəlif stressorlar və fitohormonlar tərəfindən induksiya olunur (Szarka et al., 2012). Bir sıra müəlliflərin işlərində onun biosintezinin fotosintez prosesində əmələ gələn OFF tərəfindən tənzimləndiyi də qeyd olunur (Munne-Bosch et al., 2007). Stressorun təsirindən tokoferolun miqdarının dəyişməsi iki mərhələdə baş verir: birinci mərhələdə OFF-nin zərərsizləşdirilməsində müdafiə rolunu oynayan tokoferolun miqdarı artır; ikinci mərhələdə isə stressor güclü və uzunmüddətli olarsa tokoferolun deqradasiyası onun sintezini üstələyir. Fotosintez edən orqanizmlərdə quraqlığın, ağır metalların, duzun, yüksək intensivlikli işığın təsirindən tokoferolun miqdarı dəyişir (Collakova, DellaPenna, 2003; Ledford et al., 2004; Tounekti et al., 2011 a,b; Waskiewicz et al., 2014). Maeda və həmmüəliiflər (2006) tokoferol-çatışmayan arabidopsis mutantları ilə apardığı təcrübələrdə bu bitkilərin normal bitkilərə nəzərən aşağı-temperatura daha davamsız olduğu qənaətinə gəlmişlər. Müəyyən olunmuşdur ki, α-tokoferolun çatışmaması Arabidopsis bitkisinin inkişafını zəiflədir (Munne-Bosch et al., 2007). Bu bitkilərdə jasmin turşusunun miqdarı artır ki, bu da müvafiq jasmonat siqnallarının formalaşmasına səbəb olur. Tokoferolların sintezi zədələnmiş arabidopsis bitkisində duz stresinin təsiri zamanı karotinoid və antosianların sintezi artmışdır (Semchuk et al., 2009).

**Karotinoidlər:** Tokoferollar kimi karotinoidlər (vitamin A) də lipid fazanın fenollu antioksidantlarından hesab olunur. Bu birləşmələr sarı, narıncı və qırmızı rəngdə olurlar. Əksər karotinoidlər ikiqat rabitəli $C_{40}$ karbon skeletindən təşkil olunmuşlar. Məhz bu ikiqat rabitələr xromofor funksıyasını yerinə yetirərək konkret karotinoidin spektral xüsusiyyətlərini özündə əks etdirir (Смоликова, Медведев, 2015). Həm sərbəst, həm də qlikozidlər formasında olan karotinoidlər zülal və membran lipidləri ilə qeyri-kovalent rabitələrlə birləşə bilirlər. Bitkinin yaşıl orqanlarının xloroplastlarında lokalizasiya olunan karotinoidlər yerləşdiyi yerdən asılı olaraq müxtəlif funksiyalar yerinə yetirirlər. Belə ki, tilakoid membranalrında yerləşən Kar fotosintezin işıq reaksiyalarında iştirak edərək işıqtoplayan kompleksin quruluşunun stabilliyini təmin edir (Cuttriss et. al., 2004). Xloroplastların membranlarında lokalizasiya olunan Kar ABT-nin sintezində iştirak edirlər (Shumskaya, Wurtzela, 2013). Karotinoidlərə həm də ali bitkilərin toxumlarında da rast gəlinir (Смоликова, Медведев, 2015). Karotinoidlərin antioksidant xassəsi triplet xlorofilin və sinqlet oksigenin iştirakı ilə baş verən zədələnmələri aradan qaldırmaqdan ibarətdir. Bu zaman onlar ya triplet xlorofilin həyəcanlanma enerjisini qəbul edib onu istilik şəklində paylayır, ya da sinqlet oksigen molekulunu söndürürlər (Смоликова, Медведев, 2015). Kar radikal şəklində olan OFF

ilə, xüsusən də peroksid radikalları ilə reaksiyaya girirlər (Gill, Tuteja, 2010). Kar tərəfindən sərbəst radikalların tutulmasının ən azı 4 tipi məlumdur:



$$RO^{\bullet} + Kar \rightarrow RO^{-} + Kar^{\bullet+}$$
$$RO^{\bullet} + Kar \rightarrow RO^{+} + Kar^{\bullet-}$$
$$RO^{\bullet} + Kar \rightarrow ROH^{\bullet} + Kar(-H)^{\bullet}$$
$$RO^{\bullet} + Kar \rightarrow (RO - Kar)^{\bullet}$$

Bəzi müəlliflərə görə OFF özü də karotinoidlərin sintezini induksiya edə bilir (Bouvier et al., 1998). Karotinoidlərin bitkinin antioksidant müdafiəsində rolu danılmaz olsa da, müxtəlif stressorların təsirindən onların miqdarının dəyişməsi haqqında fikirlər ziddiyyətlidir. Belə ki, Cd bitkiyə təsiri zamanı Kar miqdarının həm atrması, həm də azalması müşahidə olunur (Rai et al., 2005; Demirevska-Kepova et al., 2006; Gill, Tuteja, 2010). Bu bir tərəfdən stresin təsirindən Kar sintezinin induksiyası, digər tərəfdən isə güclü stresin təsirindən onun deqradasiyası ilə izah oluna bilər.

**Flavonoidlər:** Flavonoidlər (vitamin P) molekulunda bir və ya bir neçə hidroksil qrupuna malik benzol həlqəsi saxlayan təbii heteroaromatik birləşmələrdir. Bitkidə gedən bioloji proseslərə cavabdeh olan bu fenollu birləşmələr bitki çiçəklərinə və meyvələrinə parlaq rəng verirlər. Onların əsas rolu bitkidə böyümə və çoxalma proseslərini tənzimləməkdən ibarətdir. Bundan başqa, fenollu birləşmələr hüceyrə divarlarının qurulmasında substrat kimi istifadə edilir, ultrabənövşəyi filtrlərin tərkibinə daxil olaraq bitkini müxtəlif zədələyici təsirlərdən qoruyurlar. Fenollu birləşmələr bəzi bakteriya ştamlarının inkişafını zəiflədə və hətta tamamilə dayandıra bilirlər, virus təbiətli fermentləri (məs: əks transkriptaza, proteaza) inhibirləşdirirlər. Bu zaman bitki təbiətli polifenolların insan və heyvan hüceyrələrinə mənfi təsiri çox cüzi olur. İndiyə qədər bitkilərdən 4000-dən artıq müxtəlif polifenol maddə alınmışdır. Polifenollardan flavonoidlər, fenollu turşular və izoflavonoidlər bitkilərdə daha çox rast gəlinir və hal-hazırda geniş surətdə öyrənilməkdədir.

Bioloji aktiv maddələrdən olan flavonoidlər əsasən, meyvə və tərəvəzlərin kök, gövdə, qabıq və çiçəklərində, həmçinin çay və şərab kimi içkilərin tərkibində toplanır. Flavonoidlərin bioloji fəal maddə olması haqqında ilkin məlumat 1936-cı ildə portağaldan yeni tip maddə aldıqdan sonra verildi və bu maddə P vitamini adlandırıldı. Sonradan bu maddənin flavonoidlər qrupundan olan rutin olması təsdiqləndi və bu tədqiqatlar müxtəlif bitki təsirli flavonoidlərin alınması və təsir mexanizmlərinin öyrənilməsi üçün əsas oldu.

Flavonoid molekulunun fenol karkası 3 karbon atomu ilə birləşmiş 2 aromatik həlqədən (A və B) təşkil olunaraq, ümumilikdə 15 karbon atomundan ibarətdir. Flavonoidlərin ümumi formulu $C_6$–$C_3$–$C_6$ kimi qeyd olunur. Benzol həlqələrində hidroksil qruplarının olmasından, ikiqat rabitələrin yerindən asılı olaraq flavonoidləri təqribən 10-13 sinfə bölürlər ki, bura da əsasən flavanlar, flavonlar, flavonollar, flavanonlar, flavononollar, katexinlər, antosianlar, izoflavonlar, xalkonlar, neoflavonoidlər və s. daxildir. Flavonlar qrupuna apigenin, xrizin, kempferol, lyüteolin, mirisetin, rutin, sibelin, kvarsetin və s. aiddir. Bu qrupdan olan flavonoidlər kifayət qədər öyrənilmişdir. Mirisetin çoxlu miqdarda çayda, meyvədə, giləmeyvədə, soğanda, dərman bitkilərində rast gəlinir. Kvarsetin də geniş tədqiq olunan flavonlardan olub bəzi meyvə və giləmeyvələrdən - üzümdən, brokkolidən, kərəvüzdən, cəfəridən, zeytun, soğan, qırmızı şərab və çaydan alınmışdır. Kempferol çoxlu miqdarda brokkolidə aşkar olunmuşdur.

Demək olar ki, bütün flavonoidlər bu və ya digər şəkildə bitkinin stresdən müdafiəsində iştirak edirlər. Flavonoidlərin antioksidant xassəsi radikal proseslərdə iştirak edən metal ionlarını xelatlaşdırmaqda və həmçinin sərbəst radikalları tutmaq qabiliyyətində təzahür edir (Es-Safi et al., 2007). Bəzi tədqiqatlarda flavonoidlərin digər antioksidantlarla müqayisədə daha yüksək fəallığa malik olduğu göstərlmişdir. Məs., Xleskina və həmmüəlliflərinin tədqiqatlarında qeyd olunur ki, flavonoidlərin OFF və azotun aktiv formaları ilə ilə qarşılıqlı əlaqəsinin effektivliyi askorbin turşusu və α-tokoferolla olan əlaqədən 4 dəfə yüksəkdir (Khlestkina et al., 2013). Flavonoidlər əsasən vakuolda lokalizasiya olunur və bu kompartmentə ötürülən hidrogen peroksidin detoksifikasiyasında iştirak edirlər (Gould, Lister, 2006). Flavonoidlər OFF ilə birbaşa qarşılıqlı təsirdə olmaqla yanaşı, həm də dolayı yolla da antioksidant təsirə malikdirlər. Onların əsas təsir mexanizmlərindən biri artıq işıq enerjisini (xüsusən ultrabənövşəyi şüaları) udmaqdan ibarətdir ki, bu yolla da işıqla induksiya olunan oksidləşdirici stresin təsirini azaldırlar (Deckmyn, İmpens, 1997; Treutter, 2006; Bilger et al., 2007). Flavonoidlərlə yanaşı antosianlar da fotosintetik aparatın işıqdan müdafiəsində iştirak edirlər. Yüksək gərginlikli işıqlanma zamanı antosianlar optik filtr rolunu oynayaraq elektron-nəqliyyat zəncirini yüksək enerjili kvantlardan mühafizə edirlər. Buna görə də antosianları karotinoidlərlə birgə qeyri-kimyəvi müdafiə mexanizmlərinə aid edirlər (Макаревич и др., 2010). Antosianlar fotosintez zamanı fotonları absorbsiya edərək yarpağın müdafiəsini həyata keçirirlər. Qırmızı yarpaqların daha çox işıq udmasına baxmayaraq, onların fotosintetik toxumaları yaşıl yarpaqlarla nisbətdə daha az kvant qəbul edir, çünki antosianların lokalizasiya olunduğu vakuollar tərəfindən udulan enerji xloroplasta ötürülə bilmir (Gould et al., 2002).

Müxtəlif təbiətli stressorların təsirindən bitki hüceyrələrində flavonoidlərin miqdarı dəyişə bilir. Arabidopsis bitkisində aşağı temperaturda və yüksək intensivlikli işığın təsiri zamanı antosianların və

flavonoidlərin miqdarının artması müşahidə olunmuşdur (Havaux, Kloppstech, 2001; Munne-Bosch et al., 2002). UB şüaların təsirindən xiyar bitkisində (Kondo, Kawashima, 2000), qaranlıqda böyüdülmüş noxud bitkisinin yarpaqlarında (Jordan et al., 1994), çovdar bitkisində (Deckmyn, Impens, 1997) flavonoidlərin sintezinin gücləndiyi qeyd olunmuşdur. Azot catışmazlığı da arabidopsis bitkisində flavonoidlərin sintezinin induksiyasına səbəb olur. Müəyyən olunmuşdur ki, bu prosesdə əsas transkript-faktorlar olan MYB və bHLH iştirak edir (Lea et al., 2007). Şaxtaya davamlı buğda sortlarının aşağı temperatura adaptasiyası zamanı da flavonoidlərin miqdarının artması müşahidə edilmişdir (Олениченко и др., 2008). Temperaturun aşağı düşməsi sorqo bitkisində antosianların sintezinin artmasına səbəb olmuşdur (Shichijo, 1993). Analoji nəticələr qarğıdalı bitkisi ilə aparılan təcrübələrdə də qeyd olunmuşdu (Christie et al., 1994). Çiyələyin patogenlə yoluxması flavonoidlərin biosintezini gücləndirir (Casañal et al., 2013). Qaragilə (*Vaccinium myrtillus*) flavonoidlərlə zəngin bitkilərdən hesab olunur. Koskimäki və həmmüəllifləri (2009) qaragilə bitkisinin endofit göbələklərdən (*Paraphaeosphaeria* sp.) və patogendən (*Botrytis cinerea*) müdafiəsində flavonoidlərin rolunu tədqiq etmişlər. Müəyyən olunmuşdur ki, bütün yoluxmuş nümunələrdə fenollu turşuların, flavanların və oliqomer proantosianidinlərin biosintezi artmışdır.

Beləliklə, flavonoidlər bitkilərdə antioksidant təsirə malik müxtəlif fizioloji funksiyaları yerinə yetirirlər. Antioksidant müdafiə funksiyası ilə yanaşı onlar hüceyrədə osmoprotektor rolunu yerinə yetirir, agır metalları birləşdirir və həmçinin siqnalların ötrülməsində iştirak edirlər.

**Prolin:** Prolin bitkinin çoxfunksiyalı metabolitlərindən hesab olunur. O, kiçik molekullu şaperon tipli fermentlərin, o cümlədən də oksidləşdirici stres fermentlərinin nativ quruluşunun qorunub saxlanmasında yaxından iştirak edir (Liang et al., 2013). Müxtəlif təbiətli stressorların təsirindən (quraqlıq, şoranlıq, şaxta, ağır metallar, radiasiya, patogen və s.) bitki hüceyrələrində prolinin miqdarı artır (Hossain et al., 2014). Çovdar bitkisinin soyuğa akklimasiyası zamanı prolinin miqdarı təqribən 10 dəfə artmışdır (Koster et al., 1992). Digər tərəfdən şaxtaya davamlı buğda bitkisindən fərqli olaraq çovdar cücərtiləri konstitutiv soyuğa davamlılıq göstərmiş və onlarda prolinin yuksək miqdarı aşkarlanmışdır (Колупаев и др., 2015). Özündə çoxlu miqdarda prolin toplayan çiyələk sortları aşağı temperaturlara daha çox davamlılıq göstərmiş və antioksidant fermentlərin yüksək fəallığı ilə fərqlənmişlər (Luo et al., 2011). Transgen bitkilərlə aparılan təcrübələr də prolinin bitkilərin stresdən müdafiəsində mühüm rol oynadığını sübut edir. Belə ki, *Vigna aconitifolia* bitkisindən transformasiya olunmuş P5KC geninin ekspresiyasının gücləndiyi tütün bitkisi nəzarət variantla müqayisədə 10-18 dəfə artıq prolin sintez edir və yüksək duzadavamlılığı ilə xarakterizə olunur (Kavi Kishor et al., 2005). İkizəncirli RNT-supressor prolin dehidrogenaza daşıyan regenerant günəbaxan bitkisi torpaq quraqlığı zamanı prolinin yüksək miqdarı və osmotik stresə davamlılığı ilə fərqlənmişdir (Комисаренко и др., 2015).

Bəzi tədqiqatlarda ekzogen prolinin bitkinin stresə davamlılığında müsbət rol oynadığı qeyd edilir. Məs., ekzogen prolinin təsirindən noxud bitkisinin istiyə davamlılığı artmışdır (Kaushal et al., 2011). Ekzogen prolin duz stresinə məruz qalmış 6 günlük düyü cücərtilərində hidrogen peroksidinin miqdarının azalmasına səbəb olmuşdur (Nounjan and Theerakulpisut, 2012). Bu zaman prolin əlavə olunmuş variantda superoksiddismutazanın və askorbat peroksidazanın fəallığı prolin əlavə olunmamış variantla müqayisədə daha aşağı olmuşdur. In vitro şəraitdə prolin düyü cücərtilərində arsenitin təsirindən denaturasiyaya məruz RNTaza fermentinin fəallığını bərpa etmişdir (Mishra, Dubey, 2006).

Ümumiyyətlə, bitkinin stres şəraitdə fəaliyyətində prolin çoxşaxəli funksiyalara malikdir. Stres zamanı o, nəinki antioksidant, həm də prooksidant xassələrə malik olur. Mitoxondridə prolinin katabolzmi OFF-nin əmələ gəlməsinin güclənməsinə səbəb ola bilər (Miller et al., 2009). Patogenlə yoluxmuş arabidopsis bitkisində prolinin sintezinin artması prolindehidrogenaza fermentinin fəallığının və ona uyğun genin ekspressiyasının güclənməsi ilə müşayiət olunur (Cecchini et al., 2011). Bəzi tədqiqatlarda ekzogen prolinin təsirindən askorbat turşusunun və qlutationun miqdarının artması qeyd olunur (Kaushal et al., 2011). Kolupayev və həmmüəllifləri (Колупаев и др., 2015) yumşaq buğda cücərtilərinin şaxtaya davamlılığında prolin və karbohidratlarların rolunu qeyd etmişlər. Həmçinin aşağı temperaturlarda şaxtayadavamlı taxıllar prolinin sintezini gücləndirmək qabiliyyətinə malikdirlər. Çox güman ki, prolin molekulyar şaperon funksiyasını yerinə yetirərək stres zamanı antioksidant fermentlərin fəallığının saxlanılmasına təsir edir. Stresin təsirindən bitkilərdə prolinin sintezinin induksiyası bir sıra siqnal ($Ca^{2+}$ ionları, OFF) və hormonal (ABT, ST) funksiyaya malik maddələrin vasitəsilə baş verir (Liang et al., 2013).

Bitkilərin stresə davamlılığında prolinin çoxşaxəli funksiyalara malik olması haqda həddən artıq məlumatların toplanmasına baxmayaraq, bu orqanizmlərin abiotik stresə davamlılığı ilə prolinin miqdarının artması arasında əlaqənin olması haqqında fikirlər birmənalı deyil. Belə ki, bəzi tədqiqatçılar arpa bitkisinin duzadavamlılığı ilə prolinin miqdarı arasında heç bir korrelyasiya aşkar etməmişlər (Widodo et al., 2009). Duza və soyuğa həs-

sas arabidopsis mutantlarında isə prolinin yüksək miqdarı müşahidə olunmuşdur (Xin, Browse, 1998). Soyuğa davamlı düyü genotiplərinin yarpaq və gövdəsində normal və aşağı temperaturlarda prolinin miqdarı həssas genotiplərlə müqayisədə aşağı olmuşdur (Aghaee et al., 2011). Bir sıra tədqiqatlarda qeyd olunduğu kimi prolinin miqdarının artması ilə bitkinin bu və ya digər stresə davamlılığı arasında asılılığın olmaması həmin bitkilərdə digər stresprotektor mexanizmlərin (məs., antioksidant ferment sistemi, və ya digər osmolitlərin toplanması və s.) daha güclü olması ilə izah oluna bilər. Bitkilərdə prolin iki yolla – qlutamat və ya ornitin yolu ilə sintez oluna bilər. Belə hesab olunur ki, stressorların təsiri ilə induksiya olunan prolinin sintezi qlutamat yolu ilə baş verir (Liang et al., 2013). Bu yolun əsas fermenti Δ1 -pirrolin-5-karboksilatsintazadır (P5KC, KФ 2.7.2.11.1.2.1.41). Əksər bitkilərdə P5KC əsasən iki genlə kodlaşır və uyğun olaraq iki molekulyar forma ilə təmsil olunur – P5KC1 və P5KC2 (Armengaud et al., 2004). P5KC1 sitoplazma və xloroplastlarda, P5KC2 isə ancaq sitoplazmada lokalizasiya (Szekely et al., 2008; Szabados, Savoure, 2010). Prolinin deqradasiyası mitoxondrilərdə baş verir ki, bu zaman prolinin deqradasiyasının sürəti prolindehidrogenazanın fəallığından asılı olur (Liang et al., 2013). Stressorların təsirindən prolinin miqdarının artması onun sintezinin sürətinin və katabolizminin dəyişməsi ilə bağlı ola bilər. Stresin təsirindən bitkilərdə prolinin sintezinin induksiyası bir sıra siqnal ($Ca^{2+}$ ionları, OFF) və hormonal (ABT, ST) funksiyaya malik maddələrin vasitəsilə baş verir. Prolinin sintezində Ca-un rolu bəzi bitkilərdə geniş öyrənilmişdir. Duz stresinə məruz qalmış Casuarina equisetifolia şitillərinə kalsium duzları ilə təsir etdikdə də anoloji nəticələr alınmışdır (Liang et al., 2013).

**Qlisin-betain:** Qlisin-betain (QB) əsasən bir çox yosun və ali bitkilərin hüceyrələrində əmələ gəlir. Hüceyrə daxilindəki miqdarı onların sintez və katabolizm sürətləri arasındakı balansla tənzimlənən prolindən və digər osmolitlərdən fərqli olaraq hüceyrədə bir dəfə əmələ gələn qlisin-betain sonradan katabolik çevrilmələrə məruz qalmır. Belə hesab olunur ki, qlisin-betainin hüceyrə daxilindəki qatılığı onun biosintez və floemadan toxumaya daşınma sürətlərindən asılıdır. Qlisin-betain xloroplastlarda xolindən əmələ gəlir. Proses iki mərhələdə baş verir: birinci ferment – xolinmonooksigenaza fotosintetik reduksiya olunmuş ferredoksin və molekulyar oksigendən istifadə edərək xolinin betain aldehidə qədər oksidləşməsini kataliz edir; ikinci ferment – betainaldehiddehidrogenaza betain aldehidinin qlisin-betainə oksidləşməsini kataliz edir. Hər iki ferment ayrılmış, təmizlənmiş və onların kDNT-ləri alınmışdır. Tədqiqatlar göstərmişdir ki, bitkinin yetişdirildiyi məhlulda osmotik təzyiqi artdıqda hər iki fermentin fəallığı bir neçə dəfə çoxalır və eyni zamanda onların transkriptlərinin miqdarı da artır. Bitkini daha sonra adi suya keçirdikdə transkriptlərin miqdarı azalır. Müxtəlif bitkilərdə xolinin miqdarı eyni olmur. İspanaqda (*Spinacia oleracea*) və şəkər çuğundurunda (*Beta vulgaris*) xolin etanolaminfosfatın metilləşməsi zamanı xolinfosfatın əmələ gəlməsi hesabına yaranır. Sonra xolinfosfat hidroliz edərək xolinə çevrilir (Russell et al., 1998). İspanaqda xolinin biosintezinə cəlb olunan fermentin fəallığı ətraf mühitdə duzun qatılığı çox olduqda daha yüksək olur. Arpada (*Hordeum vulgare*) xolin membranın tərkibində olan fosfatidilxolinin fosfolipidə çevrilməsi yolu ilə əmələ gəlir (André and Tetsuko, 2001). Hüceyrədə qlisin-betainin toplanması bitkinin quraqlığa- və duzadavamlılıq qabiliyyətini artırır. Su çatışmazlığı və duz stresi zamanı qlisin betain toplayan bitkilər nisbi su tutumunu və turqor təzyiqini daha yüksək səviyyədə saxlamaq və daha böyük fotosintezetmə qabiliyyətinə malik olurlar. Kənd təsərrüfatı bitkilərinin böyük əksəriyyəti QB toplamaq qabiliyyətinə malik deyillər. Bitkilərin quraqlığa- və duzadavamlılığını artırmaq məqsədilə qlisinbetainin biosintezinə cavabdeh olan fermentlərin genlərini daşıyan transformantların alınması istiqamətində bir sıra tədqiqatlar aparılmışdır. Bu zaman məlum olmuşdur ki, xolinin betain-aldehidə çevrilməsinə cavabdeh olan bakterial xolindehidrogenaza fermentinin geni transformasiya olunmuş tütün bitkisi (*Nicotiana tabacum*) yabanı forma ilə müqayisədə duz stresi zamanı daha yüksək böyümə və inkişaf tempinə malik olmuşdur (Yang et al., 2005).

Müəyyən olunmuşdur ki, qlisin betain bitkilərdə bir çox fermentləri yüksək temperaturun təsirindən inaktivasiyadan müdafiəsində iştirak edir (Paleg et al., 1998). Fotosistem II yüksək temperatura həssasdır. Bitki hüceyrələrinə betainlərin ekspressiyasını gücləndirən genlərin daxil edilməsi fotosistemin zülallarının müdafiəsində yaxından iştirak edir (Mamedov et al., 1993; Allakhverdieva et al., 2001). Xolindehidrogenaza fermentini kodlaşdıran bakterial betA geninin tütün bitkisinə köçürülməsi transgen bitkilərin duzadavamlılıq qabiliyyətini güclənməsinə və yaşıl biokütlənin artmasına səbəb olmuşdur (Lilius et al., 1996). Düyü bitkisi nisbətən duzadavamlı hesab olunur. betA geninin ekspressiyası düyü bitkisinin xloroplastlarında qlisinbetainin toplanmasına və duzadavamlılğın artmasına səbəb olmuşdur (Takabe et al., 1997). Betainaldehiddehidrogenaza geninin ispanaga daxil edilməsi qlisinbetainin sintezini gücləndirməklə bitkinin istiyədavamlılığını artırmışdır. Belə ki, hətta 45°C temperaturda belə bitki fotosintez qabiliyyətinə malik olur (Yang et al., 2005). Xolinoksidazanın codA geninin arabidopsis və düyü bitkilərinin genomuna daxil edilməsi transgen bitkilərin xloroplastlarında qlisin-

betainin miqdarının çoxalmasına səbəb olmuşdur ki, bu da həmin bitkilərin duza, aşağı və yüxarı temperaturlara və şüalanmaya qarşı davamlılığını artırmışdır (Murata, 1998; Sakamoto et al., 1998). Yüksək temperatura davamlılıq, xolinoksidazanın fəallığı və qlisinbetainin toplanması arasında korrelyasiya müşahidə olunmuşdur. Sitozolunda və xloroplastlarında yüksək miqdarda qlisinbetain toplayan transgen düyü bitkisində fotosintez proseslərinin tədqiqi göstərmişdir ki, xloroplastlarında QB lokalizasiya olunan transgen bitkilər sitozolunda QB lokalizasiya olunan bitkilərlə müqayisədə daha davamlı olurlar (Alia et al., 1998).

**Antosianlar:** Antosianlar ikinci metabolitlərdən olub suda həll olan piqmentlər sinfinə daxildirlər. Onların quruluşu ilk dəfə 1913-cü ildə alman alimi R.Vilştetter tərəfindən müəyyən olunmuş, 1928-ci ildə isə ilk dəfə ingilis kimyaçısı R.Robinson tərəfindən kimyəvi yolla sintez olunmuşdur (Запрометов, 1993). Anatomik olaraq vakuolda lokalizasiya olunan antosianlar əsasən epidermisdə (85%) və periferik mezofildə (15%) toplanırlar. Antosianlar kation olduqlarından hüceyrədə onlar üzvi turşuların duzları şəklində mövcud olurlar. pH-ın neytral qiymətlərində onlar qeyri-stabil rəngsiz psevdoəsaslar əmələ gətirirlər. Buna görə də antosianların ekstraksiyası zəif turş mühitdə aparılır. Bitkilərdən alınmış antosianlar və antosianidlər qırmızı və bənövşəyi-qirmızı rəngdə olur. Bitkilərdə bu maddələr bir çox funksiyaları yerinə yetirirlər ki, bunlardan biri də günəşdən müdafiədir (Костюк и Потапович, 2004). Antosianlar bitkilərin aşağı temperaturlara davamlılığını artırırlar. Vegetasiyanın başlanğıcında bəzi bitkilərdə antosianların sintezi fenollu birləşmələrin sintezi ilə üst-üstə düşür. İşıqdan müdafiə funksiyası ilə yanaşı antosianlar həm də antioksidant rolunu oynayırlar. Bununla yanaşı onların sərbəst radikalların neytrallaşdırılmasındakı rolu tam aydın deyil. Çünki vakuolda yerləşdiklərinə görə antosianlar məkanca oksigenin fəal formalarından ayrı yerləşirlər. Buna baxmayaraq bəzi tədqiqatlarda göstərilmişdir ki, digər orqanellalarda yaranan peroksidlər vakuolyar antosianlarla neytrallaşa bilirlər (Масленников, 2003).

**Riboflavin:** Riboflavin suda həll olan vitamin (B2) olub təbiətdə geniş yayılmışdır. Bir sıra mikroorqanizmlər riboflavin sintez etmək qabiliyyətinə malikdirlər. Bu maddə daha çox dənli bitkilərdə toplandığından həmin bitkilər B2 vitamininin mənbəyi hesab oluna bilər. İnsan qidası üçün riboflavin mənbəyi süd məhsulları hesab olunur. Riboflavin tənəffüs fermentlərindən olan – flavinadeninmononukleotid və flavinadenindinukleotidin kofermentinin tərkibiə daxildir. Məhlulda bu maddə kifayət qədər davamlıdır, onun parçalanma sürəti işıqdan və mühitin pH-dan asılıdır: qələvi mühitdə riboflavin parçalanır, turş mühitdə isə temperaturun artmasına davamlıdır. Təbiətdə riboflavinə 3 formada rast gəlinir: sərbəst riboflavin və onun koferment formaları - flavinmononukleotid və flavinadenindinukleotid. Riboflavinin koferment formalarının əmələ gəlməsi əsasən ATF və iki ferment – flavokinaza və flavinnukleotidfosforilaza vasitəsilə həyata keçir. Onun bioloji rolu oksidləşmə-reduksiya qabiliyyətinə malik olması nəticəsində orqaqnizmdə bir çox maddələr mübadiləsi reaksiyalarında iştirakı ilə əlaqəlidir. Heyvanlarda riboflavin çatışmazlığı ilə qanda lipdlərin peroksidləşmə məhsulları, katarakt və ateroskleroz arasında birbaşa əlaqə mövcuddur. Bu fakt lipidlərin peroksidləşmə məhsullarının sintez və parçalanmasının molekulyar mexanizmlərinin tədqiqində flavoproteinlərin mühüm rolunu göstərir. Bəzi flavoproteinlər tərkibində flavinmononukleotid və flavinadenindinukleotidlə yanaşı həm də qeyri-üzvi ionlar - dəmir və molibden də saxlayır, onlar da elektronların nəqli proseslərini kataliz etmək qabiliyyətinə malik olurlar. Bu fermentlərin kataliz etdiyi 2 tip kimyəvi reaksiyaları göstərmək olar: birinci tip reaksiyalarda ferment oksigenin iştirakı ilə ilkin substratı və ya araliq metaboliti birbaşa oksidləşdirir. Bu qrup fermentlərə L- və D-aminturşuların oksidazalarını, qlisinoksidazanı, aldehidoksidazanı, ksantinoksidazanı aid edirlər. İkinci tip reaksiyalarda flavoproteinlər elektronun və protonun ilkin substratdan deyil, reduksiya olunmuş piridin kofermentindən nəqlini kataliz edirlər.

## ƏDƏBİYYAT

**Гришко В.Н., Сыщиков Д.В.** (2012) Функционирование глутатионзависимой антиоксидантной системы и устойчивость растений при действии тяжелых металлов и фтора. Киев: Наук. думка, 239 с.

**Гунес А., Инал А., Адак М.С., Багци Е.Г., Цицек Н., Ераслан Ф**. (2008) Влияние засухи до и после зацветания растений нута на ряд физиологических параметров – возможных критериев засухоустойчивости. *Физиология растений*, **55(1):** 64-72

**Запрометов М.Н.** (1993) Фенольные соединения: распространение, метаболизм и функции в растениях. М.: Высш. шк., 185 с.

**Колупаев Ю.Е., Рябчун Н.И., Вайнер А.А., Ястреб Т.О., Обозный А.И.** (2015) Активность антиоксидантных ферментов и содержание осмолитов в проростках озимых злаков при закаливании и криострессе. *Физиология растений*, **63(4):** 533-541.

**Комисаренко А.Г., Михальская С.И., Курчий В.М., Сытник С.К., Сергеева Л.Е., Тищенко Е.Н.** (2015) Физиологобиохимическая характеристика трансгенных растений подсолнечника

с двухцепочечным РНК-супрессором гена пролиндегидрогеназы. *Физиология растений и генетика*, **47(2):** 160-166.

**Костюк В.А., Потапович А.И.** (2004) Биорадикалы и биоантиоксиданты. Минск: БГУ, 179 с.

**Макаревич А.М., Шутова А.Г., Спиридович Е.В., Решетников В.Н.** (2010) Функции и свойства антоцианов растительного сырья. *Труды Белорусск. гос. ун-та*, **4(2):** 1-11.

**Масленников П.В**. (2003) Экологические аспекты накопления антоциановых пигментов: *Дис. ... канд. биол. наук.* Калининград, 162 с.

**Олениченко Н.А., Загоскина Н.В., Астахова Н.В., Трунова Т.И., Кузнецов Ю.В.** (2008) Первичный и вторичный метаболизм озимой пшеницы при холодовом закаливании и действии антиоксидантов. *Прикл. биохимия и микробиология*, **44(5):** 589-594.

**Путилина Ф.Е., Галкина О.В., Ещенко Н.Д. Диже Г.П., Красовская И.Е.** (2008) Свободно-радикальное окисление. СПб.: СПбУ, 161 с.

**Саиди-Сар С., Хавари-Неджад Р.А., Фахим Х., Горбанли М., Мажд А.** (2007) Совместное влияние гибберелловой и аскорбиновой кислот на перекисное окисление липидов и активность антиокислительных ферментов в проростках сои при обработке никелем. *Физиология растений*, **54(1):** 85-91.

**Смоликова Г.Н., Медведев С.С.** (2015) Каро-ти-ноиды семян: синтез, разнообразие и функции. *Физиология растений*, **62(1):** 3-16.

**Aghaee A., Moradi F., Zare-Maivan H., Zarinkamar F., Pour Irandoost H., Sharifi P.** (2011) Physiological responses of two rice (*Oryza sativa* L.) genotypes to chilling stress at seedling stage. *African J. of Biotechnology*, **10(39):** 7617-7621.

**Alia H.H., Chen T., Murata N.** (1998) Transformation with a gene for choline oxidase enhances the cold tolerance of *Arabidopsis* during germination and early growth. *Plant Cell Environ.*, **(21):** 232-239.

**Allakhverdieva Y.M., Mamedov M.D., Gasanov R.A.** (2001) The effect of glycinebetaine on the heat stability of photosynthetic reactions in thylakoid membranes. *Turk. J. Bot.*, **25:** 11–17.

**André T.J., Tetsuko T.** (2001) Inducers of glycinebetaine synthesis in barley. *Plant Physiol.*, **127(4):** 1827–1835.

**Armengaud P., Thiery L., Buhot N., March G., Savoure A.** (2004). Transcriptional regulation of proline biosynthesis in *Medicago truncatula* reveals developmental and environmental specific features. *Physiol. Plant.*, **120:** 442-450.

**Asada K.** (1999) The water-water cycle in chloroplasts: scavenging of active oxygens and dissipation of excess photons. *Annu. Rev. Plant Physiol. Plant Mol. Biol.*, **50:** 601-639.

**Bilger W., Rolland M., Nybakken L.** (2007) UV screening in higher plants induced by low temperature in the absence of UV-B radiation. *Photochem. Photobiol. Sci.*, **6(2):** 190-195.

**Bouvier F., Backhaus R.A., Camara B.** (1998) Induction and control of chromoplast-specific carotinoid genes by oxidative stress. *J. Biol. Chem.*, **273:** 30751-30659.

**Casañal A., Zander U., Muñoz C., Dupeux F., Luque I., Botella M.A., Schwab W., Valpuesta V., Marquez J.A.** (2013) The strawberry pathogenesis-related 10 (PR-10) Fra a proteins control flavonoid biosynthesis by binding to metabolic intermediates. *J. Biol. Chem.*, **288(49):** 35322-35332.

**Cecchini N.M., Monteoliva M.I., Alvarez M.E.** (2011) Proline dehydrogenase contributes to pathogen defense in *Arabidopsis*. *Plant Physiol.*, **155:** 1947-1959.

**Chen K.M., Gong H.J., Chen G.-C., Wang S.M., Zhang C.L.** (2004) Gradual drought under field conditions influences the glutathione metabolism, redox balance and energy supply in spring wheat. *J. Plant Growth Regul.*, **23:** 20-28.

**Christie P.J., Alfenito M.R., Walbot V.** (1994) Anthocyanin pathways: Enhancement of transcript abundance and impact of low-temperature stress on general phenylpropanoid and anthocyanin pathways: Enhancement of transcript abundance andanthocyanin pigmentation in maize seedlings. *Planta*, **194:** 541-549.

**Collakova E., Della Penna D.** (2003) The role of homogentisate phytyltransferase and other tocopherol pathway enzymes in the regulation of tocopherol synthesis during abiotic stress. *Plant Physiol.*, **133:** 930-940.

**Cuttriss A.J., Pogson B.J.** (2004) Carotenoids. *Plant pigments and their manipulation* (K.M.Davies, ed.). Boca Raton: CRC Press, pp. 57-91.

**Dai F., Huang Y., Zhou M., Zhang G.** (2009) The influence of cold acclimation on antioxidative enzymes and antioxidants in sensitive and tolerant barley cultivars. *Plant Biol.*, **53:** 257-262.

**Dash S., Mohanty N.** (2002) Response of seedlings to heat-stress in cultivars of wheat: growth temperature-dependent differential modulation of photosystem 1 and 2 activity and foliar antioxidant defense capacity. *J. Plant Physiol.*, **159**: 49-59.

**Deckmyn G., Impens I.** (1997) Combined effects of enhanced UV-B radiation and nitrogen deficiency on the growth, composition and photosynthesis of rye (*Secale cereale*). *Plant Ecol.*, **128:** 235-240.

**Demirevska-Kepova K., Simova-Stoilova L., Sto-**

**yanova Z.P., Feller U.** (2006) Cadmium stress in barley: growth, leaf pigment, and protein composition and detoxification of reactive oxygen species. *J. Plant Nutr.*, **29:** 451-468.

**Es-Safi N. E., Ghidouche S., Ducrot P.H.** (2007) Flavonoids: hemisynthesis, reactivity, characterization and free radical scavenging activity. *Molecules*, **12:** 2228-2258.

**Foyer C.H., Noctor G.** (2005) Redox homeostis and antioxidant signaling: a metabolic interface between stress perception and physiological responses. *Plant Cell*, **17:** 1866-1875.

**Gill S.S., Tuteja N.** (2010) Reactive oxygen species and antioxidant machinery in abiotic stress tolerance in crop plants. *Plant Physiol. Biochem.*, **48:** 909-930.

**Gould K.S., Lister C.** (2006) Flavonoid functions in plants. *Flavonoids: chemistry, biochemistry, and applications* (O.M.Andersen, K.R. Markham, eds.) Taylor & Francis Group: pp. 397-442.

**Gould K.S., Vogelmann T.C., Han T., Clearwater M.J.** (2002) Profiles of photosynthesis within red and green leaves of *Quintinia serrata*. *Plant Physiol.*, **116(1):** 127-133.

**Han Y., Chaouch S., Mhamdi A., Queval G., Zechmann B., Noctor G.D.** (2013a) Functional analysis of arabidopsis mutant's points to novel roles for glutathione in coupling $H_2O_2$ to activation of salicylic ac-id accumulation and signaling. *Antioxidants Redox Signal.*, **18:** 2106-2121.

**Han Y., Mhamdi A., Chaouch S., Noctor G.** (2013b) Regulation of basal and oxidative stress-triggered jasmonic acid-related gene expression by glutathione. *Plant Cell Environ.*, **36:** 1135-1146.

**Havaux M., Kloppstech K.** (2001) The protective functions of carotenoid and flavonoids pigments against excess visible radiation at chilling temperature investigated in *Arabidopsis* npq and tt mutants. *Planta*, **213:** 953-966.

**Hossain M.A., Hoque M.A., Burritt D.J., Fujita M.** (2014) Proline protects plants against abiotic oxidative stress: biochemical and molecular mechanisms. *Oxidative damage to plants antioxidant networks and signaling* (P.Ahmad, ed.). Acad. Press is an imprint of Elsevier, pp. 477-521.

**Huang M., Guo Z.** (2005) Responses of antioxidant system to chilling stress in two rice cultivars differing in sensitivity. *Plant Biol.*, **49:** 81-84.

**Jaleel C.A., Riadh K., Gopi R. Manivannan P., Jallali I., Al-Juburi H.J., Xing Z.C., Hong-Bo S., Pan-neerselvam R.** (2009) Antioxidant defense responses: physiological plasticity in higher plants under abiotic constraints. *Acta Physiol. Plant.*, **31:** 427-436.

**Janne J., Koskimäki J.J., Hokkanen J., Jaakola L., Suorsa M., Tolonen A., Mattila S., Pirttilä AM., Hohtola A.** (2009) Flavonoid biosynthesis and degradation play a role in early defence responses of bilberry (*Vaccinium myrtillus*) against biotic stress. *Eur. J. of Plant Pathol.*, **125:** 629

**Jordan B.R., James P.E., Strid A., Anthony R.G.** (1994) The effect of ultraviolet-B radiation on gene expression and pigment composition in etiolated and green pea leaf tissue: UV-B-induced changes are gene-specific and dependent upon the developmental stage. *Plant, Cell Environ.*, **17:** 45-54.

**Kaur R., Nayyar H.** (2014) Ascorbic acid a potent defender against environmental stresses. *Oxidative damage to plants antioxidant networks and signaling* (P.Ahmad, ed.). Academic Press is an imprint of Elsevier, pp. 235-287.

**Kaushal N., Gupta K., Bhandhari K., Kumar S., Thakur P. Nayyar H.** (2011) Proline induces heat tolerance in chickpea (*Cicer arietinum* L.) plants by protecting vital enzymes of carbon and antioxidative metabolism. *Physiol. Mol. Biol. Plants*, **17:** 203-213.

**Kavi Kishor P.B., Sangam S., Amrutha R.N., Sri Laxmi P., Naidu K.R., Rao K. R.S.S., Rao S., Reddy K.J., Theriappan P., Sreenivasulu N.** (2005) Regulation of proline biosynthesis, degradation, uptake and transport in higher plants: Its implications in plant growth and abiotic stress tolerance. *Current Sci.*, **88:** 424-438.

**Khlestkina E.K.** (2013) The adaptive role of flavonoids: emphasis on cereals. *Cereal Res. Commun.*, **41:** 185-198.

**Kobayashi N., DellaPenna D.** (2008) Tocopherol metabolism, oxidation and recycling under high light stress in *Arabidopsis*. *Plant J.*, **55:** 607-618.

**Kondo N., Kawashima M.** (2000) Enhancement of the tolerance to oxidative stress in cucumber (*Cucumis sativus* L.) seedlings by UV-B irradiation: possible involvement of phenolic compounds and antioxidative enzymes. *J. Plant Res.*, **113:** 311-317.

**Kruk J., Szymańska R., Krupinska K.** (2008) Tocopherol quinone content of green algae and higher plants revised by a new high-sensitive fluorescence detection method using HPLC – Effects of high light stress and senescence. *J. Plant Physiol.*, **165:** 1238-1247.

**Kumar S., Malik J., Thakur P., Kaistha S., Sharma K.D., Upadhyaya H.D.** 92011) Growth and metabolic responses of contrasting chickpea (*Cicer arietinum* L.) genotypes to chilling stress at reproductive phase. *Acta Physiol. Plant.*, **33:** 779-787.

**Lascano H.R., Antonicelli G.E., Luna C.M., Melchiorre M.N., Gomez L.D., Racca R.W.** (2001) Antioxidant system response of different wheat cultivars under drought: field and *in vitro* studies. *Aust. J. Plant Physiol.*, **28:** 1095-1102.

**Lea U.S., Slimestad R., Smedvig P., Lillo C.** (2007) Nitrogen deficiency enhances expression of specific MYB and bHLH transcription factors and accumulation of end products in the flavonoid pathway. *Planta*, **225:** 1245-1253.

**Ledford H.K., Baroli I., Shin J.W., Fischer B.B., Eggen R.I.L., Niyogi K.K.** (2004) Comparative profiling of lipid-soluble antioxidants and transcripts reveals two phases of photooxidative stress in a xanthophyll-deficient mutant of *Chlamydomonas reinhardtii*. *Mol. Genet. Genomics*, **272:** 470-479.

**Liang X., Zhang L., Natarajan S. K., Becker D. F.** (2013). Proline mechanisms of stress survival. *Antioxid. Redox Signal*., **19:** 998-1011.

**Lilius G., Holmberg N., Bulow L.** (1996) Enhanced NaCl stress tolerance in transgenic tobacco expressing bacterial choline dehydrogenase. *Biotechnol.*, **14(2):** 177-180.

**Maeda H., Song W.N, Sage T.L., DellaPenna D.** (2006) Tocopherols play a crucial role in low-temperature adaptation and phloem loading in *Arabidopsis* // Plant Cell, **18:** 2710-2732.

**Mamedov M., Hayashi H., Murata N.** (1993) Effects of glycine-betaine and unsaturation of membrane lipids on heat stability of photosynthetic electron-transport and phosphorylation reactions in *Synechocystis PCC6803*. *Biochem. Biophys. Acta*, **1142(1):** 1-5.

**Millar A.H., Mittova V., Kiddle G., Heazlewood J.L., Bartoli C.G., Theodoulou F.L., Foyer C.H.** (2003) Control of ascorbate synthesis by respiration and its implica-tions for stress responses. *Plant Physiol.*, **133:** 443-447.

**Miller G., Arik H., Stein H., Suzuki N., Mittler R., Aviah Z.** (2009) Unraveling Δ1-pyrroline-5-carboxylate-proline cycle in plants by uncoupled expression of proline oxidation enzymes. *J. Biol. Chem.*, **284:** 26482–26492.

**Mishra S., Dubey, R.S.** (2006) Inhibition of ribonuclease and protease activities in arsenic exposed rice seedlings: role of proline as enzyme protectant. *J. Plant Physiol.*, **163:** 927-936.

**Munne-Bosch S., Alegre L.** (2002) The function of tocopherols and tocotrienols in plants. *Crit. Rev. Plant Sci.*, **21**: 31-57.

**Murata N.** (1998) Enhancement of tolerance to multiple stresses by genetic engineering. *Abstr. IX Int. Congr. Plant Tissue Cell Culture*, Jerusalem: p. 34

**Noctor G., Mhamdi A., Chaouch S., Han Y., Ne-ukermans J., Marquez-garcia B., Queval G., Foyer C.H.** (2012) Glutathione in plants: an integrated overview. *Plant, Cell Environ.*, **35:** 454-484.

**Nounjan N., Theerakulpisut P.** (2012) Effects of exogenous proline and trehalose on physiological responses in rice seedlings during salt-stress and after recovery. *Plant Soil Environ.*, **58(7):** 309-315.

**Paleg L.G., Douglas T.J., van Daal A., Keech D.B.** (1998) Proline, betaine and other organic solutes protect enzymes against heat inactivation. *Austr. J. Plant Physiol.*, **8(1):** 107-114.

**Rai V., Khatoon S., Bisht S.S., Mehrotra S.** (2005) Effect of cadmium on growth, ultramorphology of leaf and secondary metabolites of *Phyllanthus amarus* Schum. and Thonn. *Chemosphere*, **61:** 1644-1650.

**Russell B.L., Rathinasabapathi B., Hanson A.D.** (1998) Osmotic stress induces expression of choline monooxygenase in sugar beet and amaranth. *Plant Physiol.*, **16(2):** 859–865.

**Sakamoto A., Murata A., Murata N.** (1998) Metabolic engineering of rice leading to biosynthesis of glycinebetaine and tolerance to salt and cold. *Plant Mol. Biol.*, **8(6):** 1011-1019

**Semane B., Cuypers A., Smeets K., Van B.F., Horemans N., Schat H., Vangronsveld J.** (2007) Cadmium responses in *Arabidopsis thaliana*: Glutathione metabolism and antioxidative defence system. *Physiol. Plant.*, **129:** 519-528.

**Semchuk N., Lushchak O.V., Falk J., Krupinska K., Lushchak V.I.** (2009) Inactivation of genes, encoding tocopherol biosynthetic pathway enzymes, results in oxidative stress in outdoor grown *Arabidopsis thaliana*. *Plant Physiol. Biochem.*, **47:** 384-390.

**Shichijo C., Hamada T., Hiraoka M., Johnson C.B., Hashimoto T.** (1993) Enhancement of red-light-induced anthocyanin synthesis in sorghum first internodes by moderate low temperature given in the preirradiation culture period. *Planta*, **191:** 238-245.

**Shumskaya M., Wurtzela E.T.** (2013) The carotenoid biosynthetic pathway: thinking in all dimensions. *Plant Sci.*, **208:** 58-63.

**Szabados L., Savouré A.** (2010) Proline: a multifunctional amino acid. *Trends Plant Sci.*, **15**: 89-97.

**Szalai G., Kellos T., Galiba G., Kocsy G.** (2009) Glutathione as an antioxidant and regulatory molecule in plants under abiotic stress conditions. *J. Plant Growth Regul.*, **28:** 66-80.

**Szarka A., Tomasskovics B., Banhegyi G.** (2012) The ascorbate-glutathione-tocopherol triad in abiotic stress response. *Inter. J. Mol. Sci.*, **13:** 4458-4483.

**Székely G., Abrahám E., Cséplo A. et al.** (2008) Duplicated P5CS genes of *Arabidopsis* play distinct roles in stress regulation and developmental control of proline biosynthesis. *Plant J.*, **53:** 11-28.

**Takabe T., Hayashi Y., Nakamura T. et al.** (1997) Genetic engineering of glycinebetaine

**Dynamıcs Of Neuroendocrıne System In Postnatal Development Of Stress Affected Fetus In Prenatal Perıod**

**D.A. Mehtiyeva[1], Y.B. Ismayilov[2], K.G.Garayeva[3], A.T. Ismayilova[2], S.G. Garayeva[2], N.O. Guliyev[2]**

*[1]II Obstetrics and Gynecology Department, Azerbaijan Medical University*
*[2]Research Center of Azerbaijan Medical University*
*[3]Research Obstetrics and Gynecology Institute, Ministry of Health of the Republic of Azerbaijan*

Dynamics of changes in biogenic amines and hormones in baby rats whose mothers affected by emotional stress reactions during pregnancy has been presented in this article. For this purpose, the research on rat babies carried out for 5 months, concentrations of dopamine (DA), noradrenaline (NA), serotonin, 5-OT and 5-oxyindolacetic acid (5-OIAA) in blood and hypothalamus, and activity of hormones in blood were studied during these months. The results showed that DA and NA amounts in blood and hypothalamus of rat babies whose mothers were affected by stress reactions during pregnancy were higher compared with normal babies during the entire research. However, activity of 5-OT and 5-OIAA decreased in both environments. Accordingly, hormonal indicators changed sharply. Adaptive and reproductive functions were violated and developmental rate was relatively weak in these babies.

***Keywords:*** *Stress, monoamine, hormone, hypothalamus, dopamine, noradrenaline, serotonin*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 60-65 (2017)*

# Azərbaycanın Müxtəlif Ekoloji Şəraitində Yayılmış *Aegilops tauschii* Coss. Növünün Bio-Morfoloji Xüsusiyyətləri

**M.E. Eldarov[1*], N.X. Əminov[1], M. Van Slageren[2]**

[1]*AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq prospekti,155, Bakı1106, Azərbaycan;*
[*]*E-mail: eldarov87@hotmail.com*
[2]*Millennium Toxum Bankı Kyu Kral Botanika Bağları Tərəfdaşlığı, Wakehurst Place, Ardingly, West Sussex, RH17 6TN, Böyük Britaniya*

**Məqalədə 2009-2016-ci illərdə Azərbaycan Respublikasının müxtəlif ərazilərinə *Aegilops tauschii* Coss. növünün yayılmasının öyrənilməsi ilə bağlı təşkil olunmuş ekspedisiyalar haqqında məlumat verilmişdir. Ədəbiyyat, herbari materiallarının öyrənilməsi və təbiətdə aparılan monitorinqlər nəticəsində *Ae. tauschii* növünün ekoloji-coğrafi məlumatları toplanmışdır. Nümunələrin toplanma areallarının iqlim (dəniz səviyyəsindən hündürlüyü, yağıntının miqdarı və temperatur) göstəriciləri üzrə ekoloji məlumatları verilmişdir. Növün təyinedici cədvəli, sistematikası və bioekoloji xüsusiyyətləri haqqında məlumat göstərilmiş, həmin taksonların Beynəlxalq Botaniki Nomenklatura əsasında prioritet adları, əsas sinonimləri, dünyada və o cümlədən Azərbaycanda yayılma arealları göstərilmişdir.**

***Açar sözlər:*** *Azərbaycan, Aegilops tauschii, bioekoloji, morfoloji, sistemetik, növmüxtəlifliyi, in-situ yayılma*

## GİRİŞ

*Aegilops tauschii* Coss. növü yumşaq buğdanın (*T. aestivum* L. em. Thell., 2n=6x=42, AABBDD) D genomunun əcdadı olduğuna dair bir çox sübutlar vardır (Kihara, 1944; McFadden & Sears, 1946). *Aegilops* cinsinin mənşə mərkəsi orta şərq ölkələri olmaqla diploid və poliploidləri əhatə edən 22 növdən ibarətdir (van Slageren, 1994). Hazırda belə hesab olunur ki, buğdanın yaxşılaşdırılmasında *Ae. tauschii* genomu ən əhəmiyyətli genetik mənbədir. Molekulyar müxtəliflik üzrə aparılan tədqiqatlar sübut etmişdir ki, bütün heksaploid buğda formaları D genomunun daşıyıcılarıdır (Dvorak et al., 1998).

Beləliklə, bu növün genetik müxtəlifliyi buğdanın adaptasiya və keyfiyyət göstəricilərinin yaxşılaşdırılması üçün geniş potensiala malikdir. *Aegilops tauschii*növünün yayılma mərkəzi Xəzər dənizinin Cənub və Qərbi olmaqla, Azərbaycanda, İranda, Türkiyənin qərbində, Əfqanıstanın şərqində və Çində rast gəlinir. Ədəbiyyat mənbələrində *Ae. tauschii*-nin müxtəlif forma və yarımnövünün təsvirinin səbəbi bu növün geniş morfoloji plastikliyi ilə əlaqədardır. Eyiq (Eig, 1929) və daha sonralar Hammer (Hammer, 1980) və Kilian (Kilian, 2011) *Ae. tauschii*-nin 2 yarımnövü (ssp. *tauschii* və ssp. *Strangulate* (Eig) Tzvel.) təsnif olunmuşdur. Həmçinin *Ae. tauschii* ssp. *tauschii* yarımnövü 4 variasiyaya ayırmışdır: var. *tauschii*, var.*meyeri* (Griseb.) Tzvel., var.*Anathera* (Eig) Hammer və var. *paleidenticulata* (Gandilyan) Hammer. Bu növaltının diaqnostik xüsusiyyəti sünbülcüklərinin uzun və silindrik olmasıdır. Kihara və Tanaka (Kihara & Tanaka, 1958) var. *tauschii* və var. a*nathera* arasında bir çox aralıq (intermadite form) formalar təsvir etmişdir. Onlar həmçinin *meyeri*-ni var.*tau-schii* və var. *Anathera* (van Slageren, 1994) arasındakı aralıq forma kimi təklif etmişlər. *Ae. tauschii* ssp. *Strangulata* (Eig) Tzvelev növaltısı ssp. *tau-schii*-ilə müqayisədə daha geniş polimorfizm nümayiş etdirir. Bu təsnifat van Slageren (van Slageren, 1994) və başqaları tərəfindən rəsmi olaraq təsdiq olunmamışdır. Tzvelev bu bölgünü *Ae. tauschii*-nin müxtəlif formaları içərisində təsnifləşdirməyi üstün tutmuşdur. Qeyd etmək vacibdir ki, *Ae. tauschii*-nin növdaxili sistemləşdirilməsinə dair bu tip problemlər, adətən bu növün Azərbaycan ərazisində rast gəlinən nümunələri ilə bağlıdır. Əminov və Əliyeva (2012) qeyd edirlər ki, Azərbaycanda *Ae. tauschii*-nin növdaxili müxtəlifliyi və təkamülünün dərin və unikal təhlili tələb olunur. Hibridləşmə və buradan aralıq formaların əmələ gəlməsinə görə *tauschii*-nin fenotipik fərqliliyi hər zaman nəzərə çarpan deyildir (Kihara et al., 1965; Dvorak et al., 1998).

Tədqiqat işinin əsas məqsədi *Aegilops tauschii* növünə aid olan nümunələrin yayılmasının mühit şəraiti ilə əlaqəsini yoxlamaq və *in situ* şəraitində bu növün uyğunlaşma (adaptasiya) potensialını daha yaxsı başa düşməkdir. Həmçinin növün və onun formalarının ekoloji-coğrafi paylanması, onların toplanması, ekosistemin idarə edilməsi üçün informativ əhəmiyyət kəsb edir. Növün müxtəlif təbii forma və variasiyalarının öyrənilməsi və sistemləşdirilməsi kifayət qədər aktualdır.




**Xəritə.** *Ae. tauschii* növünün rayonlar üzrə yayılma areallarını 3 ölçülü elektron xəritəsi

## MATERİAL VƏ METODİKA

*Aegilops* növlərinin mövcud vəziyyətinin (yayılması, ehtiyatları və s.) öyrənilməsi, toxum və herbari materiallarının toplanması məqsədilə Azərbaycanın müxtəlif bölgələrinə ezamiyyəyə gedilmiş və ekspedisiyalar təşkil edilmişdir. Tədqiqat zamanı fenoloji müşahidələrdən (Бейдеман, 1974; Шульц, 1966) və ümumi qəbul olunmuş çöl geobotaniki üsullarından istifadə edilmişdir (Шенников, 1938; Лавренко, 2013). Növlərin tədqiqi marşrut-kəşfiyyat üsulu ilə, ehtiyatının sıxlığı Krılova və Şreterin metodikalar ilə (Крылова & Шретер, 1971) tədqiq edilmişdir. Topladığımız toxum və herbari materialları "Mədəni bitkilərin genetik ehtiyatlarının mühafizəsi və səmərəli istifadəsinə dair qanun, fərmanlar, qərarlar, qaydalar, əsasnamələr"in (2014) 2 və 3 saylı əlavələrinə əsasən aparılmışdır. Azərbaycanda *Ae. tauschii* növünün rayonlar üzrə yayılma areallarını 3 ölçülü elektron xəritəsi hazırlanmışdır (Xəritə 1).

Məqalədəki marşrutlar üzrə göstərilən temperatur və yağıntının miqdarı DİVA-Gis kompüter proqramındakı iqlim göstəricilərinə əsasən verilmişdir. İşdə müqayisəli morfoloji, sistematik, botaniki və digər metodlardan istifadə olunmuşdur. Materialın toplanmma areallarının dəniz səviyyəsinə görə hündürlüyü, coğrafi eni və coğrafi uzunluğu Garmin eTrex 20 modelli GPS-lə ölçülmüşdür. Materialların işlənməsi, təhlili, təyini və digər kameral işlər laboratoriya şəraitində həyata keçirilmişdir. Toxum və herbari nümunələrinin təyini və nomenklaturası van Slagerenin (van Slageren, 1994), Hammerin (Hammer, 1980), Eyiqin (Eig, 1929) və Jukovskinın (Jukovski, 1928) təyinatına görə verilir. Toplanılmış herbari nümunələri Azərbaycan MEA Genetik Ehtiyatlar İnstitutunun Herbari Fonduna, toxum materialı isə qorunub saxlanılması üçün Milli Genbankına təhvil verilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

***Aegilops tauschii*** Coss., Not. Crit. 2: 69. 1849;
Жуковский, 1928, Тр. прикл. бот. ген. сел. 18.(1): 547; Eig, 1929, Feddes Repert., Beih. 55: 88; Невский, 1934, Фл. СССР 2: 671; Гроссг., 1939, Фл. Кавк: 351; Гроссг, 1949, Опред. раст. Кавк. : 719; Карягин, 1950, Фл. Азерб. 1: 335; Цвелёв, 1976, Злаки СССР 157; Hammer, 1980, Feddes Repert. 91: 59; Мусаев, 1991, Злаки Азерб.: 49; Цвелёв, 2006, Консп. Фл. Кавк. 2 : 261; Əminov və Əliyeva, 2012, *Ae.*və *Tr.* cins. ara. qarş. gen. mün. :183;

**Sinonim:** *Triticum tauschii* (Coss.) Schmalh., *Aegilops squarrosa* auct. non L., *Patropyrum tauschii* (Coss.) Löve.

**Morfoloji-diaqnostik xüsusiyyətləri:** Birillikdir, çöxgövdəlidir, gövdələri 15-45 sm uzunluğundadır. Sünbülləri 4-10 sm uzunluğunda olub, ensiz silindrikdir, 5-13 sünbülcüklüdür, adətən, rudimentar sünbülcükləri olmur. Sünbülcük pulcuğunun yuxarı kənarı kəsilmiş və qalınlaşmış və iti ucluğa malikdir. Alt çiçək pulcuğunun təpəsində iti ucluq vardır ki, o da uzunluğu 4 sm olan qılçığa çevrilir. Birinci və ikinci çiçəklər qılçıqlı olduqda, üçüncü çiçək də qısa qılçığa malik olur. Təpə sünbülcüyünün alt çiçək pulcuğunun qılçığı 5,5 sm-dək uzunluqda olub, 1-2 yan dişciyə malikdir, ya da heç dişciyi olmur. Dənləri çiçək pulcuqlarına bitişikdir. Xromosom 2n=2x=14, Genomu **D**-dir. Tauşi buğdayıotları may ayında çiçəklədiyindən payızlıq bitkilər hesab olunur. Adətən bu növlər may ayında çiçəkləyir, iyun və iyul aylarında isə toxum verir. Amma, 1700 m-dən hündürdə yayılan *Ae. tauschii* buğdayıotları may ayının axırı çiçəkləyir və avqust ayında toxum verir.







**Şəkil 1.** *Ae. tauschii* növünün ümumi görünüşü: (a) subsp. *strangulata* ; (b) subsp. *tauschii*

Növdaxili taksonların fərqləndirilməsi üçün bizim tərəfimizdən aşağıdakı əlamətlər istifadə edilmişdir:

- sünbülcüyün forması;
- sünbülcük pulcuğunun yuxarı kənarının quruluşu;
- sünbülcük pulcuğunun uzunluğunun eninə nisbəti;
- sünbülcük pulcuğunun səthinin xarakteri;
- sünbülün qılçıqlılığı;
- rudimentar tilin olması;
- çiçək pulcuqlarının uzunluğu;
- sünbülcük pulcuqlarının rəngi.

**Növmüxtəlifliklərinin təyinedici cədvəli**

1. Sünbüllər təshebvaridir, sünbülcüklər doludur, qabarıqdır; sünbülcük pulcuqlarının uzunluğu onların eninə bərabər və yaxud bir az böyükdür ......................... **subsp. *strangulata*** (Eig) Tzvel.
2. Sünbül silindrikdir, sünbülcüklər uzunsov-silindrikdən tutmuş zəif şişkin olurlar, sünbülcük pulcuqlarının uzunluğu enlərini əhəmiyyətli dərəcədə ötür ................................ **subsp. *tauschii***

2.1. Sünbülcük pulcuqlarının kənarları enli dişiciklidir, sünbülün ucunda qılçıqlıdır, rudiment halda til mövcuddur ......... **var. *paleidenticulata*** Gandiljan (Hammer) (?)

2.2. Sünbül və sünbülcüklər nazikdir (4-8 sünbülcüklü), sünbülcüklər uzunsov-silindrikdir, sünbüldəki sünbülcüklər azdır ....... **var. *meyeri*** (Griseb.) Tzvel.

2.3. Sünbüllər daha güclü, sünbülcüklər iridir. Çiçək pulcuqları qılçıqsızdır ........ **var. *anathera*** (Eig) Hammer

2.4. Sünbüllər daha güclü, sünbülcüklər iridir. Çiçək pulcuqları qılçıqlıdır ........... **var. *tauschii***

2.4.1. Pulcuqlar əsasən ağ rənglidir .... **f. *tauschii***

2.4.2. Pulcuqlar əsasən qırmızımtıl rənglidir.. .................. **f. *ferruginea*** (Popova) Hammer

2.4.3. Pulcuqlar əsasən qəhvəyi rənglidir ..... ....................... **f. *brunnea*** (Popova) Hammer

2.5. Bitki xırda ölçülü, 2-3 gövdəli olur; hər sünbül 2-3 sünbüllüdür. Sünbülün uzunluğu 40 mm-dən çox olmur, sünbülcüyün uzunluğu 4 mm və eni isə 2,0-2,5 mm olur. Sünbülün əsasında 2 rudumentar sünbülcük yerləşir ............. ...........................................**var. *salinum*** Zhuk.

*Aegilops* cinsinin sistematikasının uzun öyrənilmə tarixinə baxmayaraq, *Ae. tauschii* yarımnövlərinin sistematikası hələ də tam aydın müəyyənləşdirilməmişdir. Eyiq (Eig, 1929) növ daxilində iki yarımnöv ayırd etmişdir: subsp. *strangulata* Eig (sünbülləri muncuq düzümünə bənzəyir) və subsp. *eusquarrosa* Eig (=subsp. *tauschii* Hammer) (sünbülləri silindrikdir) (Şəkil 1). Lakin bu yarımnövlər arasında çoxlu aralıq formalar da mövcuddur ki, onları bu yarımnövlərdən hər hansı birinə aid etmək mütəxəssislər üçün xeyli çətinlik törədir (Jaaska, 1981; Lagudah & Halloran, 1988). Yaaska (Jaaska, 1981) subsp. *strangulata*-nın morfoloji cəhətdən çox müxtəlif olub, Şərqi Ermənistan, Azərbaycan, Şimali İran və Türkmənistanda (Şərqi Kopetdağ) geniş yayıldığını göstərmiş, Tanaka (Tanaka, 1983) həmin yarımnövə yalnız sünbülləri aydın şəkildə muncuq düzümünə bənzəyən və İranın Hirkan deyilən ərazisi yaxınlığında Xəzər dənizinin çənub-şərq sahilləri boyunca məskunlaşan bitkiləri aid etmişdir.




**x:48.97006 y:41.20427 alt:137**

**worldclim_2-5m**

| | T*min* | T*max* | Rain |
|---|---|---|---|
| Jan | -1.4 | 5.5 | 27 |
| Fev | -1.2 | 5.1 | 26 |
| Mar | 1.7 | 8.9 | 29 |
| Apr | 7 | 16.5 | 46 |
| May | 12.2 | 21.5 | 43 |
| İyun | 16.7 | 26.8 | 30 |
| İyul | 19.8 | 30 | 20 |
| Avg | 18.8 | 38.9 | 20 |
| Sen | 15.4 | 24.8 | 32 |
| Okt | 9.7 | 18.1 | 45 |
| Nov | 5.7 | 12.5 | 35 |
| Dek | 1.1 | 7.8 | 29 |
| **İllik** | **8.8** | **18.0** | **382** |

***Sxem.*** Qobustan rayonunun aylar üzrə temperatur, coğrafi enlik və coğrafi uzunluq, yağıntının miqdarı və dəniz səviyyəsindən hündürlük göstəriciləri.



**Şəkil 2.** *Ae. tauschii* var. *salinum* Zhuk

*Ae. tauschii* buğdayıotu demək olar ki, Azərbaycanın bütün rayonlarında yayılmışdır, müxtəlif dövlərdə ekspedisiyalar nəticəsində Azərbaycanın ayrı-ayrı bölgələrindən toplandığına dair məlmatlar mövcuddur. Dəniz səviyyəsindən aşağıda yerləşən yarımsəhradan (Abşeron) başlayaraq, Arandan tutmuş orta dağ qurşağına qədər demək olar ki, bütün rayonlarda rast gəlinir. Böyük Qafqaz və Talış dağlarının ətəyində müşahidə aparılmış bütün rayonlarda geniş yayılmışdır. *Ae. tauschii* Azərbaycanda quru təpələr olan hər yerlərdə və rütubətli iqlimi olan yerlərdə daha çox yayılmışdır. Adətən, dənli bitkilərin əkin sahələrinin kənarında bitir, təsadüfi hallarda isə tarlanın içərisinə girir.

Ekspedisya nəticəsində Azərbaycanda bu növün (Bakı, Qobustan, Şamaxı, Ağsu, İsmayıllı, Qəbələ, Oğuz, Şəki, Zaqatala, Xızı, Siyəzən, Şabran, Quba, Qusar, Xudat, Lənkəran, Lerik, Masallı, Cəlilabad, Yardımlı, Naxçıvan-Babək, Şahbuz, Culfa, Ordubad, Ağcabədi, Gəncə, Tovuz, Şəmkir, Ağstafa rayonları üzrə) müxtəlif forma və variasiyalarına aid toxum və herbari materialları toplanılmışdır. Onlar səhra və yarımsəhrə formasiyalarından, bağlardan, yolların ətrafından və dincə qoyulmuş torpaqlardan toplanmışdır.

Toplanılan *Ae.tauschii* növlərinin ekoloji göstəriciləri zamanı onların *Min* hündürlük üzrə Xudat rayonu, Nabran və Müxdədir kəndi (-15 m) və *Max* hündürlük üzrə Naxçıvan, Ordubad rayonu Tivi kəndi ərazisində (1941 m) yayılması müəyyən edilmişdir. Orta illik yağıntının miqdarına görə *Ae. tauschii* növü *Min* yağıntı üzrə (274 mm) Bakı, Qurd qapısının yanı ərazisindən, *Max* yağıntı üzrə isə (997 mm) Lənkəran şəhərindən toplanımışdır. Ən soyuq temperaturyanvar ayı üzrə $Min_1$ – Mistan kəndində (-8,4°C), ən isti temperatur $Max_7$ iyul ayında Babək rayon ətrafı (34,3°C) müşahidə olu-nur. *Min* orta illik temperatur Mistan kəndində mü-şahidə olunmuş (7,0°C), *Max* orta illik temperatur isə Ağstafanın Xətai kəndi, Şəkinin Küdürlü kəndi, Masallının Sər-

cuvar və Musaküçə kəndlərində (14,2°C) olmuşdur. Məlum olmuşdur ki, müxtəlif hündürlük, yağıntının miqdarı, orta illik temperaturdan asılı olaraq *Aegilops* növlərinin yayılma areallarıfərqlidir.

Qeyd etməliyik ki, *Ae. tauschii* **var.** ***salinum*** Zhuk. yalnız Qobustan rayonundan toplanılmışdır (Şəkil 2.) Sxemdə isə bu marşrutun aylar üzrə temperatur, coğrafi enlik və coğrafi uzunluq, yağıntının miqdarı və dəniz səviyyəsindən hündürlük göstəriciləri göstərilmişdir.

Beləliklə, tədqiqat zamanı topoqrafik göstəricilərə müvafiq iqlim tipləri qeyd olunmuş və müəyyən edilmişdir ki, *Ae.tauschii* növləri 11 iqlim tipindən 7 sində (1) Qışı mülayim, yayı quraq isti keçən yarımsəhra və quru-çöl iqlimi; (2) Qışı soyuq, yayı quraq isti keçən yarımsəhra və quru-çöl iqlimi; (3) Qışı quraq keçən mülayim-isti iqlim; (4) Yayı quraq keçən mülayim-isti iqlim; (5) Yağıntıları təxminən bərabər paylanan mülayim-isti iqlim; (6) Yayı quraq keçən soyuq iqlim; (7) Qışı quraq keçən soyuq iqlim) rast gəlinir. Bizim tədqiqatların nəticəsinə görə yağıntının miqdarı çox olan yerdə *Aegilops*-ların yayılma miqdarı azalır. Görünür bu onların kserofit və mezo-kserofit bitkilər olması ilə əlaqədardır. Həmçinin qeyd olunmuş torpaq tipləri əsasında belə qənaətə gəlmək olar ki, *Ae tauschii* növü *çimli dağ-çəmən, bozqır dağ-çəmən, qonur dağ-meşə, sarı-qonur dağ-meşə, qəhvəyı dağ-meşə, dağ-boz qəhvəyi, dağ-şabalıdı (boz-qəhvəyı), psev-dopodzollu-sarı, şabalıdı (boz-qəhvəyi), boz-çəmən, boz-qonur və çəmən-meşə* torpaqlarda daha geniş yayılmışdır.

Adətən növə *Aegilops*-un digər növləri ilə birlikdə rast gəlinir. Lakin təkcə bir *Ae. tauschii* növünün özündə birləşdirən fitosenozlar da tapmaq mümkündür. Azərbaycanda *Ae. tauschii* növü eyni arealda bitən *Aegilops*-un digər növləri ilə birdən yeddiyə qədər populyasiyada yayılmışdır. Adətən bunövü *Ae. cylindrica* və *Ae. triuncialis* ilə birlikdə və ya onlardan biri ilə tapmaq mümküdür. Xüsusilə aranda və dağətəklərində daha çox bitir.

## ƏDƏBİYYAT SİYAHISI


**Əminov N.X., Əliyeva A.C.** (2012) *Aegilops* L. və *Triticum* L. cinsləri arasında qarşılıqlı genetik münasibətlər. Bakı: Elm, 480 s.

**Mədəni bitkilərin genetik ehtiyatlarının mühafizəsi və səmərəli istifadəsinə dair. Qanun, fərmanlar, qərarlar, qaydalar, əsasnamələr** (2014) Bakı: Təknur, 168 s.

**Бейдеман И.Н.** (1974) Методика изучения фенологии растений и растительных сообществ. Новосибирск: Наука, 155 с.

**Гроссгейм А.А.** (1939-1967) Флора Кавказа. 2-е изд.: в 7 т. Отв. ред. Ан.А.Федоров. **Т. 1,** Баку: АзФАН, 1939, 402 с.

**Гроссгейм А.А**. (1949). Определитель растений Кавказа. М.: Советская наука, 746 с.

**Жуковский ПМ.** (1928) Критико-систематический обзор видов рода *Aegilops*. *Сб. науч. тр. по прикл. ботанике, генетике и селекции*, **18(1):** 417-609.

**Карягин И.И.** (1950) Флора Азербайджана. **Т. 1.** *Polypodiaceae*. Баку: АН Азер. ССР, 370 с.

**Крылова И.Л., Шретер А.И.** (1971) Методические указания по изучению запасов дикорастущих лекарственных растений. М.: ВИЛР, с. 22.

**Лавренко Е.М.** (2013) Полевая геоботаника. Рипол Классик, 448 с.

**Мусаев С.Г.** (1991) Злаки Азербайджана. Баку: Элм, 420 с.

**Невский С.А.** (1934) Ячменевые. *Hordeeae*. Гл. ред. В.Л.Комаров. *Флора СССР*, **2:** 590-728.

**Флора Кавказа** (2006) Конспект. Отв. ред. А.Л.Тахтаджян. С-Пб.: СПб Унив., с. 347-356.

**Цвелев Н.Н.** (1971) Заметки о злаках флоры СССР. *Новости сист. высш. раст.,* **8:** 65-66.

**Цвелев Н.Н.** (1976) Злаки СССР. Л.: Наука, 788 с.

**Шенников, А.П.** (1938) Методика геоботанических исследований лугов и луговых пастбищ. *Методика полевых геоботанических исследований.* М.-Л.: АН СССР, с. 87-112.

**Шульц Г.Э.** (1966) Методы фенологических наблюдений при ботанических исследованиях. М.-Л.: Наука, 174 с.

**Dvorak, J., Luo M-C., Yang Z-L., Zhang H-B.** (1998) The structure of the *Aegilops tauschii* genepool and the evolution of hexaploid wheat. *Theor. and Appl. Genetics,* **97(4):** 657-670.

**Eig A.** (1929) Monographisch-kritische ubersicht der gattung *Aegilops*. *Report. Spec. Nov. Regni Veg.,* **55:** 1-228.

**Hammer K.** (1980) Vorarbeiten zur monographischen darstellung von wildpflanzensortimenten: *Aegilops* L. *Genetic Resources and Crop Evolution,* **28(1):** 33-180.

**Jaaska V.** (1981) Aspartate aminotransferase and alcohol dehydrogenase isoenzymes: Intraspecific differentiation in *Aegilops tauschii* and the origin of the D genome polyploids in the wheat group. *Plant Systematics and Evolution,* **137(4):** 259-273.

**Kihara H.** (1944) Discovery of the DD-analyser, one of the ancestors of *Triticum vulgare*. *Agric Hortic*., **19:** 13-14.

**Kihara H., Tanaka M.** (1958) Morphological and physiological variation among *Aegilops squarrosa* strains collected in Pakistan, Afghanistan and Iran. *Preslia*, **30:** 241–251.

**Kihara H., Yamashita K., Tanaka M.** (1965) Morphological, physiological, genetical and cytological studies in *Aegilops* and *Triticum* collected from Pakistan, Afghanistan and Iran. *Results of*

*The Kyoto University Scientific Expedition to The Karakoram and Hindukush, 1955*. **1:** 1-118.

**Kilian B., Mammen K., Millet E., Sharma R., Graner A., Salamini F., Hammer K., Özkan H.** (2011) *Aegilops*. In: *Wild crop relatives: genomic and breeding resources*. Berlin, Heidelberg: Springer, pp. 1-76.

**Lagudah E.S., Halloran G.M.** (1988) Phylogenetic relationships of *Triticum tauschii* the D genome donor to hexaploid wheat. *Theoretical and Applied Genetics,* **75(4):** 599-605.

**McFadden E.S., Sears E.R.** (1946) The origin of *Triticum spelta* and its free-threshing hexaploid relatives. *Journal of Heredity,* **37(4):** 107-116.

**Tanaka M.** (1983) Geographical distribution of *Aegilops* species based on the collections at the Plant Germ-plasm Institute, Kyoto University. In: *Proceedings of the sixth International Wheat Genetics Symposium/edited by Sadao Sakamoto*. Kyoto: Plant Germ-Plasm Institute, Faculty of Agriculture, Kyoto University.

**van Slageren M.W.** (1994) Wild Wheats: A monograph of *Aegilops* L. and *Amblyopyrum* (Jaub. & Spach) Eig (*Poaceae*). Wageningen Agric. Univ. Pap. 94, **(7):** i–xiv, 1–512 (joint publication of Wageningen Agricultural University, The Netherlands, and the International Center for Agricultural Research in the Dry Areas (ICARDA), Aleppo, Syria).

## Биоморфологические Особенности Вида *Aegilops tauschii* L., Распространенного В Различных Экологических Условиях Азербайджана

**М.Е. Эльдаров[1], Н.Х. Аминов[1], М. Ван Слагэрэн[2]**

*[1] Институт генетических ресурсов НАН Азербайджана *
*[2]Проект «Семенной банк тысячелетия - Королевские ботанические сады Кью», Великобритания*

В статье приводится информация об экспедициях, проведенных 2009-2015 гг. на различных территориях Азербайджанской республики с целью исследования распространения вида *Aegilops tauschii.* На основе имеющихся литературных данных, гербарных материалов и мониторингов, проведенных на природе, были отмечены эко-географические данные вида *Aegilops tauschii.* Приведены экологические данные (высота над уровнем моря, количество осадков и температурные показатели) по ареалам сбора. Также приводятся таблица для определения этого вида, систематика и биоэкологические особенности. Указаны приоритетные названия этих таксонов на основе Международной Ботанической номенклатуры, основные синонимы, ареалы распространения в мире и, в том числе, в Азербайджане.

***Ключевые слова:*** *Азербайджан, Aegilops tauschii, биоэкология, систематика, разновидность, распространение*

## Biomorphological Features Of A*egilops tauschii* L. Distributed Under Different Ecological Conditions Of Azerbaijan

**M.E. Eldarov[1], N.Kh. Aminov[1], M. van Slageren[2]**

*[1]Institute of Genetic Resources, Azerbaijan National Academy of Sciences*
*[2]Millennium Seed Bank Partnership-Kew, Royal Botanic Gardens, Great Britain*

This article provides information about the expeditions conducted during 2009-2015 with the aim of studying the distribution of *Aegilops tauschii* species in different areas of the Azerbaijan Republic. Based on the literature data, herbarium material and the monitoring carried out under natural conditions, the eco-geographic data of *Aegilops tauschii* accessions were recorded. The environmental data (altitude, rainfall and temperature data) of collection areas are revealed. Also, a table for the determination of this species, its taxonomy and bio-ecological characteristics are presented. The priority names for this taxa on the basis of International Botanical Nomenclature, the basic synonyms, areas of distribution in the world, including Azerbaijan are indicated.

***Keywords:*** *Azerbaijan*, *Aegilops tauschii*, *bioecology, taxonomy, subspecies, species distribution*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 66-71 (2017)*

# Tovuz-Qazax Ərazisində Yayılan Dərman Bitkilərinin Etnofarmokologi Əhəmiyyəti

**S.C. İbadullayeva[1]*, V.N. Abbasova[2]**

[1] *AMEA Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ 1004, Azərbaycan;*
**E-mail:* ibadullayeva.sayyara@mail.ru
[2] *Azərbaycan Dövlət Aqrar Universiteti, Atatürk prospekti, 450, Gəncə AZ 2000, Azərbaycan*

**Məqalədə Kiçik Qafqazın şimali-şərqində yerləşən Tovuz-Qazax ərazisində yayılan dərman bitkilərinin müalicəvi əhəmiyyəti barədə məlumatlar verilmişdir. Ən çox yayılan xəstəliklər və onların müalicəsində dərman kimi istifadə edilən 100-ə qədər bitki növü müəyyənləşdirilmişdir. Əhalinin yaşayış yerlərindən asılı olaraq, eyni dərman bitkisinin müxtəlif xəstəliklərdə müxtəlif qaydada istifadəsi aşkar olunmuşdur.**

***Açar sözlər**: Etnobotanika, qeyri-ənənəvi dərman bitkiləri, etnfarmokologiya, Tovuz-Qazax ərazisi*

## GİRİŞ

Məlumdur ki, xalq təbabəti muxtəlif xalqların adət və ənənələrinin, mədəniyyətlərinin minillik təcrubəsi əsasında formalaşmışdır. Tarix göstərir ki, müxtəlif xalqların dərman bitkilərindən istifadə və qəbul qaydaları fərqlidir və bunlar milli adət-ənənələrə əsaslanır. Müxtəlif xalqlar tərəfindan müxtəlif müalicə metodları işlənib hazırlanmışdır ki. bunları hazırlayan təbiblərin bəziləri bugünədək məlum deyildir. Bu müalicə metodları bu gün də xalq təbabəti inciləri kimi geniş tətbiq edilir (Qasımov və b., 2006; İbadullayeva və Ələkbərov, 2013).

Azərbaycanda ethnobotaniki biliklər bir nəsildən başqa nəslə şifahi yolla ötürülmüşdür. Lakin bütün bu məlumatlar indiyəcən tam sənədləşdirilməmişdir. Mövcud nəşrlər (Qasımov və b., 2006; Дамиров и др., 1982; Рабинович, 1991; Altundag et al., 2015) əvvəlki ədəbiyyatlara söykənmiş (Алекперли, 2001; Бромлей и Воронов, 1976), bununla da bitkilərin istifadə imkanları əhatə baxımından məhdudlaşmışdır. Bundan başqa, onların bəziləri müxtəlif yollarla qonşu ölkələr tərəfindən mənimsənilmişdir (Mömin, 1402; Muin; Namik, 1987; Рабинович, 1991). Buna görə də, Azərbaycanda istifadə edilən dərman bitkilərinin sənədləşməsində hələ də boşluqlar çoxdur. Son onillikdə Azərbaycanın bölgələrində etnobotaniki tədqiqatlar aparılmağa başlanılmışdır (Ибадуллаева, Агаева, 2013; Касумов и др., 2009; Ибадуллаева и др.. 2010, 2012), lakin bütövlükdə Azərbaycan florasında qeyri-ənənəvi tibbdə istifadə edilən dərman birkilərinin mexanizmi tam təyin edilməmişdir.

Cari tədqiqatın məqsədi Tovuz-Qazax ərazisində qeyri-ənənəvi tibbdə bitkilərdən istifadə imkanlarını araşdırmaq və onları sənədləşdirməkdən ibarətdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işi 2013-2017-ci illərdə dəniz səviyyəsindən 29-1172 m hundürlükdə Azərbaycanın Kiçik Qafqaz Botaniki-coğrafi rayonunda yerləşən Tovuz, Ağstafa və Qazax rayonları ərazisində həyata keçirilmişdir. Cöl tədqıqatları marşurut metodu ilə ərazinin bütün qurşaqlarını əhatə etmişdir (Бейдеман, 1979; Крылова, Шретер, 1971). Aparılmış tədqiqatlar nəticəsində herbari materialları toplanılmışdır.Müsahibələr zamanı etnobotaniki metod və üsullardan istifadə edilmişdir (Guper, 2001; Martin, 2001). Müsahibələr tədqiqat ərazisinin 56 kəndində 200-ə qədər əhali arasında aparılmışdır. Öncə adi və çoxyayılan xəstəlikləri müalicə etmək üçün bitkilərin yerli adları, onların istifadə qaydaları, yayılma arealları, yığılması və qurudulması haqqında məlumatlar toplanılmış, anket sorğuları üçün xüsusi blanklar hazırlanmışdır. Yerli əhalidən baytarlıq təbabətində, arıçılıqda, uşaqların və böyuklərin xəstəliklərində istifadə olunan bitkilərin qədim adət-ənənələrə uygun (dəmləmə, həlim və s.) şəkildə istifadəsi öyrənilmişdir. Müsahibələr əsasən yaşlı nəsildən götürülmüşdür.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Ümumilikdə, Kiçik Qafqazın müasir flora biomüxtəlifliyində ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər 1270-dən çox növlə təmsil olunur. Xalq təbabətinə daxil olan dərman bitkilərinin araşdırılması nəticəsində müəyyən olunmuşdur ki, tədqiqat ərazisində 100-ə qədər bitki birbaşa təbii floradan toplanılaraq dərman məqsədilə istifadə edilir. Onların yarıdan çoxu Farmakopeyalara (Гос. Фарм. СССР, 1989) daxildir. Tədqiqat zamanı əsasən haqqında məlumatlar toplanılmış bitkilərin

yayıldığı ərazilər təftiş edilmişdir. Yabanı florada olan dərman bitkilərinin 80-dən artıq növünün təbii ehtiyatı boldur, lakin bəzi bitkilər də vardır ki, ehtiyatı az olsa da, becərilmə imkanları genişdir.

Cədvəl 1-də yaş məhdudiyyəti göstərilməklə müsahibələrin nəticələri verilmişdir. Müsahibələrdə ən dəyərli məlumatlar isə əsasən yaşlı nəsildən alınmışdır (Şəkil 1).

**Cədvəl 1.** Müsahibələrdə iştirak edən insan populyasiyaları

| | Kişi | Qadın | Uşaqlar və gənclər | Biologiya müəllimi | Əczaçı |
|---|---|---|---|---|---|
| **Sayı** | 80 | 135 | 16 | 6 | 3 |
| **Yaşı** | 50-78 | 55-90 | 10-23 | 35-45 | 40-55 |

Şəkildən göründüyü kimi, əsas məlumatlar 80-90 yaş arasında olan populyasiyalar arasında keçirilmişdir. Xəstəliklər və onların ərazi kəndlərində yayılması barədə məlumatlar cədvəl 2-də öz əksini tapmışdır. Cədvəllərdə göstərilən xəstəliklərin elmi adları ədəbiyyata əsaslanmışdır (Машковский, 2000).

Aparılan tədqiqatlar zamanı ümumi xəstəliklərin müalicəsində istifadə edilən bitkilərin siyahısı tərtib edilmişdir ki, bunlar ümumilikdə 34 fəsiləni təmsil edir. Dərman məqsədi üçün istifadə edilən növlər əsasən *Asteraceae, Fabaceae, Asphodelaceae* və növ sayına görə çox olan *Poaceae* fəsilələrinə aid nümayəndələrdir. Bəzi fəsilələrə aid növlər də vardır ki, onlar bir növlə təmsil olunsalar da, müalicə əhatəsi genişdir.

Müsahibələrdə ən çox xatırlanan dərman bitkiləri aşağıdakılardır: kəklikotu, nanə, yolotu, yemişan, itburnu, bədrənc, solmazçiçək, qantəpər, dazıotu, cirə, zirə, qəpikotu, alaqanqal, baldırqan və s. Bəzi hallarda isə dərman bitkilərinə heyvani məhsullar əlavə edilməklə tətbiq edilir.

Tovuz-Qazax ərazisində ümumilikdə 100-ə qədər bitki dərman kimi işlədilir ki, bu da 30-a yaxın xəstəliklərdə tətbiq edilir. Müsahibələr zamanı bəzən elə bitkilərin də adı çəkilir ki, onların müalicəvi əhəmiyyəti barədə ədəbiyyatda məlumata rast gəlinmir və ərazidən toplanmış 5 bitkinin ilk dəfə cari tədqiqatda istifadəsinə dair yeni məlumatlar əldə edilmişdir ki, bu sahədə tədqiqat işi davam etdirilir. Bu da dərman bitkiləri barədə yeni məlumatların sənədləşdirilməsi ehtiyacının göstəricisidir.

Şübhəsiz Tovuz-Qazax ərazisində qeyri-ənənəvi tibbi təcrübələrdə istifadə edilən və cari tədqiqat ilə əldə edilən yeni biliyin zənginliyi digər faydalı (qida, texniki, ətirli-ədviyyəi, yem və s.) bitkilər üzərində də etnobotaniki tədqiqatlar aparmağın əhəmiyyətini göstərir. Digər tərəfdən kəndlərdə çoxəhatəli klinikalar mövcud deyil, insanların böyük şəhərlərə gedib-gəlməsi çətinlik törədir. Bu biliklər barədə məlumatların Azərbaycanın digər kəndlərində də yayılması icmaların ümumi rifah halının möhkəmlənməsinə şərait yarada bilər.

Maraqlı haldır ki, Tovuz rayonunun yüksək dağlıq ərazilərində olan Əlibəyli, Ağdam (d.s.h. 1121 m), Yuxarı Öyrüşlü, Aşağı Öyrüşlü (d.s.h. 1172 m) kəndlərdə yaşayan icmaların dərman bitkiləri ilə bağlı fikirləri, aşağı ərazilərldə - Aşağı Mülkülü (334 m), Bozalqanlı, Aşağı Quşcu (306 m) yaşayanlarla nisbətən fərqlənir. Eyni zamanda, Ağstafa rayonunun 29 m dəniz səviyyəsində yerləşən Böyük Kəsik kəndində dərman bitkiləri ilə bağlı məlumat əldə edə bilmədik. Görünür, bu ərazidə dərman bit kiləri geniş yayılmadığı üçün icmaların məlumatları demək olar ki, yox dərəcəsindədir.




**Kəndlərin sayı**

**Şəkil 1.** Müsahibələrdə iştirak edən yaşlı nəslin göstəriciləri

Qazax rayonunda Dəmirçilər, Xanlıqlar kimi orta dağlıq ərazi (d.s.h. 814 m) kəndləri icmaları xüsusən mədə-bağırsaq və soyuqdəymə xəstəliklərinin otlarla müalicəsi barədə maraqlı iddialar irəli sürdülər. Elə xəstəliklər vardır ki, yerli icmalar onların adını tez-tez çəkir və müalicəsi üçün müəyyən dərman vasitələrinin olmasını göstərsələr də, bitkilərə üstünlük verilər. Yoluxucu xəstəliklərin və bəzən hətta belə ölümə səbəb olan xəstəliklərin müalicəsini dərman otlarında görürlər. Eyni zamanda, bu bitkilərin böyuk əksəriyyəti qida bitkiləridir. Məsəslən, ag tutun (*Morus alba* L.) təzə və qurudulmuş, xıdalanmış meyvələri böyrək xəstəliklərinin müalicəsində, qəbizlikdə və işlədəci vasitə kimi istifadə olunur. Müxtəlif virus xəstəliklərində qəpikotu növləri (*Hedysarum* spp.) ekstraktının müalicəvi əhəmiyyəti də qeydə alınmışdır. Halbuki, yalnız Azərbaycan florası üçün xas olmayan *H.alpinus* L.- alp qəpikotu və ya qəpiklicəsi virus və bakteriya əleyhinə dərman bitkisi kimi Farmokopeyalara daxil edilmişdir.

Müxtəlif bölgələrdə əhali arasında aparılan sorgular nəticəsində məlum olmuşdur ki, bu və ya digər eyni növün istifadəsi zamanı, dərman vasitələrinin hazırlanması qaydasına görə də fərqlənir. Qeyd etmək lazımdır ki, Tovuz rayonunda xalq təbabətində təqiq olunan bəzi növlər lokal xarakter daşiyir. Məs., ardıcın *(Juniperus oblonga* Bieb.) bəzi hissələrindən iri buynuzlu heyvanlarda baş verən göz xəstəlikləri zamanı istifadə edirlər. Digər rayonlar bu məlumatlardan xəbərsizdir. Tovuz rayonunun Əsrik, Ağbulaq, Böyük qışlaq əhalisi stomatit və paradontoz zamanı Acılığın - *Ephedra aurantica* Takht.et Pahom. (=*E.intermedia* Schrenk.) növündən hazırlanan dəmləmədən istifadə edir. Lakin, Qazax rayonunun əhalisi analoji xəstəlik zamanı elə bir bitkisəl müalicə barədə məlumatsızdır.

Aparılan sorğular zamanı bitkilərin orqanlarının da fərqli istifadəsinə rast gəlinir. Məsələn, icmalar arasında bagayarpağının (*Plantago major* L., *Plantago lanceolata* L.) təzə yarpaqları müxtəlif yaraların müalicəsində istifadə olunduğu halda, bəzi kəndlərdə bu məqsədlə bütöv bitki xammalından istifadə edilir.

Tovuz-Qazax ərazisinin qədim mədəniyyətinin ən mühüm xüsusiyyətlərindən biri də dərman bitkiləri ilə bağlı olan xalq təbabətinin mistik-mifoloji təsəvvürlərlə vəhdətdədir (Azərb. Mif. Mətn., 1988). Buna misal olaraq itburnu bitkisini göstərmək olar. Belə ki, mifoloji fikirlərə əsasən, bitkinin meyvəsini günbatandan sonra toplamaq qadagan olunur. Ardıc, Üzərlik, İlankölgəsi növlərinin toplanılması xüsusi müqəddəs sözlər vasitəsi ilə həyata kecməlidir ki, bu da xəstənin psixikasina müsbət təsir göstərir. Bəzən dini təsəvvürlər (bitkilərin toplanılması ilə bağlı) dərman növlərinin qorunub saxlanılmasına kömək edir. Məsələn, üzərlik (*Peganium harmala*) elə ərazidən toplanılmalıdır ki, ora xoruz səsi çatmasın və s.

**Cədvəl 2.** Tovuz-Qazax ərazisində xəstəliklər zamanı dərman bitkiləri ilə müalicə edilməsinə dair sorğuların nəticələri

| Ürək-damar | Degenerativ | Həzm | Başqa xəstəliklər | Ağrı | Reproduktiv | Ağ ciyər xəstəlikləri | Dəri-zöhrəvi xəstəlikləri |
|---|---|---|---|---|---|---|---|
| Qan qatılığı (çirklənməsi) 5[a]9[b] | Döş xərçəngi 11[a]3[b]40[c] | Qəbizlik 3[a]11[b] | Daxili parazitlər 3[a]11[b] | Abdominal ağrılar 3[a]11[b] | immun sistemi zəifliyi 5[a]2[b]1[c] | Kəskin tənəffüs infeksiyaları 2[a]12[b] | Herpes 15[a]2[b] |
| Ürək problemləri 3[a]11[b]3[c] | Uşaqlıq xərcəngi 6[a]8[b]24[c] | Diareya 1[a]13[b]5[c] | Ruhi (psixi) xəstəliklər 4[a]10[b] | Baş ağrısı 4[a] 10[b] | Çətin keçən hamiləlik 8[a]6[b] | Astma 5[a]9[b]15[c] | Yara-xora 3[a]11[b] |
| Yüksək qan təzyiqi 4[a] 10[b] 14[c] | Şəkər 10[a]4[b]7c | Öd xəstəliyi 2[a]12[b] | | Diş ağrısı 2[a] 12[b] | Sonsuzluq 9[a]5[b] | Öskürək 1[a]13[b] | Trofik yaralar 2[a]12[b] |
| Əzələlərdə keyimə və şişkinlik 2[a] 12[b] | Daxili şişlər 7[a]7[b] | Hıçqırıq 2[a]12[b] | | Qarın ağrısı (sancılanma) 6[b] | Prostat 1[a]13[b] | Vərəm 7[a]1[b]9[c] | |
| | Qaraciyər problemləri 3[a]11[b] | Bağırsaq pozğunluqları 4[a]10[b] | | Menustral ağrılar 1[a] | Yumurtalıq 1[a]13[b] | | |
| | | Bəlğəm 3[a]11[b] | | | Sifilis 1[a]2[b]4[c] | | |
| | | Hemoroid 3[a]11[b] | | | | | |
| | | Mədə ağrıları 8[a]6[b] | | | Uşaqlıq (rəhm) pozğunluqları 2[a]12[b] | | |
| | | Qusma 1[a]13[b] | | | | | |
| - | - | - | 11[d] | 9[d] | 7[d] | 12[d] | 20[d] |

__Qeyd:__Rəqəmlər kəndlərin sayını göstərir. a)müsahibələrdə tez-tez xatırlanan; b)müvafiq dərəcədə xatırlanan;c) ölümə səbəb olan xəstəliklər (Dünya Səhiyyə təşkilatına müvafiq olaraq); d)yoluxucu xəstəliklər

**Cədvəl 3.** Tovuz-Qazax ərazisində müxtəlif xəstəliklərdə işlədilən dərman bitkilərinin bioekoloji və farmokoloji xüsusiyyətləri

| Bitkilərin latın adı | Çiçək və meyvə fazası | İstifadə edilən orqan | Xəstəliklərdə istifadəsi |
|---|---|---|---|
| *Achillea millefolium* L. | VI-X | Yarpaqları və çiçəklənən ucları | Dairəvi qurd xəstəlikləri, qastrit və anemiya, ödqovucu, qaraciyər və mədə-bağırsaq xəstəlikləri, nevrasteniya, revmatizm, bronxial astma, ekzema |
| *Acorus calamus* L. | VI-VII | kökümsovu | Vərəm, mədə-bağırsağ, tənəffüs yolları katarı, böyrək və sidik yollarının iltihabı, plevrit, dalaq, qaraciyər xəstəliklərində işlədilir |
| *Armoracia rusticana* Gaert. et Mey. | V-VII | Giləmeyvə və yarpaq | Gecə enurezi, revmatizm, qastrit, xroniki tonzillit, stomatit, oynaqların deformasiyası; ishalda, dezinteriyada, enterokolit, kəskin və xroniki mədə-bağırsaq xəstəliklərində işlədilir |
| *Artemisia absinthium* L. | VII-IX | Çiçək qrupu və yarpaq | Mədə-bağırsaq, tənəffüs yolu xəstəlikləri, böyrək və sidik kisəsinin iltihabı, ağciyər vərəmi, irinli yaralar, xoraların, çatların müalicəsində işlədilir |
| *Asparagus officinalis* L. | V-VII | Kökü | Sinqa, revmatizm, otit, angina, gec sağalan yaralar, bəlğəmgətirici kimi və iştahsızlıqda işlədilir |
| *Bidens tripartita* L. | VII-X | Çiçək, yarpaq | Qastrit, xora xəstəliyi, qanlı ishal, daxili qanaxmalar, ağrı sakitləşdirici, antiseptik və antibakterial vasitə kimi işlədilir |
| *Bryonia alba* L. | V-IX | Kök və kökümsov | Mədə-bağırsaq və onikibarmaq bağırsağın xəstəliyi, bronxit, soyuqdəymələr, öskürək, qurdqovucu kimi, eyni zamanda psixoloji pozğunluq |
| *Centaurium umbellatum* Gilib. | VI-X | Kökümsov və köklərində | Revmatizm, diabet, ağciyər xəstəlikləri, göyöskürək, böyrək ağrıları, sidik kisəsi iltihabı, epilepsiya, sidikqovucu, qaraciyərin funksiyasını yaxşılaşdıran vasitə kimi işlədilir |
| *Cichorium intybus* L. | VII-X | Səbətdə çiçəkləri | Bağırsaq spazmı və iltihabı, meteorizm, ishal, qıcolma əleyhinə, sidikqovucu, çiban, irinli yaralar, revmatizm, bronxial astma, ekzema, qastrit, enteritdə işlədilir |
| *Helichrysum plicatum* D.C. | VI-VIII | Çiçək qrupu və yarpaq | Mədə-bağırsaq, qaraciyər xəstəliklərində, ishalda, tərqovucu, baş ağrıları, oynaq ağrıları sarılıq, qoturluq, qurdqovucu kimi işlədilir |
| *İnula helenium* L. | VII-X | Aşağı yarpaqları və cavan ucları | Raxit, gecsağalan bişməcə, diatez, sarılıq, dəri xəstəlikləri, artirit, qaraciyər və dalaq xəstəlikləri, qızıl yel, həzmi yaxşılaşdıran, iştahanı artıran |
| *Iris germanica* L. | V-VI | Becərilir. Yerüstü hissə | Avitaminoz, mədə-bağırsaq xəstəliyi, köpmə, meteorizm, qan azlığı, sarılıq, qanaxmalarda istifadə olunur. İştah artırıcı təsirə də malikdir. |
| *Matricaria chamomilla* L. | VI-VIII | Kökü və yerüstü hissəsi | Xroniki qəbzlik, ekzema, piqmentli ləkələrin təmizlənməsi, yanıq, qaraciyərin xroniki xəstəlikləri, sarılıq, sidik kisəsi, böyrək, dəri xəstəlikləri, malyariyanın profilaktikası, anemiya, revmatizm və yuxusuzluqda işlədilir |
| *Fumaria officinalis* L. | VI-VII | Toxumları | Pankreatit, xolesistit, xroniki hepatit, xroniki qastrit, enterokolit, qurdqovucu, tər-sidik ifrazını artıran, ekzema və öskürək əleyhinə |
| *Punica granatum* L. | V-XI | Kökümsovu | Iştah artıran, həzmi yaxşılaşdıran, qazqovucu, mərkəzi sinir sisteminin tonusunu artıran, ödqovucu təsir göstərir |
| *Tanacetum vulgare* L. | VI-IX | Kök | Dezinteriya, mədə katarı, qan azlığı, sarılıq, ödqovucu kimi, qaraciyər, böyrək xəstəlikləri, şəkərli diabet, revmatizm, malyariya, soyuqdəymə |
| *Taraxacum officinale* Wigg. | V-VIII | Qabıq və meyvə | Mədə-bağırsaq və böyrək xəstəliyi, qurdqovucu, angina, diş əti iltihabı, qızdırma, şəkərli diabet, öskürək əleyhinə, susuzluğa qarşı, revmatizm və orqanizmin möhkəmləndirilməsində işlədilir |
| *Tussilago farfarea* L. | III-VI | Çiçək qrupu | Böyrək, öd yollarının müxtəlif xəstəlikləri, askaridoz, qanbərpaedici, bəzi dəri xəstəlikləri |
| *Viburnum opulus* L. | V-IX | Kök | Oynaq revmatizmi, ürək əzələsinin tonusunu artıraraq arterial təzyiqi yüksəldir, yüngül işlədici |
| *Herniaria glabra* L. | VII-X | Qozacıqları | Spazmolitik, ağrı kəsici, yuxugətirici, iştah artırıcı, iltihab əleyhinə, sidikqovucu, qıcolma əleyhinə, qurdqovucu təsirə malikdir |
| *Nigella sativa* L. | V-VI | Ləçəklər | Göy öskürək, ekzema, dəmirov, bronxit, bronxial astma, mədə-bağırsaq xəstəlikləri, plevrit, qıcolma əleyhinə, sinə yumşaldıcı və iltihaba qarşı işlədilir |
| *Verbascum densiflorum* Bertol. | VI-X | Yerüstü hissəsi | Öd kisəsi, qaraciyər xəstəlikləri, qastrit, dispepsiya, gec sağalan yaralarda, plevritdə, ağciyər və dalaq xəstəlikləri, qurd və sidik qovucu kimi istifadə edilir |
| *Vaccinium myrtillus* L. | VI-VIII | Yarpaq və yetişmiş meyvələr | Qaraciyər xəstəlikləri, hipoasit, qastrit, revmatizmin oynaq forması, gecə enurezi, sinqa, qurdqovucu, ishalda istifadə edilir |
| *Vaccinium vitis idaea* L. | V-XI | Yerüstü otu | Böyrək xəstəlikləri, sidik kisəsi xəstəlikləri, gecə enurezi, kəskin nefrit, revmatizm, sidik kisəsi spazmı, oğlan uşaqlarında yumurtalıqlarda su yığılan zaman istifadə edilir |

Aparılan anket sorğusu zamanı bir sıra xəstəliklərin müalicəsində eyni bitkilərin işlədilməsi barədə məlumatlar əldə edilmişdir və bu müxtəlif kənd icmaları tərəfindən söylənilmişdir. Bu bitkilərin bioekoloji xüsusiyyətləri və istifadə sahələri barədə 3 saylı cədvəldə izahat verilmişdir. Cədvəldən də göründüyü kimi müxtəlif insanlar eyni bitkinin müalicəvi təsiri barədə müxtəlif xəstəlikləri göstərirlər. Bu müalicə üsulları əsasən dəmləmə (ekstrakt) daxilə qəbul edilməklə gündə 1-2 dəfədən çox olmayaraq, təpitmə (pörtlətmə) dəriyə yaxma qoyulmaqla, bəzən də açıq yaralarda quru bitki tozu səpmə üsulu ilə həyata keçirilir.

Tədqiqatın sonunda ərazi florasının faydalı xüsusiyyətləri ilə fərqlənən (dərman, qida, texniki, aromatik və s.) bitkiləri barədə kitabça tərtib edilməsi və kənd bələdiyyələrinə təqdim edilməsi nəzərdə tutulmuşdur. Beləliklə, 2013-2017-ci illərdə aparılan tədqiqatlar nəticəsində məlum olmuşdur ki, Tovuz-Qazax ərazisində yaşayan əhalinin sorğusuna əsasən 100-ə qədər bitki dərman kimi istifadə edilir. Əhali yaşayış yerlərindən asılı olaraq eyni dərman bitkisini müxtəlif xəstəliklərdə müxtəlif cür istifadə edir. Xalq təbabətində istifadə olunan bitkilər dini inanclara əsasən də tədbiq olunur.

## ƏDƏBİYYAT


**Azərbaycan mifoloji mətnləri** (1988) Bakı: 76 s.

**Qasımov M.Ə., Qasımova T.A., Qədirova G.S.** (2006) XXI əsrin dərman bitkiləri. Bakı: Elm, 429 s.

**İbadullayeva S., Ələkbərov R.** (2013) Dərman bitkiləri (Etnobotanika və Fitoterapiya) // Medicinal plants (Ethnobotany and Phytoterapya). Bakı: Elm, 331 s.

**Mömin M.** (1402 (hicri tarix ilə)) Töhfeyi-həkim-Mömin (əlyazmalar). Tehran.

**Muin M.** Fərhəngi-farsi (əlyazmalar). Tehran. I-VII cildlər.

**Orkun N.N.** (1987) Eski türk yazıları. Ankara, 40 s.

**Алекперли Ф.У.** (2001) Тысяча и один секрет Востока. Том I. Баку: Турал, 505 с.

**Бейдеман И.Н.** (1979) Методика изучения фенологии растений и растительных сообществ. Новосибирск: Наука, 15 с.

**Бромлей Ю.В., Воронов А.А.** (1976) Народная медицина как предмет этнографических исследований. СЭ, **Т. 5:** 3-18.

**Государственная фармакопея СССР** (1989) Вып. 2: Общие методы анализа. Лекарственное растительное сырье. МЗ СССР. IX изд. М: Медицина, 400 с.

**Дамиров И.А., Прилипко Л.И., Шукюров Д.З., Керимов Ю.Б.** (1982) Лекарственные растения Азербайджана. Баку: Маариф, 1982, 319 с.

**Ибадуллаева С., Агаева Э.З.** (2013) Этноботанические исследования по применению растений при болезнях медоносных пчел Азербайджана. *Вестник МГОУ, серия «Естественные науки.* **№1:** 5-9.

**Касумов Г.З., Кулиев В.Б., Ибадуллаева С.Д.** (2009) Дикорастущие пищевые растениея в Нахчыванской АР Азербайджана по материалам этноботанических исследований. *«Растительные ресурсы» (*СПб), **45(вып. 2):** 109-115.

**Крылова И.Л., Шретер А.И.** (1971) Методические указания по изучению запасов дикорастущих лекарственных растений. М.: ВИЛР, 31 с.

**Машковский М.Д.** (2000) Лекарственные средства: Практич. пособие: т. II. 14-е изд., перераб., испр. и доп. М.: Новая волна, 608 с.

**Рабинович А.** (1991) Лекарственные травы и рецепты древних времен. М.: 166 с.

**Altundag E., Ibadullayeva S.J., Aslanipour B., Öztürk M.** (2015) Medicinal and Aromatic Plants of Igdir (Turkey), Nakhcivan (Azerbaijan), and Tabriz (Ira-n). International Conference "Applied ecology: Problems, Innovations". Georgia: Tbilisi-Batumi.

**Guber R.** (2001) La Etnografia. Metodo, campo y reflexividad. Norma, Bogota. https://prezi.com/eabvn0jvz9gb/la-etnografia-metodo-campo-y-reflexividad-rosana-guber/

**Ibadullayeva S.J., Mamedova S.E., Sultanova Z.R., Movsumova N.V., Jafarli I.** (2010) Medicinal plants of Azerbaijan flora used in the treatment of certain diseases. *African Journal of Pharmacy and Pharmacology*, **4(5):** 545-548.

**Ibadullayeva S.J., Shahmuradova M.C., Qahramanova N.C., Aliyeva Sh.G.** (2012) Use of wild plants at dermatitis (skin diseases): Ethnobotany. *Journal of Applied Pharmaceutical Science,* **2(8):** 64-67.

**Martin G.J.** (2001) Etnobotany. Manual de methods. Nordan-Comunidad. Montevideo, Uruguay. http://unicolmayor.edu.co/publicaciones/index.php/nova/article/view/289/553

## Этнофармакологические Свойства Лекарственных Растений, Распространенных На Товуз-Газахской Территории

**С.Дж. Ибадуллаева[1], В.Н. Аббасов[2]**

*[1] Институт ботаники НАН Азербайджана*
*[2] Азербайджанский государственный аграрный университет*

В статье представлены данные о терапевтической значимости лекарственных растений, распространенных на Товуз-Газахской территории, расположенной на северо-востоке Малого Кавказа (в пределах Азербайджана). Согласно результатам опроса и собеседований, были выявлены наиболее распространенные заболевания и около 100 видов лекарственных растений, назначаемых для их лечения. В зависимости от места проживания населения было установлено, что одно и то же лекарственное растение при различных заболеваниях находит различное применение.

***Ключевые слова***: *Этноботаника, нетрадиционные лекарственные травы, этнофармакология, Товуз-Газахская территория*

## Ethnopharmacological Importance Of Medicinal Plants Spread On Tovuz-Gazakh Territory

**S.J. Ibadullaeva[1], V.N. Abbasov[2]**

*[1] Institute of Botany, Azerbaijan National Academy of Sciences*
*[2] Azerbaijan State Agrarian University*

Data about the therapeutic value of medicinal plants spread in the Tovuz-Gazakh territory located in the North-East part of the Lesser Caucasus (within Azerbaijan) are presented in the paper. According to the survey and interviews, the most common diseases and about 100 species of medicinal plants for their treatment were revealed. The same herb was found to have different usage for the treatment of various diseases depending on the habitat of the population.

***Keywords:*** *Ethnobotany, non-traditional herbs, ethnopharmacology, the territory of Tovuz-Gazakh*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 72-76 (2017)*

# Lənkəran Təbii Vilayətində Qızıl Böcəklərin (*Buprestidae*) Təsərrüfat Əhəmiyyətli Növlərinin Bioekoloji Xüsusiyyətləri Və Onların Zərərvermə Dərəcəsinin Kəmiyyətcə Qiymətləndirilməsi

**E.A. Hüseynova**

*AMEA Zoologiya İnstitutu, A.Abbaszadə küç., 1128-ci döngə, 504-cü məhəllə, Bakı AZ 1073, Azərbaycan; E-mail: ella_line@mail.ru*

**Azərbaycanın Lənkəran bölgəsinin *Buprestidae* fəsiləsinin təsərrüfat əhəmiyyətli bəzi növlərinin bioekoloji xüsusiyyətlərin tədqiqi üçün tələb olunan material 2014-2016-cı illərdə müxtəlif təbii landşaftlardan toplanmışdır. Aşkar olunmuş 22 növdən, *Agrilinae* Laporte, 1835 yarımfəsiləsinə mənsub 4 növ çoxsaylı olmuşdur. Bu növlərin (*Meliboeus robustus* (Küster, 1852), *Coraebus rubi* (Linnaeus, 1767), *Coraebus elatus* (Fabricius, 1787) və *Agrilus viridis* (Linnaeus, 1758)) bioekoloji xüsusiyyətləri öyrənilmişdir. Bu növlərin yetkin fərdlərinin zərərliliyinin riyazi cəhətdən qiymətləndirilməsi onlara qarşı mübarizədə aqrotexniki vasitələrin məhdudlaşdırılmasının mümkünlüyü barədə fikir irəli sürməyə imkan veruir.**

***Açar sözlər:*** *Fəsilə, çins, böcək, sürfə, ağaç, zərərvermə*

## GİRİŞ

Lənkəran təbii vilayəti Xəzər dənizinin cənubqərb sahilindəyerləşir. Ərazi qədim bitki örtüyüilə fərqlənir. Burada enliyarpaqlı istisevən ağac cinsləri üstünlük təşkil edir. Meşələr paleogen dövrünə aid ağac növləri (dəmirağac, şabalıdyarpaq palıd, ipək akasiya, hirkan ənciri və s.) ilə səciyyələnir (Алиев и др., 1972). Belə zəngin və özünəməxsus floristik kompleks aralarında endemik və relikt növlərində olduğumaraqlı entomofaunanın formalaşmasına səbəb olmuşdur. Həşəratlar meşə senozlarının ən mühüm komponentlərindən biridir. Müasir dövrdə, əhalinin miqrasiyası, urbanizasiya və torpaqların becərilməsi proseslərinin intensivləşdiyi bir vaxtda, təbii ekosistemləri qoruyub saxlamaq çox çətindir. Təbiətin qeyri səmərəli istifadəsi meşə sahələrinin əhəmiyyətli dərəcədə azalmasına gətirib çıxarmışdır. Təbii meşə senozları çəmənliklərlə, çay və sitrus plantasiyaları ilə əvəz olunmuş, və yaxud da, ağacların kəsilməsi səbəbindən çılpaq çöllərə çevrilmişdir. Aparılan agromeliorasiya tədbirləri dağ meşələrinin qurumasına gətirib çıxarmışdır. Bütün bunlar entomofaunanın biomüxtəlifliyinə ciddi təsir göstərir. Meşə senozlarının kənd təsərrüfat sahələrilə əvəz olunması zərərli və faydalı həşəratlar arasında balansın pozulmasına və sinantrop növlərin sayının əhəmiyyətli dərəcədə artmasına şərait yaratmışdır. O da, məlumdur ki, zəifləmiş ağaclar zərərvericilərin daha çox hücumuna məruz qalır. Meşələrin zəifləməsilə zərərvericilərin sayının kütləvi arması arasında sıx qarşılıqlı əlaqə vardır. Kənd təsərrüfatı sahələrinin meşələrin yaxınlığında olması, bitkilərdəki yoluxucu xəstəliklərin daşıyıçı həşaratlarla bir sahədən başqasına kecməsi üçün əlverişli şərait yaradır, bu da ağacların məhv olmasına səbəb olur. Buna görədə ayrı-ayrı həşərat qruplarının keyfiyyət və kəmiyyət vəziyyətinin araşdırılması çox aktualdır. *Buprestidae* faunasının bəzi nümayəndələri meşə və meyvə ağaclarının təhlükəli zərərvericiləri olduqlarından Azərbaycanın Lənkəran təbii vilayətində onların tədqiqi böyük maraq kəsb edir. Tədqiqatın məqsədi kənd təsərrüfatı bitkiləri üçün təhlükə törədən və biomüxtəlifliyin mühafizəsi üçün əhəmiyyət kəsb edən növlər arasında nisbəti müəyyən etmək olmuşdur.

## MATERİAL VƏ METODLAR

Materialın toplanması, hesablanması və müşahidələr 2014-2016-cı i llərinyaz, yay mövsümlərində Lənkəran təbii vilayətinin Lənkəran, Lerik, Yardımlı və Astara rayonlarında ekspedisiyalar zamanı ümumi qəbul olunmuş entomoloji metodlarla (Фасулати, 1971) aparilmişdir. Bioekoloji xüsusiyyətlərə aid məlumatlar A.A.Rixterın (Рихтер, 1948) məlumatları ilə müqayisə olunub. Tədqiqatlar təbii və agrosenozlarda aparılmışdır. Səfər müddətində Astara rayonunun (dəniz səviyyəsindən 1265 m hündürlükdə, N 38°34´20.5´´və E 048°33´45.1´´ koordinatlarında yerləşən, ərazisi 497 ha olan meşə ilə əhatə olunmuş) Toradi kəndi, Lerik rayonunun Qosmoliyan, Divağac (H 1444 m koordinatlar: N 38 6693°, E 048, 36312°) və Yardımlı rayonunun Alar, Qız qalası və Maqara (H 1533-1800 m koordinatlar: N 38 47 489°; E 48 14 969°) ərazilərində müxtəlif biotoplar nəzərdən kecirilib və *Buprestidae* fəsiləsinə aid böcəklər toplanmışdır.

Növlərin təyinatı təyinat kitablar ilə, taksonomik paylanması isə “Palearktik Sərdqaladlıların Kataloqu”na (*Buprestidae*) (Kubáň, V. & et.) əsasən aparılıb.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Qızıl böcəklər (Buprestidae) fəsiləsi Coleoptera dəstəsinin xarici görünüşcə ən gözəl fəsilələrindən biridir. Ölçülərinə görə çox da böyük olmayan bu böcəklər orta, nadir hallarda iri ölçülü, çox vaxt metal parıltılıdırlar. Onların bədəni uzunsovdur, yığcam və ya silindr şəkillidir, möhkəm çanaqla örtülmüşdür, qanadüstlükləri uclara doğru daralır. Bığcıqları qısa, mişarşəkillidir, ayaqları qısadır. Ağac gövdəsinin daxilində gizli həyat sürməsi onların əsas bioloji xüsusiyyələrindən biridir. Lənkəran təbii vilayətində Buprestidaefəsiləsinə aid 22 növ böcək aşkar olunmuşdur.

Növ sayına görə *Buprestinae* və *Chrysochroinae* yarımfəsilələri, fərdlərin sayına görə isə *Agrilinae* yarımfəsiləsinin üc çinsinin nümayəndələri üstün olmuşlar (şək. 1). Bu növlərdən *Meliboeus robustus* – 21%, *Coraebus rubi* – 15%, *Coraebus elatus* – 13% və *Agrilus viridis* -10% tədqiqat illərində coxsaylı olmuşlar.

*Agrilinae* yarımfəsiləsiləsinə aid qızıl böcəkləri nazikbədən adladırırlar. Nazikbədən qızıl böcək cinsi sürfələri ağac və kol bitkilərinin gövdələrinin qabığı altında, oduncağında, ot bitkilərinin gövdə və köklərində inkişaf edirlər. Bir çox növləri ciddi zərərvericidir.

*Agrilus* Curtis, 1825 qızıl böcəklər fəsiləsinin ən böyük cinsi olub 3000-ə qədər növübirləşdirir (Горностаев, 1970). Tez-tez rast gəlinən böcəklərdir, onların arasında təhlükəli zərərvericiləri coxdur. Bu cinsə daxil olan növlər arasında *Agrilus viridis* (Linnaeus, 1758) ən təhlükəli ziyanverici hesab olunur. Böcəyin ölcüləri 5-9 mm-dir, tünd yaşıl rəngli,bədəni nazikdir.  Sürfələrin ölcüləri 17 mm-dir (Niehuis, Tezcan, 1993).

Bu növün bir nəsli 1-2 ilə inkişaf edir. Sürfə mərhələsində zədələnmiş budaqların alt tərəfində qışlayır. Sürfələr qış diapauzasından mart ayında, orta temperatur 12°C olduqda çıxır. Aprel-may aylarında sürfələr puplaşırlar. Pup ağ rəngli, 12-21 mm ölcüdə olur.

May-iyun aylarında böcəklər bağlarda rast gəlinir. Ən yüksək fəallıq günün işıqlı vaxtına təsadüf edir. Ağaç və kölların yarpaqlarını gəmirərək qidalanırlar. Mayalanmadan bir necə gün kecəndən sonra dişi fərdlər  yarpaqların və nazik budaqların üzərinə yumurta qoymağa başlayır. Dişilərin reproduktiv qabiliyyəti 22-72 yumurtadır. Cənub rayonlarında yumurtanın inkişafı 11-17 gün çəkir. Yumurtaqoyma mərhələsi 1-2 ay davam edir. Böcəklər yumurta qoyduqdan sonra ölürlər. Ziyanvericinin fəaliyyəti ağacın məhsuldarlıgını 2 dəfə azalda bilir. Baxımsız bağlarda bu böcəklər daha çoxsaylı olurlar.

*Coraebus* (Gory & Laporte, 1839) *Agrilinae* yarım fəsiləsinin cinslərdən biridir. Ədəbiyyatda 250 növü olduğu göstərilir. Bizim tədqiqatlarda cinsin *Coraebus rubi* (Linnaeus, 1767) növünə təbii vilayətin bütün rayonlarında rast gəlinib. Ölcüləri 7-11 mm-dir. Bədəni qara rəngdə olub, üzərində metal rəngli zolaglı naxışları var. Bədəni uzunsovdur. Oduncağın kambiqatında inkişaf edir. Sürfələri qızılgül, moruq, itburnu kollarını daha çox zədələyir. Yetkin fərdlər yarpaqlarla qidalanır.




**Şəkil 1.** Lənkəran bölgəsində *Buprestidae* növlərinin faizlə miqdarı

**Cədvəl 1.** Yarımfəsilələrin nümayyəndələrinin qida ixtisaslaşmaları

| Yarımfəsilənin adı | Rizofaqlar | Ksilofaqlar | Fillofaqlar | Antofaqlar | Qerbifaqlar |
|---|---|---|---|---|---|
| ***Polycestinae*** | Sürfə | Sürfə | Imago | Sürfə, Imago | Sürfə |
| ***Buprestinae*** | Sürfə | Sürfə | Imago | Imago | Sürfə |
| ***Chrysochroinae*** | Sürfə | Sürfə | Imago | - | - |
| ***Agrilinae*** | Sürfə | Sürfə | Sürfə, Imago | Imago | Sürfə |




**Şəkil 2.** Yarımfəsilə nümayyəndələrinin yaşayiş yerləri üzrə paylanması

*Coraebus elatus* (Fabricius, 1787) ölcüləri 5-7 mm, bədəni tünd bürünc rəngli böcəklərdir. Moruq, itburnu, yemişan kollarında inkişaf edir.

*Meliboeus robustus* (Küster, 1852). Böcəklərin ölcüləri 6-8 mm-dir. Rəngləri çox fərqli olub, tünd göydən – tünd yaşıla qədər dəyişir və metal parıltısı xarakterikdir. Bu növ 3 illik tədqiqatlarımız zamanı say çoxluğu təşkil etmişdir. Yetkin fərdlər meyvə ağacların yarpaqlarında qidalanan zamanı rast gəlinir vəfərdlərin mayalanma prosesi qida bitkisi üzərində baş verir. Sürfələr meyvə ağaclarının gövdəsində inkişaf edir, bununla da bitkiyə əhəmiyyətli dərəcədə ziyan vururlar.

Yalnız zəifləmiş ağacların birindən digərinə çox asanlıqla keçərək orada müvəffəqiyyətlə artıb çoxaldıqları üçün onları "ikinci dərəcəli" ziyanverici hesab edirlər.

Lakin qızıl böcəklər arasında elə növlər vardır ki, nəinki zəifləmiş, hətta sağlam ağaclarda da məskunlaşaraq onların tamamilə məhvinə səbəb ola bilirlər. Belə növlər yüksək təsərrüfat əhəmiyyətinə malik olduqları üçün məhz ilk növbədə onlar üzərində hesablamalar aparılmalı və daim nəzarətdə saxlanılmalıdırlar.

Qeyd etmək lazımdır ki, bu fəsilənin yalnız fitofaq olan bir çox növləri meşə və kənd təsərrüfatı bitkilərinin ziyanvericiləri kimi maraq doğururlar ki, bunların da kütləvi artımına təbii vilayətdə təsadüf edilməmişdir. Alma bağlarında təxminən 25% ağacların gövdələrinin qızıl böcəklərin sürfələri tərəfindən zədələndiyi qeydə alınmışdır.

Bu və ya digər potensial təhlükəli qızıl böcək növləri baxımsız ərazilərdən onlarla həmsərhəd yerləşən Hirkan Milli Parkına keçib relikt və endemik ağac növləri üçün təhlükə törədə bilərlər (cədvəl 1).

Cədvəldən göründüyü kimi bütün 4 yarımfəsilə nümayəndələrinin qidalanan sürfə mərhələsi həm çürümüş həm də sağlam bitkilərin müxtəlif təbəqələri –qabıq, oduncaq və s. ilə qidalanırlar. Həmçinin onların arasında alaq otları ilə qidalanan bir çox qerbifaqlar da var. Bu səbəbə görə, həmin növləri xeyirli hesab etmək olar. Qida ixtisaslaşmasına görə fəsilənin nümayəndələri monofaq, oliqofaq və polifaq qruplara aid olurlar. Bizim məlumata görə, monofaqlar Lənkəran təbii vilayətində qeyd olunmayıb. 8 növ (36,3%) oliqofaq, 9 növ (40%) polifaqdır, qalan növlərin isəqida bitkisi dəqiq müəyyən edilməmişdir.

Əksər növlərin sürfə mərhələsinin trofik əlaqəsi yalnız bir növ ağac bitkisi ilə bağlıdır, yetkin fərdlər isə bir çox ot bitkilərin üzərində rast gəlinir. Bir çox növlərin sürfə mərhələsində qida bitkiləri təyin olunmayıb və səhvən əsas yem bitkisi kimi yetkin fərdin rast gəlindiyi bitki qəbul edilir. Cədvəldə öz müşahidələrimizdən əldə etdiyimiz və eləcə də ədəbiyyat məlumatları təqdim olunur.

Diaqram 2-də göründüyü kimi təqdim olunan növlərin çox hissəsinin (27%) sürfə mərhələsi ağac-kol və otbitkiləri üzərində kecir (dendro-hortobiont və tamnobiot), növlərin 23%-i otlarda (hortobiont), 18%-i ancaq ağaclarda (dendrobiont), 1,5%-i ağac-kol bitkilərində (dendro-tamnobiont) qeydə alınmışdır.

*Agrilinae* yarımfəsilənin nümayəndiləri əsasən meşə və meyvə ağaclarının ziyanvericiləri kimi tanınmışdır. Yetkin böcəklər yarpaqlar, tumurcuqlar

və çiçəklərlə qidalanaraq bəzən onları tamamilə yeyib ağacın zəifləməsinə və məhsulun nəzərəçarpacaq dərəcədə azalmasına səbəb ola bilirlər. Bununla əlaqədar olaraq böcəyin zərərvurma dərəcəsini inkişafın məhz bu mərhələsində hesablamaq vacibdir.

Ziyanvericiliyinə görə gövdə zərərvericiləri 3 kateqoriyaya bölünürlər:

F – fizioloji təhlükəli - zəifləmiş canlı ağaclara hucum edərək onların məhv olma prosesini tezləşdirir və bərpasına mane olur.

T – texniki təhlükəli - bərpa oluna bilməyəcək dərəcədə zəifləmiş və ya ölü ağaclarda məskunlaşır, öz yollarını oduncaq boyu açaraq, onun keifiyyətini aşağı salır və odunçagı parcalayan göbələklərlə yoluxmasına səbəb olur.

F/T – bu növlər canlı ağaclara hücum edərək onlara texniki ziyan vururlar.

Növlərin rastgəlmə tezliyi balla geyd olunur:

1 ball – kütləvi növ, lap çox rast gəlinir

2 ball – adi növ, çox rast gəlinir

3 ball – nadir halda rast gəlinir

4 ball - tək-tək rast gəlinir

Vizual üsulla zədələnmiş gövdələrin sayı və yarpaqların zədələnmə dərəcəsi 5 ballı şkala ilə (yarpağın yeyilmə %-i) təyin edilmişdir:

9 bal – zədələnmə yoxdur, 7 bal – zədələnmə 25%-ədəkdir; 5 bal – zədələnmə 50%-ədəkdir; 3 bal – zədələnmə 75%-ədəkdir; 1 bal - zədələnmə 75%-dən yuxarıdır.

Zədələnmə intensivliyi aşağıdaki düstur ilə hesablanmışdır:

$$M = \Sigma(n_1 \times b) / \Sigma n_1$$

M - zədələnmə intensivliyi, $(n_1 \times b)$ – zədələnmiş bitkilərin sayının ümumi miqdarının uyğun zədələnmə balına hasilidir.

$n_1$ – nümunədə olan zədələnmiş bitkilərin ümumi miqdarıdır.

Bu növlərin fizioloji zerərvericiliyi müəyyən edilmiş və rastgəlmə tezliyi 2 balla qiymətləndirilmişdir. Yarpaqların böcəklər tərəfindən zədələnməsi qiymətləndirmədə 7 bala uyğun olmuşdur (25%-ə yaxin), bu da *Meliboeus robustus* növünün zərərvericilik dərəcəsinin–5,6, *Coraebus rubi* – 3,5, *Coraebus elatus*- 5,2, *Agrilus viridis* – 4,2 bala uyğun olduğunu göstərir. Bu göstəricilər iqtisadi ziyan-vurma həddinə yaxındır. Göstəricilər bu həddən yuxarı olduqda mübarizə tədbirləri həyata keçirilməlidir.

Həşəratlar kənd təsərrüfatı bitkilərinin zərərvericiləri kimi o zaman əhəmiyyət daşıyırlar ki, onların sayı iqtisadi zərərvurma həddini üstələsin, əks halda, həşərat nə qədər çox yesə də məhsuldarlığa əhəmiyyətli zərər vura bilmir. Ona görə də müvafiq elmi-tədqiqat işləri vəqoruyucu tədbirlərin planlaşdırılması populyasilarda sayın azaldılmasına yönəlməlidir.

**Mübarizə:** Aqrotexniki tədbirlər: Çəyirdəkli meyvə bağlarının və şitilliklərin salınması zamanı torpaqdan ağac və kolların kökləri tamamilə təmizlənməlidir, çünki, onlarda qızılböcəklərin sürfələri qala bilər. Torpağın düzgün emalı və gübrələmə böyük əhəmiyyət daşıyır.

Mexaniki üsul**.** Bağlarda ağaçlardan böcəkləri yığıb məhv etmək tövsiyyə olunur.

## ƏDƏBİYYAT

**Алиев А.А., Гасанов Г.К.** (1972) Ландшафты Талыша. Баку: Элм, 101 с.

**Горностаев Г.Н.** (1970). Насекомые СССР. Москва: 97-103.

**Рихтер А.А.** (1948) Определитель насекомых Европейской части СССР (*Coleoptera*: *Buprestidae*): 383-391.

**Фасулати К.К. (**1971) Полевое изучение наземных беспозвоночных. М.: Высшая школа, 424 с.

**Kubáň V., Jendek E., Kalashian M.Yu., Volkovitsh, M.G.** (2016) Superfamily *Buprestoıdea* Leach, 1815. (pp. 19-32 [New Acts], 432-574 [Catalogue]. I.Löbl and D.Löbl (eds.). Catalogue of Palaearctic *Coleoptera* (Revised and Updated Edition). Vol. 3. *Scarabaeoidea, Scirtoidea, Dascilloidea, Buprestoidea* and *Byrrhoidea.* Brill. Leiden - Boston, 983 pp.

**Niehuis M., Tezcan S.** (1993) Beitrag zur Kenntnis der Agrilus-Arten der Türkei (*Coleoptera: Buprestidae*). Mitteilungen Des Internationalen Entomologischen Vereins. Band 18, N 1/2.Frankfurt a. M. 1. P.37-38.

## Биоэкологические Особенности Хозяйственно Значимых Видов Жуков-Златок (*Buprestidae*) Ленкоранской Природной Области и Количественная Оценка Их Вредоносности

**Э.А. Гусейнова**

*Институт зоологии НАН Азербайджана*

Данные статьи основаны на трехлетних (2014-2016 гг.) исследованиях биоэкологических особенностей жуков-златок, проводимых в Ленкоранской природной области. Семейство жуков-златок представлено 22 видами, приводятся сведения по численному соотношению, пищевой специализации и среде их обитания. В сборах наиболее многочисленными оказались 4 вида подсемейства *Agrilinae - Meliboeus robustus* (Küster, 1852), *Coraebus rubi* (Linnaeus, 1767), *Coraebus elatus (*Fabricius, 1787) и *Agrilus viridis* (Linnaeus, 1758**)**, биоэкологические особенности которых и были изучены. Количественная оценка вредоносности исследуемых видов составила 5,6; 3,5; 5,2; 4,2 балла соответственно.

***Ключевые слова:*** *Семейство, род, жук, личинка, дерево, вредоносность*

## Bioecological Features Of Economically Important beetles Of The *Buprestidae* Family In The Lenkoran Natural Area And Quantitative Estimation Of Damage Caused By Them

**E.A.Huseynova**

*Institute of Zoology, Azerbaijan National Academy of Sciences*

The data presented in the paper are based on three-year (2014-2016) studies on the bioecological features of the jewel beetles conducted in the Lenkoran Natural Area. The family is represented by 22 species; information is given on the numerical ratio, food specialization and habitat. Four species of the subfamily *Agrilinae –Meliboeus robustus* (Küster, 1852), *Coraebus rubi* (Linnaeus, 1767), *Coraebus elatus* (Fabricius, 1787), *Agrilus viridis* (Linnaeus, 1758), which are of great economic importance as pests of fruit trees dominated during material collection. The quantitative assessment of the harmfulness of the studied species was 5.6, 3.5, 5.2, 4.2, respectively.

***Keywords:*** *Family, genus, beetle, larva, tree, harmfulness*

# *Liriodendron Tulipifera* L. Növünün Abşeron Şəraitində Çoxaldılması

**T.S. Məmmədov*, P.S. Şıxəliyeva, V.M. Novruzov**

*AMEA Dendrologiya İnstitutu, Mərdəkan qəsəbəsi., S.Yesenin küç., 89, Bakı AZ1044, Azərbaycan;*
**E-mail: dendrary@mail.az*

**Tədqiqat işində *Magnoliaceae* Juss. (J.St. Hil.) fəsiləsinin *Liriodendron* L. cinsinə aid *Liriodendron tulipifera* L. (Tülpan ağacı) növünün Abşeron şəraitində toxumla çoxaldılması öyrənilmiş və məlum olmuşdur ki, toxumlarının stratifikasiyası dinclik dövrünün qısaldılmasında və toxumların cücərməsində əsas amildir. *Liriodendron tulipifera* L. növünün stratifikasiya olunmuş toxumları yazda açıq və örtülü şəraitdə 1,5-2,0 sm dərinlikdə səpildikdə 6,0-8,0% cücərti verir. Vegetasiyanın sonunda orta hündürlüyü 22-28 sm olan birillik *L. tulipifera* tinglərinin üzərində 7-15 ədəd yarpaq formalaşır. Abşeron şəraitində cücərtilərin inkişafı sentyabrın III ongünlüyünədək davam edir. Beləliklə, *L. tulipifera* L. növünün Abşeron şəraitində açıq və qapalı şəraitdə toxumla çoxaldılması tədqiqat işində öz əksini tapmaqla, gələcəkdə yaşıllaşdırmada istifadəsi tövsiyə edilir.**

***Açar sözlər***: *Liriodendron tulipifera* L.*, çoxaldılma, toxum, introduksiya, cücərti, stratifikasiya*

## GİRİŞ

Respublikamızda yeni bəzək bitkilərinin yerli şəraitə uyğunlaşdırılmasnda növün toxumla çoxaldılması və becərilmə xüsusiyyətlərinin öyrənilməsi əsas amillərdən biridir. Hal-hazırda Botanika bağlarında və dendrarilərdə bu istiqamətdə geniş tədqiqat işləri aparılır. Belə perspektivli, yaşıllaşdırmada çox az rast gəlinən *Magnoliaceae* Juss. (J. St. Hil.) fəsiləsinin *Liriodendron* L. oliqotip cinsinə aid *Liriodendron tulipifera* L. (Tülpan ağacı) növünün Abşeron şəraitində çoxaldılması və bəzək bağçılıqda istifadəsi mühüm əhəmiyyət kəsb edər.

*Magnoliaceae Juss.* - Maqnoliyakimilər fəsiləsinə həmişəyaşıl, bəzən yarpağını tökən ağac və ya kollar daxildir. Əsasən cənub və cənub-qərbi Asiyada, Şimali Amerikada, Çində, Braziliyada təbii şəraitdə yayılmışdır. Fəsiləyə 6 cins, 250 növ daxildir. Yarpaqları parlaq iri olub kənarları bütövdür. Çiçəkləri iri, tək, ağdan tünd qırmızıyadək müxtəlif çalarlı, xoş ətirlidir. Yaxşı drenajlı, zəngin torpaqlara üstünlük verir.

*Liriodendron* L. - Liriodendron (Tülpan ağacı) cinsinin vətəni Şimali Amerikanın şərq hissəsidir. Cinsə 2 növ daxildir. Nümunələri buzlaq dövründə geniş miqyaslı buzlaşmaya məruz qalmışlar. Avropada bu bitkinin qalıqları tapılmışdır.

*Liriodendron tulipifera* L. (Tülpan ağacı) növü hündürlüyü 25-36 m, çətrinin diametri 20-24 m, gövdəsinin diametri 50 sm-ə çatan şaxələnmiş, yumru çətirli ağacdır. Əsasən şimali Amerikada, Qara dəniz sahillərində təbii yayılmışdır. Bitki uzunömürlüdür, 400-500 il yaşayır. Yarpaqların uzunluğu 8-22 sm, eni 6-25 sm-dir. Yarpaqlarının üstü parlaq yaşıldır, payızda isə sarımtıl rəng alır. Tumurcuqları iri, küt, 2 qabıqlıdır. Çiçəkləri ikicinsli, tək, diametri 3-10 sm, yaşılımtıl-sarıdır, görünüşünə görə tülpanın çiçəklərinə bənzəyir. Çiçək yanlığının 9 xırda yarpağı vardır, onlardan üçü üst-də yumurtavari-lansetvari, yaşılımtıl ağ, tez tökülən kasayarpaqlı və altı enli-yumurtavari, açıq-yaşıldır, içəridə ləçəklər yerləşir. Çiçəkləri zəif xiyar ətirlidir. Erkəkcikləri və dişicikləri sünbülün ətrafında spiral şəklində yerləşir; erkəkcikləri tökülür, dişicikləri isə qanadcıq formasında olur. Çiçəkləməsi iqlim şəraitindən asılı olaraq apreldən iyuna qədər davam edir. Meyvəsi qozatəhər çıxıntıdan ibarətdir. Bu çıxıntı uzunluğu 4-9 sm olan, dörd hissəli toxumlu bir və ya iki qanadcıqdan ibarətdir. *L. tuli-pifera* L. növünün vətənində xəstəliklərə, zərərveri-cilərə və havanın çirklənməsinə davamlı olduğunu nəzərə alsaq, Abşeron şəraitində parklarda, bağlarda, urbanizasiya olunmuş ərazilərin yaşıllaşdırılmasında istifadəsi məqsədyönlüdür. Bunu nəzərə alaraq tədqiqat işimizdə qeyd edilən növün Abşeron şəraitində çoxaldılması, birillik tinklərin böyüməsi öyrənilmişdir.

## MATERİAL VƏ METODLAR

Hal-hazırda ədəbiyyat mənbələrində *L. tulipifera* L. növünün əsas ontogenez mərhələlərini keçmə xüsusiyyətləri haqda ədəbiyyat materiallarına çox az təsadüf edilir. İ.T.Vasilçenko (1960), İ.Q.Serebryakov (1962) tərəfindən aparılmış tədqiqatlarda *L. tulipifera* L. növünün səpindən cücərtilərin əmələ gəlməsinədək olan dövr və cücərtilərinin morfoloji xüsusiyyətləri haqda məlumatlar verilir. Buna görə bizim tədqiqatın məqsədi *L. tulipifera* L. növünün toxumla çoxaldılması, toxumların səpin vaxtını və cücərtilərinin virginil dövrdə inkişaf xüsusiyyətlərini təyin etməkdir. Tədqiqat işində *L. tulipife-ra* bitkisinin Suxumi, Türkiyə Ağdəniz Universite-tinin Botanika bağından alınmış toxumlarından isti-

fadə edilmiş və tədqiqat Dendrologiya İnstitutunun təcrübə sahəsində aparılmışdır.

*L. tulipifera* növünün cücərtilərinin inkişaf xüsusiyyətlərinin tədqiqatı üçün ontogenezin ilkin mərhələlərinin öyrənilməsində Q.İ.Redkonun (1983) metodikasından istifadə edilmiş, cücərtilərin inkişaf xüsusiyyətləri, ontogenez mərhələlərinin dəyişməsi araşdırılmışdır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSİ

*L. tulipifera* meyvələri çox toxumlu, qoza-şəkilli yarpaqcıqlar və ya spiral formalı, uzunsov, pazşəkilli, açılmyan, 1-2 toxumlu, üst tərəfdən tilli, uzun, ensiz, ucu biz qanadlı qozalardır, yetişdikdə toxumlar meyvənin uzunsov oxundan ayrılır və tökülür (Şəkil 1, a, b).

*L. tulipiferanın* bir meyvəsində xırda toxumların miqdarı 70-120-dək dəyişir. Tədqiqat zamanı toxumlar 2 variantda - payızda və stratifikasiya olunmuş toxumlar yazda açıq və örtülü sahələrə səpilmişdir. Səpindən əvvəl sağlam toxumlar seçilmiş, 1,5-2,0 sm dərinlikdə səpilmişdir. İstixana şəraitində *L. tulipiferanın* stratifikasiya olunmuş toxumları xüsusi səpin qutularında hazırlanmış substratda ( küllü, qara torpaq– 60%; qum – 25%; torf – 15%) səpilmişdir.

Tədqiqatdan məlum olmuşdur ki, *L. tulipifera* toxumlarının stratifikasiyası yaz səpini üçün əsas şərtdir. *L. tulipifera* növünün əvvəlcədən stratifikasiya olunmuş toxumları açıq sahədə yaz səpinində 4 sayda tək-tək cücərti vermişdir, yəni toxumların cücərməsi ancaq 4,0% olmuşdur. Növbəti ildə həmin təcrübə sahəsində cücərtilər əmələ gəlmişdir və toxumların cücərməsi 6%-i təşkil etmişdir. Örtülü şəraitdə toxumların cücərməsi bir qədər yüksək olmuşdur (8%). Payızda səpilmiş toxumlar isə 3,0-4,0% cücərti vermişdir. Tədqiqatın nəticəsində məlum olur ki, *L. tulipifera* növünün toxumları hər iki şəraitdə zəif cücərmə qabiliyyətinə malikdir.

İlk cücərti payız səpinindən 135-145 gündən, yaz səpinindən isə 35-49 gündən sonra müşahidə edilir. Açıq və örtülü şəraitində ilkin cücərtidən kütləvi cücərtilərin əmələ gəlməsinə qədər olan müddət 6-9 gün təşkil edir (Cədvəl 1).

Ədəbiyyat mənbələrinə görə (Nesteroviç, 1967, Культиас, 1953*)* *L. tulipifera* bitkisinin toxumları yüksək cücərmə qabiliyyətli deyil. Bizim tərəfimizdən aparılmış tədqiqat işində də bu öz əksini tapdı, belə ki, toxumların cücərrməsi 3-8%-dən artıq olmamışdır. Qeyd etmək lazımdır ki, bitkinin vətəni Şimali Amerikada belə toxumla çoxaldılmada cücərmə qabiliyyətinin 11-16%-dən yüksək olmadığı haqda məlumatlar verilir.

S.N.Vladimirovna (2015) qeyd edir ki, çox miqdarda *L. tulipifera* çiçəklərinin sterilliyi dişi qametofitin qidalanması ilə əlaqədardır və cinsin qədim olmasının əlamətləri olan konstruktiv xüsusiyyətləri ilə bağlıdır, nəticədə toxumların cücərməsinin aşağı olması çarpaz tozlanmanın olmaması ilə izah olunur.



**(a)**



**(b)**

**Şəkil 1**. *L. tulipifera* bitkisi, onun meyvə və toxumları

Bizim tədqiqatların nəticələrinə görə açıq torpaq şəraitində isə toxumların cücərməsi payızda 3,0% , yazda isə 6,0% olmuşdur.

Tədqiqat nəticəsində məlum olmuşdur ki, örtülü şəraitdə toxumların səpin dərinliyi onların ikiqat qalınlığından artıq olmamalıdır. *L. tulipifera* toxumlarının qalınlığı 0,4-0,8 sm-dir, ona görə optimal səpin dərinliyi 1,6 sm seçilmişdir. *L.tulipi-fera* cücərtisinin ontogenezin erkən mərhələlərində inkişaf xüsusiyyətlərini öyrəndikdə aşağıdakı inkişaf mərhələləri qeydə alınmışdır (Şəkil 3):

**Cədvəl 1.** *L. tulipiferanın* toxumlarının açıq və örtülü şəraitində cücərməsi

| Səpilən toxumların miqdarı, əd | Səpin tarixi | İlk cücərtilərin əmələgəlmə tarixi | Səpindən ilk cücərtilərin əmələ gəlməsinədək olan dövr, gün | Kütləvi cücərtilərin əmələgəlmə tarixi | Cücərmə %-i |
|---|---|---|---|---|---|
| **açıq torpaq şəraiti** | | | | | |
| 100 | 25.XI.2015 | 20.04.2016 | 145 | 28.04.2016 | 3,0±0,18 |
| 100 | 15.III.2016 | 04.05.2016 | 49 | 13.05.2016 | 6,0±0,20 |
| **örtülü torpaq şəraiti** | | | | | |
| 50 | 25.XI.2015 | 10.04.14 | 135 | 08.04.16 | 4,0±0,15 |
| 50 | 15.III.2016 | 20.04.14 | 35 | 26.04.2016 | 8,0±0,19 |



**Şəkil 2.** Cücərtilərin ümumi görünüşü

I. Toxumların səpinindən cücərtilərin alınmasınadək olan dövr;

II. Cücərtilərin alınması – torpağın üzərində burulmuş ləpəyarpaqlarında əyilmiş hipokotil əmələ gəlir;

III. Ləpəyarpaqlarının açılması;

IV. Açılmamış həqiqi yarpaq tumurcuğunun əmələ gəlməsi;

V. Yarpaq ayasının açılması;

VI. Gövdənin epikotil hissəsinin böyüməsi.

Tədqiqat zamanı cücərtinin morfogenezi öyrənilmişdir. Ləpəyarpaqlarının açılması dövründə qipokotil və kökcüyün uzunluğunun nisbəti 1:1 təşkil edir. Ləpəyarpaqlarının açılması fazasında *L. tulipifera* cücərtilərinin əsas kökcüyü və yan kökcükləri müşahidə edilməmişdir. Ləpəyarpaqları açıldıqdan 2-3 gün sonra rüşeym zoğunun tumurcuğu formalaşmağa başlamışdır. Bu vaxt əsas kökcük və üzərində 1-2 ədəd yan kökcüklərin əmələ gəlməsi müşahidə edilir. Ontogenezin bu mərhələsində və sonrakı fazada kökün böyüməsi zəifləyir, ancaq bitkinin yerüstü hissəsinin - gövdəsinin yuxarıya doğru böyüməsi sürətlənir.

Qeyd etmək lazımdır ki, *L. tulipifera* növünün cücərtisinin epikotil hissəsinin yuxarıya böyüməsi ikinci yarpağın inkişafının başlanması ilə aktivləşir və 8-12 gün ərzində uzunluğu 4-5 mm təşkil edir. Ləpəyarpaqlarının açılmasından birinci həqiqi yarpağın əmələ gəlməsinədək 12-17 gün keçir, bir aydan sonra isə tamamilə iki həqiqi yarpaq müşahidə edilir və 16-20 gün ərzində inkişaf edir. Sonra hər 7-10 gündən bir həqiqi yarpaq əmələ gəlir və onlarla paralel yan və əlavə köklər, sonra isə bütövlükdə kök sistemi formalaşır (Şəkil 4). Vegetasiyanın sonunda orta hündürlüyü 22-28 sm olan birillik *L. tulipifera* tinginin üzərində 7-15 ədəd yarpaq formalaşır.




**Şəkil 3**. Ontogenez prosesində *L. tulipifera* cücərtilərinin morfoloji dəyişməsi: I-VI – fenofazalar

Birinci yarpaq maksimal ölçülərə çatdıqda əsas kök üzərində 6-7 ədəd, optimal ölçülərə çatdıqda isə 11-17 ədəd yan kökcüklər formalaşır. İkinci yarpaq əmələ gəldikdə toxmacaların yeraltı hissəsinin uzunluğu yerüstü hissədən artıq olur (Şəkil 5).

Tədqiqatdan məlum olmuşdur ki, Abşeron şəraitində cücərtilərin inkişafı sentyabrın III ongünlüyünədək davam edir.



**Şəkil 4.** *L. tulipifera-nın* kök sistemi

Açıq şəraitində *L. tulipifera* üçün toxumların cücərmə dövrünün nisbətən uzun müddətli olması xarakterdir. Torpaq və iqlim şəraitindən asılı olaraq çiçəkləmə və meyvəvermə mərhələsinin uzun müddətli davam etməsi toxumların müxtəlif vaxtlarda yetişməsinə səbəb olur ki, bunun da nəticəsində açıq şəraitdə səpilmiş toxumlar özləri üçün uzun müddətli dinclik dövrü qazanmış olur

*L. tulipifera* toxmacarının hipokotili al-qırmızı rənglidir. Ləpəyarpaqları parlaq yaşıl, qısa saplaqlarda, oval formalı, uzunluğu 1,3-1,6 sm və eni 0,5-0,8 sm, ucu bizdir. Lələkvari damarcıqlıdır, damarcıqları nazik olmaqla hər tərəfdən yaxşı görünür. Rüşeym tumurcuğu yalançı zoğlarla al qırmızı-yaşıl rənglidir.

Birinci həqiqi yarpağın kənarları oval-yumru, ucu zəif oyuqludur. Sonrakı 3-4 yarpağı iki pərli, digər 5-6 yarpağı dörd pərli, bünövrəsi yumru və ya zəif-ürəkvari, göyümtül-yaşıl rəngli, mum çöküntülüdür. Aparılan tədqiqatdan məlum olmuşdur ki, *L. tulipifera* L. növünün Abşeron şəraitində toxumla çoxaldılması məqsədyönlüdür, park, bağ-salmada müxtəlif kompozisiyaların tərtibatı üçün yararlıdır və soliter bitki kimi qrup əkinlərində effektlidir.




**Şəkil 5**. Ontogenez prosesində *L. tulipifera* cücərtilərinin morfoloji dəyişməsi: I-VI – fenofazalar

## NƏTİCƏ

Tədqiqat işində *Magnoliaceae* Juss. fəsilə-sinin *Liriodendron* L. cinsinə aid *L. tulipifera* L. növünün Abşeron şəraitində toxumla çoxaldılması öyrənilmiş və məlum olmuşdur ki, toxumların stratifikasiyası dinclik dövrünün qısaldılmasında və toxumların cücərməsində əsas amildir. Stratifikasiya olunmuş toxumlar yazda 1,5-2,0 sm dərinlikdə səpildikdə 6,0-8,0% cücərti verir. Vegetasiyanın sonunda birillik *L. tulipifera* tinginin orta hündürlüyü 22-28 sm olur və üzərində 7-15 ədəd yarpaq formalaşır. Abşeron şəraitində cücərtilərin inkişafı sentyabrın III ongünlüyünədək davam edir.

## ƏDƏBİYYAT

**Васильев В.Ф., Пегова А.А., Пупкова В.И.** (1933) Скумпия и сумах как дубильные растения. *Тр. по прикл. бот., ген. и селек.,* **сер. X (№I):** 69-98.

**Владимировна С.Н.** (2015) Особенности семенного размножения *Lliriodendron tulipifera* L.в условиях интродукции в правобережной лесостепи Украины. *Ж. Hortus Botanicus*, **№10:** 208.

**Культиас М.Б.** (1953) Экологический метод интродукций растений. *Бюл. Глав. Бот. сада,* **вып. 15:** 25-28.

**Нестерович Н.Д.** (1955) Плодоношение интродуцированных древесных растений и перспективы разведения их в Белорусской ССР. Минск: АН БССР, 384 с.

**Серебряков И.Г.** (1962) Экологическая морфология растений. М.: Высшая школа, 378 с.

### Размножение Вида L*iriodendron tulipifera* L. В Условиях Апшерона

**Т.С. Мамедов, Р.С. Шихалиева, В.М. Новрузов**

*Институт дендрологии НАН Азербайджана*

В исследовательской работе изучено размножение семенами в условиях Апшерона вида *Liriodendron tulipifera* L., относящегося к роду *Liriodendron* L., из семейства *Magnoliaceae* Juss. (J. St. Hil.). Выявлено, что стратификация уменьшает скорость прохождения семенами периода покоя, что при всхожести семян является основным фактором. Весной, в условиях открытого и закрытого грунта, при оптимальной глубине посева стратифицированных семян, равной 1,5-2,0 см, всхожесть семян составляет 6-8%. В среднем высота однолетних растений достигает 22-48 см, а число сформировавшихся на них листьев составляет 7-15. В условиях Апшерона на открытом участке у вида *L.tulipifera* рост продолжается и в III декаде сентября. Таким образом, вид *L. tulipifera* L. можно рекомендовать для использования в озеленении в условиях Апшерона.

***Ключевые слова:*** *Liriodendron tulipifera* L.*, размножение, семена, интродукция, проросток, стратификация*

### Propagation Of *Liriodendron tulipifera* L. *S*pecies Under Absheron Conditions

**T.S. Mammadov, Sh.P. Shikhaliyeva, V.M. Novruzov**

*Institute of Dendrology, Azerbaijan National Academy of Sciences*

Propagation of the species of *Liriodendron tulipifera* L. belonging to the genus *Liriodendron* L. from the family of *Magnoliaceae* Juss. (J. St. Hil.) by seeds was studied under the conditions of Absheron and stratification was revealed to decrease during the rest period of the seeds and it was a main factor for the germination of seeds. Seed germination was 6.0-8.0% at the optimal depth of 1.5-2.0 cm in open and closed ground in spring. The average height of annual plants was 22-48 cm and 7-15 leaves were formed on them. In Absheron, in the open area the growth of the species *L.tulipifera* continues in the third decade of September. So, the *L. tulipifera* L. species can be recommended for use in landscaping under Absheron conditions.

***Keywords:*** *Liriodendron tulipifera* L.*, propogation, seeds, introduction, seedling, stratification*

# *Haloragaceae* R.Br. - Filgiləkimilər Naxçıvan Muxtar Respublikası Florası Üçün Yeni Taksondur

**Ə.Ş. İbrahimov*, F.X. Nəbiyeva, A.M. İbrahimova**

*AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutu, Babək küç., 10, Naxçıvan AZ 7000, Azərbaycan;*
** E-mail: aliyaribragimov@mail.ru*

**Məqalədə Naxçıvan Muxtar Respublikasının su-bataqlıq bitkiliyinin floristik və geobotaniki tədqiqi zamanı Babək rayonunun Araz, Uzunoba, Vayxır su anbarlarının və sızma nəticəsində ətrafda yaranmış bataqlıq sahələrinin florası və bitkiliyi haqqında məlumat verilir. Tədqiqat nəticəsində regionun florası üçün yeni olan *Haloragaceae* R. Br. fəsiləsi, *Myriophyllum* L. cinsi və *Myriophyllum spicatum* L. növü aşkar olunmuşdur.**

***Açar sözlər:*** *Flora, bitkilik, fəsilə, cins, yeni növ, Myriophyllum, bataqlıq, su-bataqlıq*

## GİRİŞ

Naxçıvan Muxtar Respublikası özünəməxsus torpaq-iqlim xüsusiyyətlərinə, zəngin floraya və bitki örtüyünə malik tipik dağlıq ölkədir. Muxtar respublikanın müasir florası 175 fəsilə, 906 cins və 3019 növlə təmsil olunur (Talıbov və İbrahimov, 2008). Bu miqdar Azərbaycan florasının 60,42%-ni təşkil edir. Ərazinin su-bataqlıq ekosistemində 42 (23,86%) fəsiləyə mənsub olan 134 (14,76%) cins və 337 (11,16%) növün olduğu müəyyən edilmiş-dir. Yaşayış mühitinə görə onlar Hidatofitlər, Sçiofitlər, Hidrofitlər və Hiqrofitlər olmaqla 4 ekoloji qrupa bölünür. Regionun su-bataqlıq bitkiliyi üçün əvvəlki illərin tədqiqatlarında bir sıra yeni taksonlar: *Sium sisaroideum* DC., *Ruppia maritima* L., *Zannichellia palustris* L., *Typha latifolia* L., *T. angustifolia* L., *Potamogeton natans* L., *P. nodo-sus* Poir., *P. Perfoliatus* L., *P. crispus* L., *Adiantum capillus-veneris* L. və digərləri aşkar edilmişdir (İbrahimov, 1993; Ибрагимов, 2005; Ибрагимов и др., 2015; Ибрагимов и Амиров, 1989). Hər dəfə ekspedisiyalarda, çöl tədqiqatlarında yeni tapıntıların aşkar olunması regionun flora zənginliyindən xəbər verir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatın obyektini Naxçıvan MR-in ərazisində yayılmış su-bataqlıq sahələri təşkil edir. Tədqiqat məqsədilə 2012-2016-cı illərin yaz, yay və payız fəsillərində 7 rayonun ərazisində 242 marşrut üzrə ekspedisiyalar keçirilmiş, çox sayda elmi məlumatlar və herbari materialı toplanmışdır. Toplanılmış herbarilər laboratotiya şəraitində kameral işlənmiş, təyin edilmiş, AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutunun və Naxçıvan Dövlət Universitetinin "Herbari fondu"na daxil edilmişdir.

Tədqiqat zamanı floristik, sistematik, ekoloji, areoloji, fitosenoloji, bitki ehtiyatları və statistik metodlardan, Herbari materiallarının işlənilməsində "Флора Азербайджана" (1956), A.A.Qrossheymin "Определитель растений Кавказа" (1949), "Флора Кавказа" və digər təyinedicilərdən, internet saytlarından https://en.wikipedia.org/wiki/APG_III_system istifadə olunmuşdur. Taksonların, onların müəlliflərinin adı, nomenklatur dəyişikliklər və əlavələr S.K.Çerepanova (1995) görə verilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Naxçıvan MR Ərazisində su-bataqlıq bitkiliyinin zənginliyi, burada *Haloragaceae* R.Br. – Fil-giləkimilər fəsiləsinin aşkar olunması ilə bir daha sübut olundu. Babək rayonu ərazisində 04.06.2016-cı il tarixlərdə su-bataqlıq bitkilərinin öyrənilməsi məqsədi ilə Araz su dəryaçası, Sirab su anbarı, Uzunoba su anbarı, Vayxır su anbarı və onların ətrafında sızma nəticəsində yaranmış bataqlıq sahələrdə floristik, geobotaniki və bitki ehtiyatları üzrə tədqiqatlar aparılıb. Həmin tarixlərdə Babək rayonunun Uzunoba su anbarına yaxın bataqlıqlarda fenoloji müşahidələr aparılmış və eksperimental işlər yerinə yetirilmişdir. Perspektiv su-bataqlıq və sahil bitkiləri toplanılaraq növ tərkibi, yaş çəkiləri müəyyən edilmişdir. Buradakı ekoloji şərait, baş verən dəyişikliklər, su-bataqlıq bitkilərinin taksonomik vəziyyəti, senozəmələgətirici növlərin tərkibi və quruluşu əvvəlki illərin tədqiqat nəticələri ilə müqayisəli təhlil edilmişdir. Məlum oldu ki, Uzun-oba su anbarının aşağı hissəsində əvvəllər mövcud olan kiçik bataqlıq hazırda bir neçə dəfə böyüyərək geniş sahəni əhatə edir. Bataqlıqda muxtar respublika ərazisində nadir tapılan *Butomus umbellatus* L. - Çətirli suoxu və ətrafındakı su bitkiləri qeyd olundu. Bataqlıqda, sahildən 0,1-1,5 metr aralı sudan topla-

nılan bitkilər içərisində çətirli suoxu, sünbülvari saçaqotu, gövdəni qucaqlayan sugülü, su incilosu və b. olduğu müəyyən edildi. Qeyd etmək lazımdır ki, bataqlığın ətrafında və sahildən suya doğru bir neçə metir məsafədə qamış cəngəlliyinin formasiyası və müxtəlif qruplaşmaları diqqəti cəlb edir. Həmçinin, *Phragmites altissima* (Benth.) Na-bille - Hündür qamış (2,8-3,50 m) keçilməz cəngəllik əmələ gətirmişdir. *Phragmites australis* (Cav.) Trin. ex Steud. - Cənub qamışı (1,5-2,0 m) bir qədər kənarlarda inkişaf edərək, digər su-bataqlıq bitkiləri ilə qarışıq senozlar yaradırlar. Yeni aşkar olunan sünbüllü saçaqotunun - *Myriophyllum spicatum* L. axtarışını Uzunoba su anbarında davam etdirdik. Su anbarının sututumu 9 min kub metrdir, suyu az şorlu və parlaq mavidir. Su anbarının cənub-qərb hissəsində *Tamarix* L. - Yulğun cinsinin *T. hohenackeri* Bunge - Hohenaker y., *T. kotschyi* Koçi y., *T. meieri* Boiss. - Meyer y. növləri ətra-fında sahil boyunca həqiqi su, bataqlıq və sahil bit-kiləri yayılmışdır. Sahildən 1,5-6 (10) m aralı *Myri-ophyllum spicatum* L. - Sünbüllü saçaqotunun daha bol yayıldığı məlum oldu. Digər su mənbələrində və bataqlıqlarda hələlik bu bitkinin axtarışı müsbət nəticə verməmişdir.

*Haloragaceae* R.Br. - Filgiləkimilər fəsiləsinə mənsub olan növlərin ümumi diaqnostik əlamətlərinə xırda, birləpəli, birevli və ya ikievli olmaları aid edilir. Onlarda kasacıq 4-bölümlüdür. Ləçəkləri sayca 4-dür, erkən töküləndir, erkəkcikləri 6-8 ədəddir. Aşağı yumurtalıqlı və 4 yuvalıdır. Dişicik 4-dür. Meyvə 4 çəyirdəyə ayrılır. Çoxillik su bitkiləri olub, yarpaqları daraqvari dərin lələkli-bölümlüdür (Şəkil 1).



**Şəkil 1.** Sünbüllü saçaqotu – *Myriophiyllum spicatum* L

*Haloragaceae* R.Br. fəsiləsinə bütün dünyada yayılmış 7 cins və 1000-ə qədər növ daxildir (Флора Азербайджана, 1956). Bu fəsilənin 36 növü Yer kürəsinin sularında və xüsusi olaraq, çoxsayda Avstraliyada yayılmışdır. Qafqazda və Azərbaycanda *Myriophyllum* L.- Saçaqotu cinsinin 2 növü: *M. verticillatum* L. - Qırçınlı saçaqotu və *M. spicatum* L. - Sünbüllü saçaqotu vardır. Bu növlərin heç biri Naxçıvan MR florası üçün göstərilmir (Флора Азербайджана, 1956, səh. 352-353; Флора Кавказа, 1962, s. 252; Фаталиев, 1988; Talıbov, İbrahimov 2008). *Myriophyllum* L. - Saçaqotu cinsinin Naxçıvan MR ərazisində tapılan növü Sünbüllü saçaqotudur. Yeni taksonların ərazidə hələlik ekoloji şəraiti, yaşayış məskəni fərqli olan iki ekotopdan – bataqlıqdan və şirin su hövzəsindən ibarətdir (Şəkil 2).




**Şəkil 2.** *Myriophyllum spicatum* L. növünün yayıldığı sahələr

*Myriophillum* L. - Saçaqotu cinsinin nümayəndələrində çiçəklər bircinslidir, birevlidir, çiçəklər yuxarı sünbüldə toplanmışlar, çiçəkləmə dövründə su səthinə çıxırlar, yuxarı çiçəkləri - erkəkcik çiçəkləri, aşağıdakılar dişicik çiçəklərdir. Kasacıq 4-bölümlü və ya 4-dilimlidir. Tacı erkən tökülən 4 sərbəst ləçəkdən ibarətdir. Erkəkcikləri 6-8 ədəddir. Aşağı yumurtalıqlıdır, 4-yuvalıdır. Ağızcıq 4-dür. Meyvə qurudur, 4 quru çəyirdəyə ayrılır. Həqiqi su bitkiləridir. Yarpaqları dəstəlidir, dərin daraqvari lələkli-bölümlüdür.

Sünbüllü saçaqotu sürünən gövdəli çoxillik bitkidir. Gövdəsi uzundur. 30-150 sm uzunluqdadır. Budaqlıdır, düzdür, boruludur, açıqyaşıldır, yuxarı hissəsi sıx yarpaqlıdır, Yarpaqları 4-üzvlü dəstəlidir, 1-2,5 sm uzunluqdadır, qarşı-qarşıya düzülmüş tükşəkilli lələkli dilimlidir. Çiçəkqrupu sünbülvaridir, 8 sm-ə qədər uzunluqdadır, çiçəkləri xırdadır, çox saylıdır, dəstəlidir. Yuxarı çiçəkləri erkəkcikli, aşağıdakılar dişiciklidir. Çiçəkləri 3 çiçəkyanlıq-lıdır. Yuxarı çiçəkyanlıqları bütövdür, dairəvi-yumurtaşəkillidir, çiçəklərdən qısadır, aşağı çiçəkyanlıqları isə dişicikli və ya mişarvari bölünmüşdür, çiçəklərə bərabər və ya onlardan uzundur. Tacı sol-

ğun çəhrayıdır, kasacıqdan 2 dəfə uzundur. Erkəkciklərinin sayı 8-dir. Yumurtalıq 4-yuvalıdır. Meyvəsi 4 çəyirdəkdən ibarətdir 2 mm uzunluqda, 1,5 mm enindədir. Uzunsovdur, bel hissədə şişkin təpəciklidir. İyun-iyul aylarında çiçəkləyir, avqust-sentyabr aylarında meyvə əmələ gətirir.

Azərbaycanda Kür-Araz ovalığında, orta dağ qurşağına qədər, göllərdə, bataqlıqlarda yayılmışdır. Qafqazda (Önqafqaz, Cənubi Qafqazın qərb, şərq və cənub hissələri), Avropanın, Qərbi Sibirin, Şərqi Sibirin, demək olar ki, hər yerində, Uzaq şərqdə (Kamçatka, Ussiriya, Saxalin); Orta Asiyada (Apalo - Kaspika, Pribalxas, Qızıl-Qum, Türkmənistan dağlıq, Pamir-Altay, Tyan-Şan), həmçinin Skandinaviyada, Avropanın Orta hissəsində, Balkan-Maloaziyada, İranda, Monqolustanda, Çində, Şimali Amerikada, Şimali Afrikada yayılmışdır. Elzasdan təsvir edilib.

Sünbüllü saçaqotunun aşkar olunduğu su mənbələrində həqiqi su bitkiləri, bataqlıq və sahil bitkiləri sıx cəngəlliklər əmələ gətirir, həmçinin suda yaşayan digər canlılarla biosenozlar yaradırlar. Saçaqotu ilə birlikdə yayılmış su bataqlıq növləri və sahil bitkilərindən burada *Butomus umbellaus* L.. *Alisma plantago- aquatica* L., *Eleocharis palustris* Schult., *Phragmites australis* (Cav.) Trin. ex Steud., *Ph. altissima* (Benth.) Nabille, *Typha latifolia* L., *T. angustifolia* L., *Potamogeton perfoliatus* L., *P. natans* L., *P. nodosus* Poir., *Lemna trisulca* L., *L. minor* L., *L. gibba* L., *Persicaria amphibia* S.F. Gray, *Rumex pulcher* L., *Ranunculus poliphillus* Willd*., Rorippa amphibia* (L.) Bess., *Mentha aquatica* L., *Bidens tripartita* L. və başqalarına tez-tez rast gəlinir. Onlar M.A.Raspopovun (1985, s. 29) su-bataqlıq bitkiləri üçün verdiyi müəyyən ekoloji qruplara: Hidatofitlər, Heliofitlər, Pleystofitlər və Hiqrofitlərə daxildirlər. Ərazi florası üçün yeni tapıntı olan Sünbülli saçaqotu – *Myriophyllum spicatum* L. Hidatofitlər ekoloji qrupuna aiddir. Bu növün aşkar olunmması nəticəsində ərazinin su-bataqlıq bitkiliyində aşağıdakı 8 assosiasiya yeni müəyyən edilmişdir:

–*Myriophylletum spicati aqui-herbosum;*
–*Myriophylletum spicati natantis potamogetonosum;*
–*Myriophylletum spicati nodosus potamogetonosum;*
–*Myriophylletum spicati batrichiosum;*
–*Myriophylletum spicati butomosum;*
–*Myriophylletum spicati perfoliati*
–*potamogetonosum;*
–*Myriophylletum spicati altısımı phragmitosum;*
–*Myriophylletum spicati charosum.*

Bundan əvvəlki çöl tədqiqatlarında Ə.Ş.İbrahimov və əməkdaşları tərəfindən Kərəvüzkimilər - *Apiaceae* Lindl. fəsiləsinin *Sium* L. cinsi və ona mənsub olan adi suçətirciyi - *Sium sisaroideum* L. növü aşkar edilmişdir (Ибрагимов и др., 2015). Yeni taksonlar 18.05.2016-cı il tarixdə Naxçıvan şəhərinin cənub-şərqində "Qızlar Bulağı" adı ilə məşhur olan tarixi abidə ətrafından, 19.05.2016-cı il tarixdə isə Babək rayonunun Qaraxanbəyli kəndi və Adilağa gölü ətrafında tapılmışdır.

Beləliklə, 04.06.2016-cı il tarixdə Babək rayonunun, Uzunoba su anbarında və intensiv sızma nəticəsində yaranmış ətraf bataqlıqlıqlarda Naxçıvan MR florası üçün ilk dəfə yeni yayılma arealı olan *Haloragaceae* R.Br. fəsiləsi, *Myriophyllum* L. cinsi və *Myriophyllum spicatum* L. növü aşkar olunmuşdur.

Yeni tapıntıların: 1 fəsilənin - *Halorogaceaea* R.Br., 2 cinsin: *Myriophyllim* L., *Sium* L. (*Apiaceae* Lindl.), 2 növün: *Myriophyllum spicatum* L. və *Sium sisaroideum* L. ərazi florasına əlavə olunması ilə əlaqədar fəsilə, cins və növlərin sayı 176, 906, 3019 yox, müvafiq olaraq: 176, 908, 3021 olmuşdur. Bununla Naxçıvan MR-in su-bataqlıq ekosistemində yeni tapıntılarla birlikdə 42 (23,86%) fəsiləyə mənsub olan 134 (16,75%) cins və 337 (11,16%) növün olduğu müəyyən edilmişdir.

Yeni tapıntıların herbari nüsxələri AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutunun "Herbari fondu"da saxlanılır.

## ƏDƏBİYYAT


**İbrahimov Ə.Ş.** (1993) Naxçıvan MR-in suçiçəyi (*Potamogeton*) növləri. *Azərbaycan EA-nın xəbərləri, biol. elmləri seriyası,* **1-3:** 173-175

**Talıbov T.H., İbrahimov Ə.Ş.** (2008) Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri. Naxçıvan: Əcəmi, 350 s.

**Гроссгейм А.А.** (1949) Определитель растений Кавказа. Москва: Советская наука, 240 с.

**Гроссгейм А.А.** (1962) Флора Кавказа. Том 6. М.-Л.: Академии Наук СССР. **6:** 252

**Ибрагимов А.Ш., Амиров Г.А., Нуриев В.Г.** (1989) О новых флористических находках в Нахчыванской АССР. *Докл. АН Азерб.ССР*, **45:** 54-56.

**Ибрагимов А.Ш. (**2005) Растительность Нахчыванской Автономной Республики и ее народнохозяйственное значение. Баку: Элм, 230 с.

**Ибрагимова А.М., Ибрагимов А.Ш.** (2013) Водная растительность Нахчыванской Автономной Республики. XVI Межд. научно-практ. конф., *«Современные проблемы гуманитарных и естественных наук»*, Россия, Москва, с. 23-28

**Ибрагимова А.М., Набиева Ф.Х., Ибрагимов А.Ш**. (2015) Новые таксоны для флоры Нахчыванской Автономной Республики Азербайджана. *Austrian Journal of Technical and Natural Sciences* (Австрия), p.1-7.

**Распопов И.М.** (1985) Высшая водная растительность больших озер Северо- Запада СССР. Ленинград: Наука, 199 с.

**Фаталиев Р.А.** (1988) Водные цветковые растения из Нахичеванской АССР. *Деп. ВИНИТИ,* **№ 1301-82:** 5 с.

**Флора Азербайджана.** (1956) Баку: АН Азерб. ССР, **Т. 6:** 540 с.

**Черепанов С.К.** (1995) Сосудистые растения России и сопредельных государств (в пределах бывшего СССР). Санкт-Петербург: Мир и семья -95, 991с.

**https://en.wikipedia.org/wiki/APG_III_system**

## *Haloragaceae* R. Br. - Новый Таксон Для Флоры Нахчыванской Автономной Республики

**А.Ш. Ибрагимов, Ф.Х. Набиева, А.М. Ибрагимова**

*Институт биоресурсов Нахчыванского отделения НАН Азербайджана*

В статье приведены данные флористических и геоботанических исследований водно-болотной растительности водохранилищ Араз, Узуноба, Вайхыр и расположенных вокруг них болот Бабекского района Нахичеванской АР Азербайджана. В результате исследований найден не описаный ранее для данного региона новый вид *Myriophyllum spicatum* L., относящийся к роду *Myriophyllum* L. и семейству *Haloragaceae* Lindl.

***Ключевые слова:*** *Флора, семейства, род, вид, Myriophyllum, болотный, водно-болотный*

## *Haloragaceae* R. Br. - New Taxon For The Flora Of The Nakhchivan Autonomous Republic

**A.Sh. Ibrahimov, F.Kh. Nabiyeva, A.M. Ibrahimova**

*Institute of Bioresources, Nakhchivan Branch of Azerbaijan National Academy of Sciences*

The results of floristical and geo-botanical studies of water-marsh plants of Araz, Uzunoba, Vayhir water reservoirs and flora of the nearby marsh areas of the Babek region of the Nakhchivan Autonomous Republic of Azerbaijan have been presented in the article. For the first time, a new species *Myriophyllum spicatum* L. belonging to the *Myriophyllum* L. genus and the *Haloragaceae* Lindl family were identified.

***Keywords:*** *Flora, family, genus, new species, Myriophyllum, wetland vegetation*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 86-88 (2017)*

# Gürcüstan Meşələrinin Müasir Vəziyyəti Və Palma (*Palmae*) Ağacının Yaşıllıqların Salınmasında İstifadəsi

**O.H. Mirzəyev**

*AMEA Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan; E-mail:oktaymirzayev@yahoo.com*

**Məqalədə 2016-cı ilin avqust ayında Gürcüstana səfər zamanı geniş müşahidələr əsasında meşələrin müasir vəziyyəti, eləcə də Batumi şəhərinin yaşıllaşdırılmasında palma ağaclarından istifadə barədə geniş məlumat verilir.**

***Açar sözlər:*** *Meşə, palma, ağac, kol*

Ekologiyanın sağlam və təmiz olmasında bitkilərin, xüsusən ağac və kolların əvəz olunmaz əhəmiyyəti çox böyükdür. Bu baxımdan, meşələr analoqu olmayan yeganə varlıqdır. Meşələr düzənliklərdən başlayaraq yuxarı dağ qurşaqlarına qədər yayılmışdır. Yayıldığı zonadan asılı olaraq, burada bitkilər bir-birini həm şaquli, həm də üfüqi istiqamətlərdə əvəz edərək ekologiyanın qorunmasında mühüm rol oynayır.

Meşələr çayların suyunun artmasında və tənzimlənməsində, torpaqların epoziyasının qarşısının alınmasında, kənd təsərrüfat məhsuldarlığının yüksəlməsində və s. sahələrdə əvəz edilməzdir (Гроссгейм, 1946). Meşələr düzənlikdən başlayaraq aşağı dağ-meşə qurşağı, orta dağ-meşə qurşağı, yuxarı dağ-meşə qurşağı və subalp zonasını təşkil edir. Dəniz səviyyəsindən yüksəkliyə qalxdıqca bütün bitki örtüyü, xüsusən nəzərə daha çox çarpan ağac və kollar yayıldığı mühitə görə qanunauyğun olaraq həm şaquli, həm də üfüqi şəkildə bir-birini əvəzləyir, ya zənginləşir və yaxud zəifləyir (Сафаров, Олисаев, 1991).

Qafqazda rütubətin dərəcəsindən asılı olaraq ərazilər bir neçə regiona bölünür: rütubətli subtropik rayonlar - buraya Krasnadar ətrafı və Qaradəniz sahilləri, Qərbi Gürcüstan və Azərbaycanın Cənub-Şərq hissəsi daxildir; rütubətli rayonlara Qafqazın şimal və qərb hissələri daxildir; quru iqlimə malik olanlar isə Şərqi Gürcüstan, Qərbi Azərbaycan və Dağıstanı göstərmək olar (Сафаров, Олисаев, 1991).

Materiallar 2016-cı ilin avqust ayında toplanılmışdır. Şosse yolunun hər iki tərəfində yamaclardan başlayaraq yüksəkliyə qədər yayılmış bitkilərə, əsasən ağac və kollar tərəfimizdən monitorinq edilib. Eyni zamanda meşələri əmələ gətirən əsas ağac və kollar haqqında yerli sakinlərdən məlumatlar əldə edilmiş və fotoşəkillər çəkilmişdir. Ədəbiyyat məlumatları da nəzərə alınmışdır (Гроссгейм, 1946, 1948; Джапаридзе и Урушадзе, 1973; Махатадзе, 1983).

Gürcüstan Respublikası subtropik bitkilərlə (portağal, narıngi və s.) yanaşı, meşə bitkiləri ilə də çox zəngindir (Гулисашвили, 1983: Гулисашвили и др., 1975). Burada enli yarpaqlı və iynə yarpaqlı ağac və kollar yayılmışdır (Джапаридзе и Урушадзе, 1973; Махатадзе, 1983; Сафаров, Олисаев, 1991).

Burada iynə yarpaqlı meşələri küknarlı – ağ şamlı (*Picea* Diltz. – *Abies* Mill.) başqa meşələrdən tərkibinin çox sıxlığına, məhsuldarlığının yüksəkliyinə və doluluğuna görə fərqlənir (Джапаридзе, Урушадзе, 1973). Burada talalarda və açıq yerlərdə bərpa yaxşı gedir və ağacların orta doluluğu (0,5-0,6) normaldır. Şabalıd gürcü palıdı (*Quercus iberica*) ilə əvəz olunur, alçaq boylu subalp zonasındakı tozağaclar (*Betula pendula*, *Betula litwinowii*) kimi. Laqodex qoruğunun sərhəddindən meşələr dəniz səviyyəsinin 400-500 metr hündürlüyündən başlayaraq 2000-2500 metr yüksəkliyə kimi qalxır və Batumi meşələrinə qədər davam edir (Şəkil 1).

Bu ərazidə ağaclardan Şərq palıdı (*Quercus macranthera* Ficher.), gürcü palıdı (*Quercus iberica* Stev.), gürcü ağcaqayını (*Acer iberica* M.B.), Qafqaz vələsi (*Carpinus caucasica* A.Qrossh.), Şərq vələsi (*Carpinus orientalis* Mill.), Şabalıd (*Cactanea sativa* Mill.), ağ akasiya (*Robinia pseudacacia* L.), titrək qovaq (*Populus tremula* L.), ziyilli və ya sallaq tozağacı (*Betula pendula* Roth.), Litvinov tozağacı (*Betula litwinowii* A.Doluch.), göyrüş (*Fraxinus excelsior* L.), keçi söyüdü (*Salix caprea* L.), zoğal (*Cornus mas* L.), dəfnə ağacı (*Laurus nobilis* L.), Kox şamı (*Pinus kochiana* Klotzsch.), ağ şam (*Abies* Mill.), tikanlı küknar (*Picea pungens* Engelm.), Himalay sidri (*Cedrus deodara* Lawos.), qara cöhrə (*Taxus baccata* L.), ardıc (*Juniperus* L.), adi fındıq (*Corylus avellana* L.), meyer yemişanı (*Crataegus meyeri* A.Pojark.), əzgil (*Mespilus* L.), alça (*Prunus divaricata* Le-deg.), göyəm (*Prunus spinosa* L.), gavalı (*Prunus domestica* L.), armud (*Purus communis* L.), Gürcüstan armudu (*Pyrus georgica* Kuthath.), heyva (*Cydonia* Mill.), və s. göstərmək olar.



**Şəkil 1.** Gürcüstan meşələrindən görünüş

Marşurut müşahidələrin nəticəsində bir çox kol bitkilərinə də, məsələn, Gürcüstan böyürtkəni (*Rubus georgicus* Focke), gürcü itburnusu (*Rosa iberica* Stev.), gürcü zirinci (*Berberis iberica* Stev.), sofora (*Sophora viciifolia* Hancel.), adi rododendron (*Rhododendron ponticum* L.), Qafqaz rododendronuna (*Rhododendron caucasicum* Pall.) və s. rast gəlindi.

Palma (*Palmae*) ağacından Batumi şəhərində küçələrinin, parklarının, əyləncə mərkəzlərinin və s. sahələrinin yaşıllaşdırılmasında geniş istifadə edilir (Şəkil 2, 3). Baxmayaraq Gürcüstanda və Tbilisi, Batumi şəhərlərinin geniş sahəsi olan parklarının tərkibi enli yarpaqlı (palıd, vələs, ağcaqayın və s.) və iynə yarpaqlı (şam, küknar və s.) ağaclar təşkil edir, lakin Palma ağaclarından da dekorativ bəzək bitkisi kimi əksər yaşıllıqların salınmasında intensiv istifadə olunur.

Ədəbiyyat mənbələrindən məlum olduğu kimi dünyada Palmanın 220-ə qədər növü var, lakin Azərbaycan daxilində bu sahədə elmi-tədqiqat işləri lazımı səviyyədə hələlik aparılmadığı üçün tərəfimizdən verilən məlumat ilk addim hesab edilə bilər.

Yalnız T.Mehdiyevin dissertasiya işində qısa məlumat verilmişdir. Göstərilmişdir ki, palma ağacı Yaponiya və Çində becərilmiş və hündürlüyü 10-12 metr olmuşdur. Lakin Azərbaycan Respublikasının bölgələrində, o cümlədən Bakı ərazisində becərilən 30 yaşlı palma bitkisinin diametri 20 santimetr, hündürlüyü isə 2 metr 50 santimetr olub, münbit torpağa az tələbkardır (Мехтиев, 1967). Əfsus ki, digər məlumat yoxdur. Yaxşı olar ki, çox gözəl dekorativ bitki olan palma üzərində geniş tədqiqat işləri aparılsın.

Şəhərimizdə küçələrin və eləcə də şosse yolunun kənarlarında, yaraşıqlı parklarımızda olan palmalar alçaq formada olub, kol şəklindədir. Əslində isə palmalar ağac şəklindədir və çox hündür gövdəyə malikdirlər. Batumi şəhərinin küçələrinin yaşıllaşdırılmasında istifadə olmuş palma ağaclarının hal-hazırda hündürlüyü 15-20 metrdir. Ümumiyyətlə isə palma ağacları 25-30 metrə qədər qalxır.



**Şəkil 2.** Batuminin küçələrində Palma ağacları



**Şəkil 3.** Batumi parkında palma ağacı

Palma ağacı əsasən yarpaqlardan ibarət olub, heç bir yerində budaq olmur. Palma ağacının özünə məxsus xüsusiyyətlərindən biri də ağac böyüdükcə gövdəsində cilalanma - təmizlənmə prosesi gedir və gövdəsi hamar olur. Ağacın yalnız təpə - uc hissəsində bir neçə metr uzunluğu olan böyük yarpaqlar olur. Belə dekorativ yaraşıqlı palma ağacları küçələrin kənarlarında olan binalara xüsusi gözəllik verir.

Palma ağaclarının belə gözəlliyini nəzərə alan bir çox ölkələrin – Haiti, Quam, eləcə də Amerika əyalətlərinin Florida və Güney Karolinanın Dövlət bayraqlarında onun şəkli rəmz kimi istifadə olunur. O, əsasən Aralıq dənizinə xas olan iqlim və subtropik iqlimli bölgələrdə yaxşı bitir. Palma ağacı Asiya qitəsində, Çində, Afrika ərazisində, xüsusən Şimali Afrika ölkələrində - Misir, Mərakeş, Əlcəzair, Ərəbistan sahələrində, Məkkə - Mədinə şəhərlərinə gedən yolların kənarlarında və nisbətən Türkiyədə yayılmışdır. Bundan başqa Böyük Okean adaları olan Tahiti, Fici və Quamda becərilir.

Palmalar tropik, mülayim və səhra iqliminə malik yerlərdə yetişə bilir. Ana və yan saçaqlı kök sisteminə malikdir. Ağacın gövdəsi boz və qəhvəyi rəngdədir. Bir-birinə yaxın gövdəsindən və altından pöhrələr verə bilir. İstiliyi və günəş işığını sevən, soyuğa isə dözümsüzdür. Türkiyədə Aralıq dənizinin iqliminə xas olan yerlərdə yetişir. Qüvvətli gübrələrə

ehtiyacı olan bitkidir. Belə ki, azot, fosfor, kalium, dəmir kimi maddələr, həmçinin əlavə olaraq çox miqdarda maqnezium, sink və az miqdarda mis verilməsi məsləhətdir.

Başqa ölkələrdən nəzarətsiz gətirilən xəstəliyə tutulmuş xurma məhsulunun idxalı zamanı qırmızı palma bözəyi çox təhlükəli olub, xurma bitkisinin məhv olmasına səbəb olur. Müalicəsi olduqca çətin olan və güclü nəzarət tələb edən həmin bözək xurma bitkisi üçün çox təhlükəlidir. Nəzarətsiz və xəstə xurma bitkisinin idxal edilməsi nəticəsində təkcə xurma bitkiləri (*Phoneix dactyliferia*) deyil, bütün palma növləri həmin böcək tərəfindən məhv edilə bilər. Bunun üçün çox ehtiyatlı olmalı və vaxtında müalicə tədbirləri görülməlidir.

Palma ağacı son dərəcə qiymətli bitki olub, dekorativ kimi istifadə edilməsindən başqa, onun digər növlərindən, məsələn xurma bitkisinin (*Phoenix dactylifera*) məhsullarından çox istifadə olur. Onun lifləri olduqca çox və sıx olub, suya davamlı olduğuna görə ondan mebel işində, müxtəlif səbətlərin toxunmasında istifadə edilir. Onun məhsullarından yağ, nişasta alınır ki, bu da qida kimi istifadə olunur. Bundan başqa, cavan palma ağaclarının ortasından açılmış dəliklərdən axan mayedən işki, şərab sənayesində istifadə olunur "Palma şərabı" hazırlanır. Palma bitkisinin bəzi növlərinin toxumlarından alınan yağdan kosmetik sənayesində istifadə edilir. Bu baxımdan, palma ağacının Azərbaycanda geniş yayılması və onun tədqiqi məqsədəuyğundur.

## ƏDƏBİYYAT

**Гроссгейм А.А.** (1946) Растительные ресурсы Кавказа.

**Гроссгейм А.А.** (1948) Растительный покров Кавказа. М.: Московск. Об-ва испыт. природы.

**Гулисашвили В.З.** (1983) Леса и древесные породы субтропиков. Тбилиси.

**Гулисашвили В.З., Махатадзе Л.Б., Прилипко Л.И.** (1975) Растительность Кавказа. М.: Наука, 236 с.

**Джапаридзе Т.М., Урушадзе Т.Ф**. (1973) Особенности девственных ельников Грузии. Тбилиси.

**Махатадзе Л.Б.** (1983) Горные дубравы Грузии и пути повышения их продуктивности. *Сб. вопросы повышения продуктивности горные лесов. Тр. Ин-та горного лесоводства.* Тбилиси.

**Мехтиев Т.А.** (1967) Современное состояние и переспективы развития озеленение населенных пунктов Карабахской равнины Азербайджанской ССР.

**Сафаров И.С., Олисаев В.А.** (1991) Леса Кавказа. Владикавказ: ИР, 290 с.

### Современное Состояние Лесов Грузии и Использование Пальмовых Деревьев (*Palmae*) В Озеленении

**О.Г. Мирзоев**

*Институт ботаники НАН Азербайджана*

В статье дается подробное описание использования в озеленении г. Батуми пальмовых деревьев, а также современное состояние лесов Грузии.

***Ключевые слова:*** *Лес, пальма, деревья, кустарники*

### Current State Of The Georgian Forests And Use Of The Palm (*Palmae*) Trees For Plating Of Greenery

**O.H. Mirzoyev**

*Institute of Botany, Azerbaijan National Academy of Sciences*

A detailed description of the use of palm trees in greenery of Batumi city as well as a modern state of Georgia forests (August of 2016) have been presented in this article.

***Keywords:*** *Forest, palm, tree, shrubs*

# Yeni Bərk Buğda Sortu – "Korifey-88"

**X.N. Rüstəmov[1, 2*], Z.İ. Əkpərov[2], C.M. Təlai[1], M.Q. Əhmədov[1], A.M. Abdullayev[1, 2], M.Ə. Abbasov[2], M.A. Əhmədov[3], Q.M. Həsənova[1], S.K. Hacıyeva[1], E.R. İbrahimov[1]**

*[1]Əkinçilik Elmi-Tədqiqat İnstitutu, Pirşağı qəs., 2-ci sovxoz, Bakı AZ 1098, Azərbaycan*
*[2]AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq pr., 155, Bakı AZ 1106, Azərbaycan*
*[3]VİR Dağıstan filialı, Dərbənd r., Vavilovo k., Dağıstan*
**E-mail: xanbala.rustamov@yandex.com*

**Məqalə Əkinçilik Elmi-Tədqiqat İnstitutu Tərtər BTS-də çoxillik seleksiya işləri nəticəsində Milli Genbankda saxlanılan genofonddan istifadə etməklə yaradılmış yeni "Korifey-88" bərk buğda sortuna həsr olunmuşdur. Aqrometeoroloji göstəricilərə görə kəskin fərqlənən son 2014-2016-cı illərdə biotik və abiotik mühit amillərinə davamlı, yüksək məhsuldarlıq potensialına və dən keyfiyyətinə malik sortlarla yanaşı, yüksək adaptivlik potensialı olan sortların yaradılması göstərilmişdir. Yeni, adaptiv tipli "Korifey-88" bərk buğda sortunun biomorfoloji və aqronomik əlamət və xüsusiyyətləri bölgədə rayonlaşdırılmış standart sortlarla müqayisəli analiz edilmişdir. Müəyyən edilmişdir ki, "Korifey-88" sortunda sabit məhsuldarlıq və dənin keyfiyyət göstəriciləri sünbüldə dənlərin sayının çox olması və adaptivliklə bağlıdır. Yeni "Korifey-88" bərk buğda sortunun Azərbaycanın suvarılan düzən və nəmliklə təmin olunmuş dağətəyi bölgələrində becərilməsi tövsiyə olunmuşdur.**

***Açar sözlər:*** *Sort, bərk buğda, adaptivlik, məhsuldarlığın struktur elementləri, dən keyfiyyəti*

## GİRİŞ

Çörək və buğda dənindən alınan digər məmulatlar hər bir ölkənin iqtisadi təhlükəsizliyini təmin edən əsas strateji məhsullardan biridir. Bərk buğdalar əhalinin qida rasionunun əsasını təşkil etməklə Azərbaycanda ən qədim tarixi dövrlərdən, əsasən payızlıq əkinlərdə, düzən və dağətəyi bölgələrdə becərilmişdir. Əkinlər, adətən müxtəlif tetra- və heksaploid buğda növlərinin populyasiyasından ibarət olmuşdur (Rüstəmov, 2014).

Bərk buğda (*Triticum durum* Desf. 2n=28, $A^uA^uBB$) yumşaq buğdadan (*T.aestivum* L. 2n=42 $A^uA^uBBDD$) sonra ən geniş əkin sahəsinə malik tetraploid buğda növüdür. Bərk buğdanın mənşəyi hələ də tam dəqiqləşdirilməyib. K.A.Flyaqbesqer (1938) bərk buğdanın mədəni pərinclə (*Triticum dicoccum* (Schrank) Schuebl.) ümumi əcdaddan yaranması ideyasını irəli sürmüşdür. Onların ümumi əcdadının - yabanı Fələstin pərincinin (*T.dicoccoides* (Koern. ex Aschers. et Graebn.) Schweinf.) yabanı diploid təkdənli buğdanın (*T.urartu* Thum. ex Gan-dil.) əcdadı ilə speltoides buğdayıotunun (*Aegilops speltoides* Tausch.) spontan çarpazlaşaraq allopoliploidləşməsi nəticəsində yaranması fərz edilir. Təkamülün sonrakı gedişində, makromutasiyaların tədricən toplanması nəticəsində, pərinclərə xas olan sünbülün çətin döyülməsi, sünbülcük pulcuqlarının sərtliyi, sünbül oxunun sınması kimi əlamətlərinin itməsi baş vermişdir (Дорофеев и др., 1979, 1987).

Müəyyən tarixi dövr ərzində böyük aqrosenozlarda süni və kortəbii seçmənin birgə təsiri nəticəsində asan döyülən, sünbülcük və çiçək pulcuqları dəndən asan ayrılan, hətta dəndöymədən sonra sünbül oxu sınmayan tetraploid buğda növləri yaranmışdır.

N.İ.Vavilova görə (1987a, 1987б) *T.durum* Şimali Afrika və Aralıqdənizi sahillərində yaranmışdır. Abissiniyada (Həbəşistan) bərk buğdanın zəngin biomüxtəlifliyi yaranmış, sonra isə digər bölgələrə yayılmışdır.

Əksər tritikoloqlar mədəni buğdaların, o cümlədən bərk buğdanın mənşə mərkəzinin Ön Asiya olmasını təsdiq edirlər. Mədəni di-, tetra- və heksaploid buğdadların Məhsuldar Ayparada (Furthermore) yaranması, sonra isə Şimali Afrika, Ön Asiya və Aralıqdənizi hövzəsindən keçməklə digər ərazilərdə yayılması hipotezası hazırda üstünlük təşkil edir. Mədəni tetraploid buğdaların əcdadı hesab edilən pərincin arealının və becərilməsinin etnocoğrafiyasının analizi onun vətəninin "Məhsuldar aypara" olmasını bir daha sübut edir (Рустамов, 2016a, 2016б).

Bərk buğda, əsasən bioloji yazlıq və yarım-payızlıq formalarla təmsil olunmuşdur. Əsl payızlıq həyat tərzinə malik nümunələri N.İ.Vavilov Azərbaycan və Dağıstan ərazilərində tapmışdır (Дорофеев и др., 1979, 1987; Рустамов, 2016a). Hazırda bərk və payızlıq yumşaq buğdaları çarpazlaşdırmaqla yaradılmış əsl payızlıq bərk buğda sortları müxtəlif aqrosenozlarda becərilir.

Bərk buğda quru və isti iqlimə tələbkardır. Yumşaq buğdaya nisbətən şaxta, soyuq və quraqlığa davamlılığı aşağıdır. Buna baxmayaraq, göbələk xəstəliklərinə, xüsusən dəndolma fazasında atmosfer quraqlığına və terminal hərarətə yüksək davamlıdır.

Torpağın münbitliyinə yüksək tələbkardır. Bərk buğdaların dənində zülülların, əvəzedilməyən amin turşuları, nişasta, dekstrin, şəkər, B, E, PP vitaminlər qrupunun miqdarı yumşaq buğdalara nisbətən yüksəkdir (Дорофеев и др., 1979, 1987; Rüstəmov, 2014). Bu əlamətlərə görə bərk buğdalar abiotik və biotik amillərə davamlılıq və keyfiyyət göstəricilərinə cavab verən genlərin donoru kimi yumşaq buğdanın seleksiyasında geniş tətbiq olunmalıdır.

Bərk buğdalar xəstəlik və zərərvericilərlə nisbətən az sirayətlənir. Qonur və sarı pasa, unlu şehə, toz və bərk sürməyə, həmçinin hessen milçəyinə davamlılıqla seçilirlər. Unlu şehə (Mld, Pm3d), qonur (Lr23) və gövdə pasına (Sr12) davamlılıq genləri yumşaq buğda genofonduna, əsasən bərk buğdalardan keçirilmişdir (Дружин и др., 2011).

Müasir təsnifatda bərk buğda 2 növaltıya bölünmüşdür: *subsp.durum* (adi, əsl bərk buğdalar) və *subsp.horanicum* (Horan-Suriya, İordaniya, nadir hallarda Misir) (Дорофеев и др., 1979, 1987). Sonuncu növaltıya Azərbaycanda yaradılmış Şərq, Xoranka, Cəfəri və Mingəçevir sortları aiddir.

Bir çox müəlliflər (Мустафаев, 1973; Дорофеев и др., 1979, 1987; Алиев, 2006; Rüstəmov, 2014) göstərmişlər ki, hələ XX əsrin ortalarında Azərbaycanda bərk buğda əkinləri üstünlük təşkil etmişdir. Növdaxili polimorfizmə görə bölgə yalnız Aralıq dənizi hövzəsi ölkələrindən geri qalır. Kollektivləşdirmə və inzibati-amirlik idarəetmə sistemi, daha məhsuldar yumşaq buğda sortlarının yaradılması və tətbiqi nəticəsində bərk buğda sortları tədricən sıxışdırılmışdır.

Qeyd etmək lazımdır ki, yumşaq buğdaların məhsuldarlığı ilk baxışda yüksək olsa da, vahid sahədən alınan məhsulun maya dəyərinə nəzər saldıqda, təkcə toxumun və tarlanın pestisidlərlə dərmanlanmasına çəkilən xərclərin rentabelliyi aşağı salmasını görərik. Belə ki, bərk buğda sortları sürmə, pas və digər göbələk xəstəlikləri ilə nisbətən az sirayətlənir. Bundan başqa, aran bölgələrində süd və mum yetişmə fazaları, adətən yüksək hərarət və hava quraqlığı ilə müşayiət olunur. Belə şəraitlərdə bitkilər vaxtından əvvəl quruyur - attraksiya pozulur, məhsuldarlıq, xüsusən dənin keyfiyyəti aşağı düşür. Min illər ərzində təbii və süni seçmənin süzgəcindən keçməklə yerli şəraitə uyğunlaşmış bərk buğdalar yüksək temperatur və hava quraqlığına nisbətən davamlı olduğundan az zərər çəkirlər (Rüstəmov, 2014).

Sübut edilmişdir ki, məhsuldarlıq və dənin keyfiyyətinin seleksiyasında – hibridləşdirmədə valideyin cütlərinin seçimində ana bitki kimi yerli şəraitə yaxşı uyğunlaşmış, ata bitki kimi isə ekoloji-coğrafi cəhətdən uzaq, çatışmayan qiymətli əlamət və xüsusiyyətlərə malik genotiplərdən istifadə edilməlidir. Bitkilərin ontogenetik adaptasiyasının xarakterinə sitoplazmatik determinantlar–hüceyrənin nüvədən kənar irsi elementləri (plazmon) böyük təsir göstərir. Sitoplazmanın genetik sistemləri çiçəkli bitkilərdə vacib adaptiv əlamətlərin irsən nəsildən-nəslə keçməsinə nəzarət etməklə genotipik dəyişkənliyin potensial imkanlarını təmin edir. Nüvə və sitoplazmatik determinantlar hüceyrənin komplementar genetik sistemi olmaqla bir-biri və yaşayış mühiti ilə sıx qarşılıqlı təsirə malikdirlər (Скрипка, 2005; Рустамов, 2016a).

Bərk buğdaların növdaxili polimorfizminin zənginləşdirilməsinin - genetik heterogenliyinin yaradılmasının, yeni gen blokları və çatışmayan qiymətli əlamət və xüsusiyyətlərin vahid orqanizmdə toplanılması elmi seleksiyanın qarşısında duran əsas vəzifələrdəndir. Yeni başlanğıc seleksiya materiallarının yaradılmasının əsas yollarından biri ekoloji-coğrafi uzaq valideynləri hibridləşdirməklə konkret torpaq-iqlim şəraitləri üçün yeni, sabit məhsuldarlığa və yüksək dən keyfiyyətinə görə yumşaq buğdalarla rəqabətə qabil, adaptiv sortların yaradılması və yayımıdır.

Yuxarıda qeyd olunanları nəzərə alaraq Düzən Qarabağın (ƏETİ Tərtər BTS) suvarma şəraitində yeni bərk buğda sortlarının seleksiyası üzrə elmi-tədqiqat işlərinin nəticələri analiz edilmişdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat materialı kimi son illərdə yerli və Beynəlxalq pitomniklərlə yanaşı, ÜRBİ (VİR) Dağıstan filialında M.A.Axmedov tərəfindən yabanı və mədəni tetraploid buğdaların, o cümlədən bərk buğdaların növdaxili və növlərarası hibridləşdirməsi və seçmə nəticəsində yaradılmış $F_5$ hibridlərdən istifadə edilmişdir (Рустамов и др., 2013). Təcrübələrin qoyulması, fenoloji müşahidələrin aparılması, xəstəliklərə davamlılığın, məhsuldarlıq və struktur elementlərinin qiymətləndirilməsi müvafiq metodiki göstərişlərə əsasən aparılmışdır (Musayev və b., 2008; Дувеиллер и др., 2014).

Son dövrlərdə (2014-2016), qlobal iqlim dəyişkənliyi fonunda bölgədə aqrometeoroloji şərait orta çoxillik göstəricilərdən kəskin fərqli olmuşdur. Müxtəlif illərdə mühit şəraitinin analizi göstərmişdir ki, 2014-cü ilin qış aylarlnda uzun müddətli sərt şaxtalar müşahidə edilmiş, yaz-yay aylarında yağıntıların miqdarı orta çoxillikdən aşağı olmuşdur. Bundan başqa, 2014-ci, xüsusən 2015-ci illərdə, may ayının sonlarından başlayaraq kəskin və uzun-müddətli terminal hərarətlə müşayət olunan hava quraqlığı müşahidə edilmişdir. 2015-ci illərdə yaz aylarında, 2016-cı ildə isə, həmçinin yayın əvvəlində - dəndolma dövründə yağıntıların miqdarı nisbətən yüksək olmuşdur (Əhmədov və b., 2015; Rüstəmov və b., 2016). 2014-cü ildə iqlim göstəricilə-rinin orta çoxillik normadan kəskin dəyişilməsi – qış

fəslinin uzunmüddətli və sərt keçməsi, yazda nisbətən aşağı temperatur və yaz-yay dövründə uzunmüddətli hava quraqlığı nəticəsində xəstəlik törədicilərinin inkişafı müşahidə olunmamışdır. Bundan başqa, yetişmə dövründə yüksək hərarət nəticəsində buğdalarda mum yetişmə fazasının qısalması müşahidə edilsə də nisbətən yüksək məhsuldarlığa malik sortnümunələri seçilmişdir. 2015-ci və sonuncu, 2016-cı ildə qış fəslinin mülayim keçməsi, yazın uzunmüddətli, temperaturun aşağı və yağıntıların miqdarının nisbətən çox olması səbəbindən – yüksək rütubətlilik nəticəsində göbələk xəstəliklərinin, xüsusən də sarı pasın epifitotiyası müşahidə olunmuşdur. Bundan başqa, iqlim göstəriciləri fenoloji fazaların müddəti, boy və struktur elementlərini dəyişməklə məhsuldarlıq və keyfiyyət göstəricilərinə təsir göstərmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Bərk buğda və digər tetraploid növlər ən qədim dövrlərdən Azərbaycanın düzən və dağətəyi bölgələrində, əsasən payızlıq əkinlərdə becərilmiş, əkin sahəsinə görə birinci yeri tutmuşdur – payızlıq dənli bitki əkinlərinin 75 %-ni təşkil etmişdir. Əkinlərdə əsasən *v.apulicum*, *v.leucurum*, *v.hordei-forme* növmüxtəliflikləri yayılmışdır, az hallarda *v.melanopus*, *v.caerulescens, v.italicum* və s. bioloji qarışıq kimi rast gəlinmişdir. Respublikada böyük ərazilərdə Arandəni (*v.apulicum*), Şərq, Cəfəri, Ağ buğda 13, Yerli leukurum (*v. leucurum*), Sevinc (*v.hordeiforme*) və yerli Qara buğda (*v.caerules-cens*) sortları becərilmişdir (Мустафаев, 1973; Алиев, 2006).

Tetraploid buğdalara aid 49 $F_5$ hibridlərdən yüksək potensial məhsuldarlığa malik nümunələr seçilərək 2012-2014-cü illərdə Tərtər BTS-də, seleksiya və nəzarət pitomniklərində (SP, NP) tədqiq edilmişdir (Рустамов и др., 2013). Müsabiqəli sort sınağı (MSS) pitomnikinə keçirilmiş 2 nümunədən biri - *T.turgidum* buğda növünün iştirakı ilə alınmış hibriddə təkrar parçalanma nəticəsində qeyri-sabitlik müşahidə edilmişdir. Digər nümunənin sınağı 2014-2006-cı illərdə MSS və artırma pitomniklərində davam etdirilmişdir.

Məhsuldarlığın və dənin keyfiyyət göstəricilərinin analizi bəzi sortnümunələrin illərdən və mühit şəraitindən asılı olmayaraq nisbi sabit olması aşkar edilmişdir. Yerli və Beynəlxalq pitomniklərdən seçilmiş 6 nümunənin stansiyadaxili 2 illik sort sınağının analizi Korifey-88 sortunun nisbətən yüksək və sabit məhsuldarlığa və keyfiyyət göstəricilərinə malik olmasını göstərdi.

2016-cı ildə artırma pitomnikində rayonlaşmış və perspektiv yumşaq buğda sortları ilə yanaşı son illərdə kompleks göstəricilərə görə seçilmiş 3 bərk buğda sortnümunəsinin xəstəliklərə davamlılığı, vahid sahədən məhsuldarlığı və keyfiyyət göstəriciləri öyrənilmişdir. Artırma 5 (14$^{th}$IWWYT-IR 2010 /2011 TX95V 4339/TX94VT938-6) yumşaq buğda sortnümunəsi istisna olmaqla, öyrənilən bərk buğdaların vahid sahədən məhsuldarlığı nisbətən yüksək olmuşdur.

Bərk buğdaların yüksək məhsuldarlığı onların, yumşaq buğdalara nisbətən xəstəliklərə yüksək davamlılığı ilə bağlıdır. Eyni zamanda potensial məhsuldarığa görə yumşaq buğdalarla rəqabətə qabil bərk buğda sortlarının yaradılmasının real olmasını da qeyd etmək lazımdır.

Yuxarıda qeyd olunanları nəzərə alaraq son illərdə buğda-pərinc hibridlərindən sabit məhsuldarlığa və keyfiyyət göstəricilərinə görə seçilmiş yeni Korifey-88 bərk buğda sortu Dövlət sortsınağının aparılması üçün Kənd təsərrüfatı Nazirliyi Bitki Sortlarının Qeydiyyatı və Toxum Nəzarəti üzrə Dövlət Xidmətinə təqdim edilmişdir.

Yeni yarımpayızlıq bərk buğda sortu Korifey-88 Əkinçilik Elmi-Tədqiqat İnstitutunun Tərtər Bölgə Təcrübə Stansiyasında, Milli Genbankda saxlanılan, VİR Dağıstan filialında к-64409 *var. Leucurum* (Meksika) və к-23025 Susa or Vedeah *var. Falcatoleucomelan* (Malta) sortlarının çarpazlaşdırılmasından alınmış hibrid xəttindən təkrar fərdi seçmə yolu ilə yaradılmışdır.

Sort intensiv tipli, ortaboyludur (84,0-101,0 sm), samanı orta yoğunluqda və möhkəmlikdə, yatmaya yüksək davamlıdır. Kollanması orta (2,6-3,7 ədəd), yarımyerəsəriləndir – həyat tərzi yarım-payızlıq, ortayetişəndir. Cücərtiləri açıq yaşıl rəngdə, qısa tükcüklərlə örtülü olur. Bəzi morfobioloji əlamətlərinə görə cücərtiləri buğda-pərinc hibridlərinə oxşayır. Sonuncu – sünbülaltı buğumarasının içərisi, adətən dolu olur, *var. leucurum* növmüxtəlifliyinə aiddir. Sünbülü qılçıqlı, iyşəkilli, uzun (10,5-12,5 sm) və orta sıxdır - sünbül oxunun 10,0 sm-də (D-sünbülün sıxlığı) 22,6-23,3 ədəd sünbülcük yerləşir (Cədvəl 1). Sünbül əsasından, yaxud ortadan aypara şəklində əyilir - sünbülaltı buğum-arasının ucundan sünbül tam, yaxud yarım başıaşağı əyilmiş olur. Sünbülcük pulcuqları uzunsov-oval formada, ağ rənglidir. Damarlanması yaxşı ifadə olunmuşdur, çiyni zəif çəpdir, kil dişciyi orta uzun, düzdür. Qılçıqları sünbüldən 1,5-2,0 dəfə uzun, sünbülə paralel, yaxud azacıq dağınıq, ağ rənglidir. Döyülməsi asandır. Dəni orta irilikdə, oval, ağ rənglidir, şüşəvarilik 91-96%-dir.

Korifey-88 sortunun potensial məhsuldalığı orta yüksəkdir – 60-68 s/ha. MSS pitomnikində 3 illik orta məhsuldarlığı 54,8 s/ha, standart Qarabağ sortundan və orta göstəricidən 1,3-1,4 s/ha yüksək olmuşdur. Orta çoxillik məhsuldalığa görə, yalnız perspektiv Zəngəzur bərk buğda sortundan geri qalır.

**Cədvəl 1.** Bərk və yumşaq buğda sortlarının orta üçillik aqrobioloji göstəriciləri (Tərtər, 2014-2016)

| Sort | Boy, sm | Məhsuldar kollanma, ədəd | Sünbülün uzunluğu, sm | Sünbülcüklərin sayı, ədəd | Sünbüldə dənin | | Məhsuldarlıq, s/ha |
|---|---|---|---|---|---|---|---|
| | | | | | sayı, ədəd | kütləsi, q | |
| Qarabağ (St.) | 105,4±5,4 | 3,53±0,3 | 9,65±0,4 | 22,4±0,6 | 58,5±0,7 | 3,0±0,3 | 53,4±9,1 |
| Bərəkətli 95 (St) | 107,6±4,4 | 3,60±0,2 | 9,46±0,5 | 22,6±1,1 | 63,8±0,2 | 3,4±0,1 | 52,3±6,2 |
| Zəngəzur | 109,1±3,2 | 3,33±0,1 | 9,65±0,2 | 23,1±1,1 | 59,3±3,8 | 3,2±0,3 | 58,5±8,0 |
| Korifey-88 | 95,1±5,5 | 3,06±0,3 | 11,5±0,6 | 25,5±1,1 | 86,9±5,9 | 4,0±0,1 | 54,8±6,1 |
| Aran | 104,6±5,0 | 3,26±0,2 | 9,6±0,1 | 21,9±0,2 | 54,0±0,2 | 2,3±0,1 | 47,5±5,5 |
| Orta | 104,3±4,5 | 3,36±0,1 | 10,0±0,2 | 23,1±0,3 | 64,5±1,5 | 3,2±0,1 | 53,3±6,3 |

**Cədvəl 2.** Bərk və yumşaq buğda sortlarında dənin orta üçillik keyfiyyət göstəriciləri (Tərtər, 2014-2016).

| Sort | 1000 dənin kütləsi, q | Şüşəvarilik, % | Kleykovina, % | KDƏ, şərti vahid | Zülal, % |
|---|---|---|---|---|---|
| Qarabağ (St.) | 43,2±2,9 | 98,3±1,7 | 33,66±2,33 | 90,00±1,20 | 15,33±0,66 |
| Bərəkətli 95 (St) | 42,6±1,5 | 96,0±4,0 | 31,33±2,72 | 106,70±4,58 | 14,0±0,57 |
| Zəngəzur | 45,0±1,5 | 97,7±2,3 | 29,0±2,08 | 105,60±5,59 | 14,00±0,57 |
| Korifey-88 | 40,0±0,6 | 94,0±1,5 | 27,00±1,00 | 94,00±6,11 | 14,33±0,33 |
| Aran | 37,7±1,2 | 78,7±7,8 | 30,66±0,88 | 96,00±3,78 | 13,33±0,88 |
| Orta | 43,2±2,9 | 92,9±3,5 | 30,30±1,80 | 98,50±4,30 | 14,20±0,60 |

Tərtər BTS-də keçirilmiş ekoloji sınaqda məhsuldarlığı (52,5 s/ha), standartdan 1,6 s/ha yüksək olmuşdur. Sabit məhsuldarlığın əsas səbəbi sünbül-də dənlərin sayının (79,1-98,4 ədəd) və dənlərin kütləsinin (3,86-4,14 q) digər bərk buğda sortlarına və orta göstəriciyə nisbətən çox yüksək olmasıdır. Sünbüldə dənlərin sayının çox olmasına görə 1000 dənin kütləsi nisbətən aşağıdır - 39,4-41,4 q. Dənin forması nisbətən yumru olduğundan natura kütləsi yüksəkdir (740,0 q).

Məhsuldarlığın struktur elementlərinin analizi sünbülün uzunluğu və sünbülcüklərin sayının, sünbüldə dənin sayı və kütləsinin, digər sortlara, o cümlədən standartlara və orta göstəriciyə nisbətən Korifey-88 sortunda yüksək olmasını göstərmişdir. Dənin ölçüsünün göstəricisi olan 1000 kütləsi isə digər sortlara və orta göstəriciyə nisbətən 2,6-5,0 q aşağıdır.

Korifey-88 sortu dəndə zülalın miqdarına görə (14,8-15,4%), yalnız Qarabağ sortundan geri qalır. Dənin şüşəvariliyi (91-96%) və kleykovinanın miqdarı (25,6-28,4%) digər sortlara nisbətən aşağıdır. Amma, dənin əsas keyfiyyət göstəricisi – kleykovinanın deformasiya əmsalı (KDƏ) digər sortlara və orta göstəriciyə nisbətən yüksəkdir. KDƏ vahidinə görə yeni sort, yalnız standart Qarabağ sortundan geri qalır (Cədvəl 2).

Korifey-88 sortunun məhsuldar kollanması ortadır (3-4 ədəd), hektara 3,5-4,0 milyon toxum səpildikdə məhsuldarlıq yüksək olur. Qışa-, şaxtaya və quraqlığa davamlılığı orta, terminal hərarətə davamlılığı yüksək yuxarıdır. Bərk və toz sürmə, unlu şeh, sarı və qonur pas xəstəliklərinə yüksək davamlıdır.

Sələf kimi pambıq və digər cərgəarası becərilən, bir- və çoxillik paxlalı bitkilər, qara və bitkili herik daha səmərəlidir. Sünbüldə dənlərin sayı çox olduğundan yüksək aqrofona tələbkardır. Optimal səpin müddəti oktyabrın 1-2 ongünlüyüdür. Korifey-88 sortu Azərbaycanın suvarılan düzən və nəmliklə təmin olunmuş dağətəyi bölgələrində becərilməsi tövsiyə olunur.

## YEKUN

Son illərdə Azərbaycanda məhsuldarlıq və dənin keyfiyyət göstəricilərinə görə yumşaq buğdalarla rəqabətə qabil Bərəkətli 95, Qarabağ, Zəngəzur, Maya və Korifey-88 bərk buğda sortları yaradılmışdır.

Məhsuldarlıq və onun struktur elementlərinin analizi yeni Korifey-88 bərk buğda sortunda bu göstəricilərin nisbətən sabit olmasını təsdiq edir.

Sabit məhsuldarlıq sünbüldə dənlərin sayının, uyğun olaraq sünbüllərdə dənlərin kütləsinin yüksək olmasına görə formalaşır. Azərbycanda rayonlaşmış və perspektiv bərk buğda sortlarından sünbüldə dənlərin sayın yüksək olması ilə fərqlənir.

## MİNNƏTDARLIQ

Tədqiqatların aparılmasında göstərdikləri dəstəyə görə Əkinçilik Elmi-Tədqiqat İnstitutunun Tərtər BTS əməkdaşlarına dərin minnətdarlığımızı bildiririk.

## ƏDƏBİYYAT

**Musayev Ə.C., Hüseynov H.S., Məmmədov Z.A.** (2008) Dənli taxıl bitkilərinin seleksiyası sahəsində tədqiqat işlərinə dair tarla təcrübələrinin metodikası. Bakı: Müəllim, 88 s.

**Əhmədov M.Q., Rüstəmov X.N., Həsənova Q.M., Təlai C.M., Kərimov Ə.Y., Ibrahimov E.R., Musayev Ə.C.** (2015) Düzən Qarabağ şəraitində bərk və yumşaq buğda genotiplərinin adaptiv qiymətləndirilməsi. *AMEA-nın Xəbərləri (biol. və tibb elmləri),* **70(2):** 146-151.

**Rüstəmov X.N.** (2014) Naxçıvan MR-dən toplanılmış bərk buğdaların (*T.durum* Desf.) morfobioloji əlamətləri. *ƏETİ-nin Elmi əsərləri məcmuəsi*, **XXV:** s. 87-89.

**Rüstəmov X.N., Təlai C.M., Əhmədov M.Q., Həsənova Q.M., Ibrhimov E.R., Musayev Ə.C.** (2016) Yeni buğda sortları–Zəngəzur və Əsgəran. *Azərbaycan aqrar elmi*, **№1:** 34-37.

**Rüstəmov X.N.** (2016) Mədəni ikidənli pərincin (*T.dicoccum* (Schrank) Schuebl.) becərilmə arealı. ADAU-da keçirilmiş "*Aqrar elmin inkişafı, ərzaq təhlükəsizliyi və ətraf mühitin mühafizəsində beynəlxalq əməkdaşıq*" mövzusunda 8-ci beynəlxalq elmi-praktik konfransın materialları, Gəncə: s. 48-52

**Алиев Д.А.** (2006) Селекция пшеницы в Азербайджане. *Известия НАНА (сер. биол. науки)*, **№ 3-4:** 3-32

**Вавилов Н.И.** (1987а) Закон гомологических рядов в наследственной изменчивости. Л.: Наука, 256 с.

**Вавилов Н.И.** (1987б) Центры происхождения культурных растений. Л.: Наука, 440 с.

**Дорофеев В.Ф., Филатенко А.А., Мигушова Э.Ф. и др**. (1979) Культурная флора СССР. (Под общ. руков. В.Ф.Дорофеева), **Том 1**: Пшеница, 346 с.

**Дорофеев В.Ф., Удачин Р.А., Семенова Л.В. и др.** (1987) Пшеницы мира. (Под ред. В.Ф.Дорофеева. Сост. Р.А.Удачин. 2-е изд., пер. и доп. Л.: ВО Агропромиздат, 560 с.

**Дружин А.Е., Сибикеев С.Н., Крупнов В.А. Воронина С.А.** (2011) Создание сортов яровой мягкой пшеницы с устойчивостью к комплексу патогенов методом интрогрессивной селекции. *Достижения науки и техники АПК*, **№1:** 22-24.

**Дувеиллер Е., Сингх П.К., Мецциалама М., Сингх Р.П., Дабабат А.** (2014) Болезни и вредители пшеницы. Руководство для полевого определения (**2-ое издание**). Перевод с английского под общей редакцией Х.Муминджанова (ФАО СЕК), Анкара, 156 с.

**Рустамов Х.Н., Ахмедов М.Г., Аббасов М.А., Кулиев Ш.Б., Ахмедов М.А.** (2013) Оценка межвидовых гибридов тетраплоидных видов пшеницы. *Torpaqşünaslıq və aqrokimya*, **21(1):** 391-395.

**Рустамов Х.Н.** (2016а) Генофонд пшеницы (*Triticum* L.) в Азербайджане. LAP LAMBERT Academic Publishing, 164 с.

**Рустамов Х.Н.** (2016б) Новые образцы культурной двузернянки (*T.dicoccit* (Schrank) Schuebl.) Азербайджана. Материалы Международной научно-практической конференции «*Современные проблемы инновационного развития сельского хозяйства и научные пути технологической модернизации АПК*», Махачкала, **Часть 1:** 105-111.

**Скрипка О.В.** (2005) Селекция мягкой озимой пшеницы на продуктивность и качество зерна в условиях Ростовской области: *Дис. канд. с.-х. наук*. Зерноград: 167 с.

## Новый Сорт Пшеницы Твердой «Корифей-88»

**Х.Н. Рустамов[1,2], З.И. Акпаров[2], Дж.М. Талаи[1], М.Г. Ахмедов[1], А.М. Абдуллаев[1,2], М.А. Аббасов[2], М.А. Ахмедов[3], Г.М. Гасанова[1], С.К. Гаджиева[1], Е.Р. Ибрагимов[1]**

*[1]Научно-исследовательский институт земледелия МСХ Азербайджанской Республики*
*[2]Институт генетических ресурсов НАН Азербайджана*
*[3]Дагестанский филиал ВИР*

Статья посвящена новому сорту пшеницы твердой «Корифей-88», созданному в результате многолетней селекции в Азербайджанском НИИ Земледелия, с использованием генофонда Национального генбанка. Показано, что в течение резко различающихся по агрометеорологическим условиям 2014-2016 годов, наряду с сортами с высоким потенциалом урожайности и качеством зерна, были созданы высокоадаптивные сорта твердой пшеницы. Приведены результаты изучения биоморфологических и агрономических признаков и свойств сорта «Корифей-88» по сравнению со стандартными и перспективными сортами пшеницы. Выявлено, что стабильная по годам урожайность и показатели качества зерна у нового сорта связаны с большим количеством зёрен с колоса и адаптивностью. Новый сорт «Корифей-88» рекомендуется для выращивания в орошаемых низменных и в обеспеченной влагой богарных условиях Азербайджана.

***Ключевые слова:*** *Пшеница твёрдая, сорт, адаптивность, элементы структуры урожая, качество зерна*

## The New Variety of Durum Wheat "Koryfei--88"

**Kh.N. Rustamov[1,2], Z.I. Akparov[2], J.M. Talai[1], M.G. Ahmedov[1], A.M. Abdullaev[1,2], M.A. Abbasov[1], M.A. Ahmedov[3], G.M. Hasanova[1], S.K. Hajiyeva[1], E.R. Ibrahimov[1]**

*[1]Research Institute of Crop Husbandry, Ministry of Agriculture of the Republic of Azerbaijan*
*[2]Institute of Genetic Resources, Azerbaijan National Academy of Sciences*
*[3]Dagestan Branch of VIR*

The article is devoted to a new variety of durum wheat "Koryfei -88", created as a result of long-term breeding using the gene pool from the National Genebank in the Azerbaijan Research Institute of Crop Husbandry. Highly adaptive wheat varieties were developed along with varieties with high yield potential and grain quality under sharply distinguishing agrometeorological conditions during 2014-2016 years. Bio-morphological and agronomical features and characteristics of "Koryfei-88" were compared with standard and perspective varieties of wheat realized in the region. It was revealed that the crop yield and grain quality indicators that were stable for years in the new variety were associated with a large number of grains per ear and adaptability. The new variety "Koryfei-88" is recommended for cultivation under irrigated lowland and the rainfed conditions of Azerbaijan.

***Keywords: D****urum wheat, variety, adaptability, elements of crop structure, grain quality*

# Qanadabənzər-Əng Yarığının Arxa Divarının Ortası İlə Əsas-Damaq Dəliyi Arasındakı Məsafənin Yaş Və Cinsi Dəyişkənliklərinin Xüsusiyyətləri

**V.B. Şadlinski, K.C. Quliyeva***

*Azərbaycan Tibb Universiteti, A.A. Bakıxanov küçəsi, 23, Bakı AZ1022, Azərbaycan;*
**E-mail: najafova1984@mail.ru*

**Təqdim olunan məqalədə postnatal ontogenezin müxtəlif mərhələlərində kranioskopik, kraniometrik və variasion-statistik müayinə üsullarından istifadə etməklə insan kəllələrində qanadabənzər-əng yarığı (QƏY) ilə əsas-damaq dəliyi (ƏDD) arasındakı məsafənin fərdi, yaş və cinsi dəyişkənliklərinin xüsusiyyətləri öyrənilmişdir. Tədqiqatın nəticələrinə görə QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin orta qiyməti kişilərdə I yetkinlik dövründə sağtərəfli üstünlük təşkil edir. Kişilərdə qonşu yaş qruplarının eyniadlı tərəflərinin müqayisəsi II yetkinlik dövrünün parametrlərinin orta qiymətinin I yetkinlik və ahıl dövrünün parametrlərinin orta qiymətinə nisbətən soltərəfli, qadınlarda isə ikitərəfli üstün olduğunu göstərmişdir. Həmin məsafənin cinsi dəyişkənliklərinin müqayisəli təhlili kişilərdə I yetkinlik dövründə, qadınlarda isə II yetkinlik dövründə sağtərəfli üstün olduğunu aşkar etməyə imkan verdi.**

***Açar sözlər:*** *Qanadabənzər-əng yarığı, cins, yaş, kraniometriya, dimorfizm*

## GİRİŞ

QƏY və ona qonşu olan anatomik strukturların, xüsusilə çətin əldə olunan əsas-damaq dəliyi və qanadabənzər kanalın ön dəliyinin variantları həmin törəmələrdən keçən damar-sinir dəstələri üzərində aparılan endoskopik müdaxilələr zamanı klinisistlər qarşısında bir sıra çətinliklər törədir (Гафарова, 2002; Полкокова, 2009; Полев и др., 2012). Belə ki, ƏDD-nin anatomo-topoqrafik variantları haqqında elmi məlumatların azlığı arxa burun qanaxmaları zamanı eyni adlı arteriyanın koaqulyasiyası və xroniki rinitlər zamanı qanadabənzər kanalın ön dəliyi səviyyəsində transnazal endoskopik yolla eyni adlı sinirin neyrotomiyası yeni anatomik məlumatlar tələb edir (Greenstone et al., 1988; Robinson et al., 2012). Qeyd etmək lazımdır ki, əng arteriyasının, əng sinirinin, qanadabənzər kanal sinirinin, əsas-damaq arteriyasının zədələnmələri və qanadabənzər-damaq düyününün xoşxassəli şişləri zamanı rinoendoskopiyanın yüksək səviyyədə həyata keçirilməsi üçün ontogenezin müxtəlif mərhələlərində QƏY və ona yaxın strukturların, o cümlədən əsas-damaq dəliyinin və onunla QƏY-in arxa divarı arasındakı məsafənin anatomo-topoqrafik variantlarının öyrənilməsi həm elmi, həm də praktik cəhətdən əhəmiyyət kəsb edir (Seno et al., 2009; Tang et al., 2009; Jang et al., 2010; George et al., 2012; Kodama et al., 2012).

Əng arteriyasına edilən cərrahi müdaxilələr zamanı müəyyən edilmişdir ki, adı çəkilən damarın zədələnmələri ən çox QƏY-dan və ƏDD-dən keçən yerdə baş verir (Apinhasmit et al., 2004). Digər müəlliflərin qənaətinə görə (Hosseini and Borghei, 2005) rinoserebral infeksiyalar ƏDD vasitəsilə qanadabənzər-damaq çuxuruna, daha sonra QƏY vasitəsilə gicgahaltı çuxura və üzün yumşaq toxumalarına keçə bilər.

Lakin yuxarıda qeyd olunanlara baxmayaraq qanadabənzər-damaq çuxurunda yerləşən damar-sinir dəstələrinə edilən mövcud cərrahi müdaxilələr xəstəliklərin ağırlaşmasının və fəsadlarının qarşısını ala bilmir. Onu da qeyd etmək lazımdır ki, bu günə kimi anatomik, neyrocərrahi və otolarinqoloji dərslik, monoqrafiya və elmi məqalələrdə postnatal ontogenezin müxtəlif mərhələlərində QƏY və ona yaxın sümük strukturların fərdi, yaş və cinsi dəyişkənliklərinin xüsusiyətləri haqqında geniş praktik əhəmiyyəti ola biləcək məlumat demək olar ki, yoxdur. Ona görə də QƏY və ona yaxın olan sümük strukturların topoqrafo-anatomik dəyişkənliklərinin öyrənilməsi bu gün də aktual olaraq qalmaqdadır.

***İşin məqsədi*** postnatal ontogenezin müxtəlif mərhələlərində insan kəlləsində qanadabənzər-əng yarığı ilə əsas-damaq dəliyi arasındakı məsafənin fərdi, yaş və cinsi dəyişkənliklərinin xüsusiyətlərini öyrənməkdən ibarət olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti kimi ATU-nun insan anatomiyası kafedrasının fundamental muzeyində saxlanılan pasportlaşdırılmış insan kəllələrindən istifadə olunmuşdur. İşin gedişi zamanı müxtəlif yaş qruplarını əhatə edən masserasiya olunmuş 167 insan kəlləsi tədqiq edilmişdir. Bu zaman keçmiş SSRİ

Pedaqoji EA-nın 1965-ci ildə yaş morfologiyası, fiziologiyası və biokimyasının problemlərinə həsr olunmuş VII Ümumittifaq konfransında qəbul olunmuş yaş dövrlərindən istifadə olunmuşdur.

Qarşıya qoyulan məqsədə çatmaq üçün kranioskopik, kraniometrik və variasion-statistik müayinə üsullarından istifadə edilmişdir. Ölçüləri apararkən kraniologiyada geniş tətbiq olunan üsullara (Алексеев и Дебец, 1964; Martin, 1928) istinad olunmaq şərtilə, bir ucu düz və digər ucu əyri olan pərgardan və 0,01 mm bölgüləri olan ştangenpərgardan istifadə edilmişdir.

Qanadabənzər-əng yarığının arxa divarı ilə əsas-damaq dəliyi arasındakı məsafəni ölçmək üçün (yan görünüş) *norma lateralis*-dən istifadə edilmişdir.

Alınmış nəticələrin təhlili «Statistical» (Statsoft, 1999) və Microsoft Excel Windows-7 tətbiqi proqramlar paketindən istifadə etməklə PC/AT «Pentum-IV»-də variasion statistika üsulu ilə işlənmişdir. Nümunələrin orta göstəriciləri (M), standart xətaları (m), sıraların minimal (min) və maksimal (max) göstəriciləri və variasiya əmsalı (CV) hesablanmışdır (Реброва, 2002; Боровиков 2015).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Yuxarıda qeyd etdiyimiz kimi ƏDD nəinki nəzəri, həm də klinik əhəmiyyət kəsb edən sümük strukturlardan olub qanadabənzər-damaq çuxuru ilə burun boşluğu arasında yerləşir. Kranioskopik tədqiqatların nəticələri göstərdi ki, əsas-damaq dəliyi 78,4% (262 kəllə) halda damaq sümüyünün perpendikulyar səfhəsinin içəri səthindəki xəlbir darağının arxa-yuxarı tərəfində yerləşir və dəlik qanadabənzər-damaq çuxurunu yuxarı burun keçəcəyi ilə birləşdirir. Lakin morfoloji tədqiqatların nəticələri 21,6% halda (72 kəllə) ƏDD-nin xəlbir darağının arxa tərəfində, yəni yuxarı və aşağı burun keçəcəklərinin sərhəddində də yerləşdiyini aşkar etməyə imkan verdi. Tədqiq etdiyimiz kəllələrin 28-də (8,4%) yuxarı burun keçəcəyinə proyeksiya olunan ƏDD-dən başqa orta burun keçəcəyinə proyeksiya olunan əlavə əsas-damaq dəliyi (foramen sphenopalatinum accesorium) də aşkar olundu. Tədqiqat zamanı ƏDD-yə xəlbir darağının ön-yuxarı və ön-aşağı tərəflərində heç bir kəllədə rast gəlinmədi.

Beləliklə, əldə etdiyimiz kranioskopik müayinələrin nəticələri ƏDD-nin topoqrafik cəhətdən dəyişkən olduğu fikrini irəli sürməyə imkan verdi. Bu isə həmin dəlikdən burun boşluğuna keçən əsasdamaq arteriyasının və yuxarı-arxa burun sinirlərinin topoqrafiyasında və şaxələrin sayında dəyişkənliklərin olması fikrini təsdiqləyir. Təqdim etdiyimiz fikirlərin öz təsdiqini tapmasında damaq sümüyünün perpendikulyar səfhəsinin içəri tərəfində yerləşən xəlbir darağının çox böyük əhəmiyyəti vardır. Belə ki, müayinə olunan kəllələrin hamısında xəlbir darağını müşahidə etmək mümkündür. Ona görə də həmin daraqdan ƏDD və oradan keçən damar-sinir dəstəsinin topoqrafiyası, eləcə də rastgəlmə tezliyinin aşkar olunmasında stabil anatomik oriyentir kimi istifadə olunmasına əsas verir. Bu isə əng arteriyası və onun şaxələrinin qanaxmaları, qanadabənzər kanal siniri və qanadabənzər-damaq düyününün patologiyaları zamanı transnazal videoendoskopik cərrahiyyənin imkanlarının artırılmasına xidmət edəcək.

Kişilərdə (yeniyetmə, gənclik dövrü və yaşlılar) QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin orta qiymətinin qarşı tərəflər arasındakı müqayisəli təhlili I yetkinlik dövrünün göstəricilərinin sağtərəfli üstünlüyə malik olmasını aşkar etməyə imkan verdi ($p<0,05$). Belə ki, adı çəkilən məsafə sağ tərəfdə 5,0-17,5 mm, sol tərəfdə isə 6,0-11,5 mm arasında tərəddüd edərək orta hesabla 11,3±0,8 mm və 8,8±0,4 mm təşkil edir. Göründüyü kimi QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin orta qiyməti sağ tərəfdə sol tərəfə nisbətən 1,3 dəfə və ya 2,5mm artıqdır. II yetkinlik dövrü, ahıl və qocalıq dövrünün qarşı tərəflərinin eyniadlı göstəriciləri arasında statistik cəhətdən əhəmiyyətli fərq aşkar olunmadı ($p>0,05$). Onu da qeyd etmək lazımdır ki, kişilərdə QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin orta qiyməti I yetkinlik dövrünün sağ tərəfində ən böyük (11,3±0,8 mm), qocalıq dövrünün sağ tərəfində ən kiçik (8,0±0,4 mm) qiymətə malikdir.

Apardığımız tədqiqatlarla müəyyən olunmuşdur ki, QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin variyasiya əmsalı (CV) kişilərdə I və II yetkinlik dövrlərində sağtərəfli, yeniyetmə, gənclik və qocalıq dövrlərində isə soltərəfli üstünlük təşkil edir. Əldə olunan nəticələrə görə bu göstərici I yetkinlik dövründə sağ tərəfdə sol tərəfə nisbətən 1,7 dəfə (33,5% və 19,2%), II yetkinlik dövründə 1,2 dəfə (26,0% və 21,2%) artmışdır. Həmin göstəricinin variasiya əmsalı yeniyetmə dövründə sol tərəfdə sağ tərəfə nisbətən 1,1 dəfə (27,6% və 31,1%), gənclik dövründə 1,4 dəfə (23,9% və 32,6%), qocalıq dövründə 1,3 dəfə (22,9% və 17,1%) artmışdır.

Kişilərdə QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafənin orta qiymətinin qonşu yaş qruplarının eyniadlı tərəfləri arasındakı müqayisəli təhlili adı çəkilən göstəricinin II yetkinlik dövrünün sol tərəfində I yetkinlik və ahıl dövrünün eyniadlı tərəflərinə nisbətən əhəmiyyətli dərəcədə artdığını aşkar etməyə imkan verdi ($p<0,01$). Tədqiqatın nəticələrinə görə QƏY-in arxa divarının ortası ilə ƏDD arasındakı məsafə II yetkinlik dövrünün sol tərəfində 7,0-14,5 mm arasında dəyişərək orta hesabla 10,6±0,4 mm, I yetkinlik dövründə isə 6,0-11,5 mm arasında dəyişərək 8,8±0,4mm təşkil edir.

*can Fizioloqlar Cəmiyyətinin Elmi əsərlərinin külliyyatı*, **XXVIII:** 68-72.

**Балуда В.П., Балуда М.В., Диянов И.И., Телепшуков И.К.** (1995) Физиология системы гемостаза. М.: Медицина, 252 с.

**Гипоксия** (2000) Адаптация, патогенез, клиника (Под ред. Ю.Л.Шевченко). СПб.: Элби, 384 с.

**Долгов В.В., Свирин П.В.** (2005) Лабораторная диагностика нарушений гемостаза. М., Тверь: Триада, 227 с.

**Елисеева Е.Е.** (2006) Анализы. Полный справочник. М.: Эксмо, с. 42-50.

**Исабаева В.А.** (1983) Система свертывания крови и адаптация к природной гипоксии. Л.: Наука, 151 с.

**Нагнибеда Н.Н.** (1997) Влияние гипоксии на активность симпатико-адреналовой системы. *Вестн. РАМН,* **№5:** 19-23.

**Пантелеев М.А.,Васильев С. А.,Синауридзе Е.И.,Воробьев А.И., Атауллаханов Ф.И.** (2011) *Практическая коагулология*. Под ред. А. И.Воробьева. М.: Практическая медицина,. 192 с.

**Шахматов И.И., Вдовин В.М., Бондарчук Ю.А., Алексеева О.В., Киселев В.И.** (2007) Гипоксическая гипоксия как фактор, активирующий систему гемостаза. *Бюллетень Сибирской медицины*, **№1:** 67-72.

**Шишонок А.И., Щербакова И.Г., Гребенникова И.В.** (2015) Современные аспекты гемостаза. *Международный студенческий научный вестник*, **№ 2-1:** 123-126.

**Юшков Б.Г., Климин В.Г., Северин М.В.** (1999) Система крови и экстремальные воздействия на организм. Екатеринбург: УрО РАН, 194 с.

**Schobersberger W., Hoffmann G., Gunga H.C.** (2005) Interaction of hypoxia and haemostasis – hypoxia as a prothrombotic factor at high altitude? *Wien Med. Wochenschr.*, **155(7-8):** 157–162.

## Отдаленное Воздействие Антенатальной Гипоксии На Последнюю Фазу Свертывания Крови Крысят

**Г.К. Джафарова, А.Г. Газиев**

*Институт физиологии им. А.И Гараева, НАН Азербайджана*

Результаты показывают, что антенатальная гипоксия оказывает выраженное влияние на систему свертывания крови. Выявленные гипокоагуляционной направленности изменения гемостаза: тромбиновое время, характеризующее конечную фазу свертывания, удлиняется, уровень фибриногена уменьшается, а толерантность плазмы к гепарину увеличивается. Указанные изменения в основном выявлены в зародышевом периоде воздействия фактора гипоксии. Установлено, что пренатальная гипоксия способствует замедлению процесса свертывания крови потомств в ранние периоды постнатального онтогенеза.

***Ключевые слова:*** *Гипоксия, гемостаз, тромбиновое время, фибриноген, гипокоагуляция*

## Remote Effects Of Antenatal Hypoxia On The Last Phase Of Blood Coagulation In Rats

**G.G. Jafarova, A.G. Gaziyev**

*A.I. Garayev Institute of Physiology, Azerbaijan National Academy of Sciences*

The findings show that antenatal hypoxia has a pronounced effect on the blood coagulation system. The revealed changes in hemostasis of hypocoagulant orientation: the thrombin time characterizing the final phase of coagulation extends the level of fibrinogen decreases, and the plasma tolerance to heparin increases. These changes are mainly found in the embryonic period under the exposure of the hypoxia factor. It has been established that prenatal hypoxia contributes to the slowing down of the blood coagulation process in the early periods of postnatal ontogeny in offspring.

***Keywords:*** *Hypoxia, hemostasis, thrombin time, fibrinogen, hypocoagulation*

# Dərmanlara Rezistent Ağ Ciyər Vərəminin Klinik-Rentgenoloji Xüsusiyyətləri

**R.İ. Bayramov[1], C.M. İsmayılzadə[1], İ.M. Axundova[2], R.M. Abuzərov[2], M.M. Seyfəddinova[2]**

*[1] Azərbaycan Tibb Universitetinin Ftiziatriya kafedrası, A. A.Bakıxanov küç., 23, Bakı AZ1022, Azərbaycan;E-mail: rafiq-bayramov@mail.ru*
*[2]Azərbaycan Respublikası Səhiyyə Nazirliyi ET Ağciyər Xəstəlikləri Institutu, E. Suleymanov küç., 2514-cü məhəllə., Bakı AZ1118, Azərbaycan*

**Tədqiqatın məqsədi dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə rezistentliyin strukturunun, patoloji prosesin klinik-rentgenoloji xüsusiyyətlərinin və bu xəstələrin müalicəsinin effektivliyinin öyrənilməsi olmuşdur. Bu məqsədlə 62 nəfər vərəm əleyhinə dərmanlara rezistent ağ ciyər vərəmi xəstələri üzərində tədqiqat aparılaraq ümumi klinik-laborator müayinə üsullarından: bəlğəmin bakterioskopik və bakterioloji müayinəsi, döş qəfəsi orqanlarının rentgenoloji və KT müayinəsi, diaskintest, vərəm əleyhinə dərmanlara qarşı həssaslığın təyini məqsədilə bəlğəmin GeneXpert müayinəsi və Levenşteyn-Yensen qidalı mühitində əkilməsindən istifadə edilmişdir. Tədqiqat nəticəsində dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələr arasında MDR formalı ağ ciyər vərəminin daha çox rast gəlməsi (xəstələrin 40%-i) müəyyən edilmişdir. Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrin kompleks, intensiv müalicəsi nəticəsində bəlğəmdə vərəm çöpü ifrazının daha çox və nisbətən tez kəsilməsi monorezistent ağ ciyər vərəmi olan xəstələrdə, daha gec isə MDR və XDR ağ ciyər vərəmi olan xəstələrdə müşahidə edilmişdir. Vərəm əleyhinə dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə ağ ciyər toxumasındakı dağılma boşluqlarının bağlanması monorezistent ağ ciyər vərəmi olan xəstələrdə daha erkən, MDR və XDR ağ ciyər vərəmi olan xəstələrdə isə daha gec müşahidə edimişdir.**

***Açar sözlər:*** *Ağ ciyər vərəmi, dərmanlara rezistentlik, vərəmin müalicəsi*

## GİRİŞ

Tibbin bütün sahələrində olduğu kimi, son illər ftiziatriyada da inkişafın olmasına baxmayaraq bütün dünyada vərəm səhiyyənin əsas problemlərindən biri olaraq qalmaqdadır. Belə ki, Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) məlumatına əsasən 2015-ci ildə dünyada 10,4 mln. insan vərəmlə xəstələnmişdir ki, onlardan 5,9 mln. (56%) kişi, 3,5 mln. (34%) qadın və 1,0 mln. (10%) uşaq olmuş-dur (WHO Global tuberculosis report, 2016). Bu xəstələr arasında 480 000 nəfər multirezistent (MDR), 100000 nəfər isə rifampisinə davamlı xəstələr olmuşdur. Vərəm bütün dünyada ölümün 10 əsas səbəblərindən biri olub, 2015-ci ildə 1,4 mln. insanın ölümünə səbəb olmuşdur. 2015-ci ildə dünyada 580000 nəfər MDR vərəm xəstəsi kimi qeydiyyata götürülsə də, onlardan 125.000 (20%) nəfəri lazımi müalicəyə cəlb edilməmişdir. Bu xəstələrin müalicəsindəki çatışmazlıqlar 60%-halda aşağıdakı 5 ölkənin payına düşür: Hindistan, Çin, Rusiya, İndoneziya və Nigeriya (WHO..., 2016). Qeyd edilən göstəricilərdən də göründüyü kimi vərəm əleyhinə dərmanlara rezistent ağ ciyər vərəminin aşkar olunma göstəriciləri çox yüksəkdir. Eyni zamanda bu xəstələrin müalicəsinin daha çətin, uzun-müddətli və baha olması ilə yanaşı xəstələrin hamısının lazımi müalicəyə cəlb edilməməsi belə xəstələrin sağalmaması ilə yanaşı epidemioloji təhlükəliliyinin artmasına da səbəb olur. Belə ki, bu xəstələr ətrafındakı sağlam insanların yoluxmasına və yeni birincili dərmanlara davamlı vərəm xəstələrinin yaranmasına səbəb olur (Acosta et al., 2014; Dhar-madhikari et al. (2014). Bu baxımdan ağ ciyər vərəmi olan xəstələr arasında dərmanlara rezistentliyin rastgəlmə tezliyi, strukturu, patologiyanın klinik-rentgenoloji xüsusiyyətləri və aparılan müalicənin effektivliyinin öyrənilməsi ftiziatriyanın aktual problemlərindən biridir.

***Tədqiqatın məqsədi:*** Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə rezistentliyin strukturunun, patoloji prosesin klinik-rentgenoloji xüsusiyyətlərinin və bu xəstələrin müalicəsinin effektivliyinin öyrənilməsidir.

## MÜAYİNƏNİN MATERİAL VƏ METODLARI

Qarşıya qoyulan vəzifələri icra etmək üçün ATU-nun Ftiziatriya kafedrasının bazasında (Bakı şəhəri, 4 saylı Vərəm Əleyhinə Dispanser) qeydiyyatda olan 62 nəfər vərəm əleyhinə dərmanlara rezistent ağ ciyər vərəmi xəstələri üzərində tədqiqat aparılmışdır. Bu xəstələrdən 46 nəfər (74,2%) kişi, 16 nəfər (25,8%) qadın olmuşdur. Xəstələrin müayinəsində ümumi klinik-laborator müayinə üsullarından: bəlğəmin bakterioskopik və bakterioloji müayinəsi, döş qəfəsi orqanlarının rentgenoloji və KT müayinəsi, diaskintest, vərəm əleyhinə dərman-

lara qarşı həssaslığın təyini məqsədilə bəlğəmin GeneXpert müayinəsi və Levenşteyn-Yensen qidalı mühitində əkilməsindən istifadə edilmişdir.

Tədqiqatın nəticələrinin statistik təhlili "Microsoft Excel 2007" proqramının köməyi ilə aparılmış, göstəricilər arasında dürüstlük T-Styudent kriterisinə görə qiymətləndirilmişdir.

## NƏTİCƏLƏRİ VƏ ONLARIN TƏHLİLİ

Tədqiqat aparılan 62 nəfər dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrin 44 nəfəri (71%) ilkin aşkar edilən, 18 nəfəri (29%) isə əvvəllər vərəm əleyhinə müalicə qəbul etmiş xəstələr olmuşdur. Klinik strukturuna görə 34 nəfərdə (55%) infiltrativ, 12 nəfərdə (19,4%) səpələnmiş, 10 nəfərdə (16%) fibroz-kavernoz, 6 nəfərdə isə (9,6%) kavernoz ağ ciyər vərəmi aşakar edilmişdir. Vərəm əleyhinə dərmanlara qarşı rezistentliyin strukturuna görə (şəkil 1.) isə 14 nəfərdən (23%) monorezistentlik, 17 nəfərdə polirezistentlik (27%), 25 nəfərdə (40%) multirezistentlik (MDR), 6 nəfərdə isə (10%) XDR forma aşkar edilmişdir.

Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrin klinik-rentgenoloji xüsusiyyətlərinin təhlilinə əsasən müəyyən olunmuşdur ki, bu xəstələrdə intoksikasiya əlamətlərindən - bədən çəkisinin azalması, halsızlıq və axşamlar subfebril hərarətin olması üstünlük təşkil etmişdir (şəkil 2).

Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə bronx-ağ ciyər əlamətlərinin təzahürünün təhlili zamanı müəyyən edilmişdir ki, bu xəstələrdə öskürək və təngnəfəslik daha çox müşahidə edilir (şəkil 3).




**Şəkil 1.** Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə rezistentliyin strukturu




**Şəkil 2.** Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə intoksikasiya əlamətlərinin təzahürü




**Şəkil 3.** Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə bronx-ağ ciyər əlamətlərinin təzahürü

**Cədvəl 1.** Dərmanalara rezistent ağ ciyər vərəmi olan xəstələrdə bəlğəmdə vərəm çöpü ifrazının kəsilməsinin müddəti və tezliyi

| Dərmanlara rezistenliyin növü | Xəstələrin sayı (%) | Vərəm çöpü ifrazının kəsilməsi (ay) | | | 6 aydan çox VMB+ |
|---|---|---|---|---|---|
| | | 2 | 4 | 6 | |
| Monorezistent | 14 (100%) | – | 14 (100%) | 14 (100%) | - |
| Polirezistent | 17 (100%) | – | 12 (70,6%) | 17 (100%) | - |
| MDR: | 25 | – | | | |
| HR | 6 (100%) | – | 4 (66,7%) | 6 (100%) | |
| HRS | 10 (100%) | – | 7 (70%) | 10 (100%) | |
| HRSE | 5 (100%) | – | 4 (80%) | 4 (80%) | 1 (20%) |
| HRSE+1 ehtiyat prep. | 2 (100%) | – | - | 1 (50%) | 1 (50%) |
| HRSE+2 ehtiyat prep. | 1 (100%) | – | - | - | 1 (100%) |
| HRSE+3 ehtiyat prep. | 1 (100%) | – | - | - | 1 (100%) |
| XDR | 6 (100%) | – | - | 2 (33,3%) | 4 (66,7%) |
| Cəmi: | 62 (100%) | – | 41 (66%) | 54 (87%) | 8 (13%) |

Patoloji prosesin rentgenoloji şəklinə görə ağ ciyərin bir payı və daha çox sahəni tutması (70,6% xəstədə), iki və daha çox dağılma boşluğunun olması (40,4% xəstədə) daha çox müşahidə edilmişdir.

Tədqiqat apardığımız 62 nəfər dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrin müalicəsinin effektivliyinin qiymətləndirilməsi məqsədilə bu xəstələrə vərəm əleyhinə dərmanlara həssaslıq nəzərə alınmaqla fərdi müalicə təyin edilmişdir. Müalicənin intensiv mərhələsi mikobakteriya ifrazetmənin dayanması müddətindən asılı olmuşdur. Bəlğəmdə vərəm çöpü ifrazının kəsilməsi ən tez, yəni müalicənin 4-cü ayının sonunda monorezistent olan xəstələrdə müşahidə edilmişdir (cədvəl 1). Polirezistentlik olan xəstələrdə bəlğəmdə vərəm çöpü ifrazının kəsilməsinə müalicənin 6 ayında nail olunmuşdur. MDR ağ ciyər vərəmi olan xəstələrin müalicəsi zamanı ilə bəlğəmdə vərəm çöpü ifrazının kəsilməsi müalicənin 6-cı ayından etibarən başlamışdır. Vərəm çöpü ifraz edən XDR ağ ciyər vərəmi olan xəstələrdə bəlğəmdə vərəm çöpü ifrazının kəsilməsi xəstələrin yarısından çoxunda 6 aydan çox davam etmişdir.

Ağ ciyər toxumasındakı dağılma boşluğunun 2 ay intensiv müalicə nəticəsində bağlanması monorezistent xəstələrin 21%-də, polirezistent xəstələrin isə 10%-də müşahidə edilmişdir. Aparılan müalicənin 4-cü ayının sonunda dağılma boşluğunun bağlanması ən çox (72%) monorezistent ağ ciyər vərəmi olan xəstələrdə təsadüf etmişdir. MDR ağ ciyər vərəmi olan xəstələrin intensiv müalicəsinin 4-cü ayında dağılma boşluğunun bağlanması xəstələrin 19%-də, 6-cı ayın sonunda isə 86% xəstədə müşahidə edilmişdir. XDR ağ ciyər vərəmi olan xəstələrin yalnız 32%-də dağılma boşluğunun bağlanması müalicənin 6-cı ayının sonunda olmuşdur.

Beləliklə, dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələr arasında MDR formalı ağ ciyər vərəminin daha çox rast gəlməsi (xəstələrin 40%-i) müəyyən edilmişdir. Dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrin kompleks, intensiv müalicəsi nəticəsində bəlğəmdə vərəm çöpü ifrazının daha çox və nisbətən tez kəsilməsi monorezistent ağ ciyər vərəmi olan xəstələrdə, daha gec isə MDR və XDR ağ ciyər vərəmi olan xəstələrdə müşahidə edilmişdir.

Vərəm əleyhinə dərmanlara rezistent ağ ciyər vərəmi olan xəstələrdə ağ ciyər toxumasındakı dağılma boşluqlarının bağlanması monorezistent ağ ciyər vərəmi olan xəstələrdə daha erkən, MDR və XDR ağ ciyər vərəmi olan xəstələrdə isə daha gec müşahidə edimişdir.

**Bu iş Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun maliyyə yardımı ilə yerinə yetirilmişdir – *Qrant № EİF-KETPL-2-2015-1(25)-56/40/3***

## ƏDƏBİYYAT

**Word Health Organization Global tuberculosis report.** 2016.

**Acosta C.D., Dadu A., Ramsay A., Dara M.** (2014) Drug-resistant tuberculosis in Eastern Europe: challenges and ways forward. *Intern. Union Against Tuberculosis and Lung Disease,* **4(supl. 2):** 3-12.

**Dharmadhikari A.S. et al.** (2014) Rapid impact of effective treatment on transmission of multidrug-resistant tuberculosis. *Int. J. Tuberc. Lung Dis.*, **18(9):** 1257-1266.

## Клинико-Рентгенологические Особенности Лекарственно-Устойчивого Туберкулеза Легких

**Р.И. Байрамов[1], Дж.М. Исмаилзаде[1], И.М. Ахундова[2], Р.М. Абузаров[2], М.М. Сейфаддинова[2]**

*[1] Кафедра фтизиатрии Азербайджанского медицинского университета*
*[2] Научно-исследовательский институт Министерства Здравоохранения Азербайджанской Республики*

Целью исследования явилось определение структуры, клинико-рентгенологических особенностей патологического процесса, а также изучение эффективности лечения этих больных. С этой целью было обследовано 62 больных с лекарственно-устойчивым туберкулезом легких, у которых проводи-лись: бактериоскопическое и бактериологическое исследования мокроты, рентгенологические и КТ исследования органов грудной клетки, диаскинтест, а также с целью выявления чувствительности к противотуберкулезным препаратам - исследование мокроты методом GeneXpert и посев мокроты в питательной среде Левенштейн-Йенсена. Результаты исследования показали, что среди лекарственно-устойчивых форм туберкулеза чаще всего (40% от всех больных) встречаются MDR-формы туберкулеза легких. В результате комплексного, интенсивного лечения больных с лекарственно-устойчивым туберкулезом легких относительно быстрое прекращение бацилловыделе-ния наблюдалось у больных с монорезистентным туберкулезом, а у больных с MDR и XDR формами наблюдалось позднее абациллирование. Более раннее закрытие полостей распада наблюдалось у больных с монорезистентным туберкулезом легких, а более позднее - у больных с MDR и XDR формами.

***Ключевые слова:*** *Туберкулёз легких, лекарственная устойчивость, лечение туберкулеза*

## Clinical And Radiological Features Of Drug-Resistant Lung Tuberculosis

**R.I. Bayramov[1], J.M. Ismailzada[1], I.M. Akhundova[2], R.M. Abuzarov[2], M.M. Seyfaddinova[2]**

[1] *Department of Phthisiatry, Azerbaijan Medical University*
[2] *Research Institute of Lung Diseases, Ministry of Health of the Republic of Azerbaijan*

The aim of the study was to determine the structure, clinical and radiological features of the pathological process, as well as to study the effectiveness of treatment of these patients. For this purpose, 62 patients with drug-resistant pulmonary tuberculosis were examined: bacterioscopic and bacteriological sputum examination, X-ray and CT examinations of the chest, Diaskintest, and to detect susceptibility to anti-tuberculosis drug sputum examination by the GeneXpert method and sputum culture in the Levenshtein-Jensen nutrient medium. The results of the study showed that MDR-TB of pulmonary tuberculosis occurred most frequently (40% of all patients) among the drug-resistant forms of tuberculosis. As a result of complex, intensive treatment of patients with drug-resistant pulmonary tuberculosis, a relatively rapid cessation of bacilli was observed in patients with mono-resistant, and in patients with pulmonary tuberculosis with MDRTB and XDR TB – late cessation of bacilli. Earlier closure of the decay cavities in patients with drug-resistant pulmonary tuberculosis was observed in patients with mono-resistant pulmonary tuberculosis, and more recently in patients with MDR and XDR forms.

***Keywords**: Pulmonary tuberculosis, drug resistance, treatment of tuberculosis*

# Qida Paxlalı Bitkilərin Bəzi Fizioloji Göstəricilərinin Öyrənilməsi

**R.S. Mirzəyev, L.Ə. Əmirov, T.İ. Allahverdiyev***

*Azərbaycan Respublikası KTN Əkinçilik Elmi-Tədqiqat İnstitutu, Pirşağı qəsəbəsi, 2 saylı sovxoz, Bakı AZ1098, Azərbaycan; E-mail: tofiq_1968@mail.ru*

**Noxud və mərcimək bitkilərinin yarpaqlarında fotosintezin sürəti, ağızcıqların keçiriciliyi, hüceyrəarası sahələrdə $CO_2$-nin qatılığı, transpirasiyanın sürəti, xüsusi yarpaq kütləsi və bitki örtüyünün temperaturu təyin olunmuşdur. Noxud və mərciməyin xüsusi yarpaq kütləsi özünün maksimal qiymətini vegetasiya dövrü ərzində dən dolma fazasında alır. Seleksiyada yüksək məhsuldar sortların alınması prosesində bəzi fizioloji göstəricilərin nəzərə alınması məqsədəuyğundur.**

***Açar sözlər:*** *Noxud, mərcimək, qaz mübadiləsi, yarpağın xüsusi kütləsi, məhsuldarlıq, sort*

## GİRİŞ

Ölkəmizdə ərzaq təhlükəsizliyinin təmin olunmasında paxlalı bitkilərin rolu əvəzsizdir. Onların dənləri yağ turşuları, vitaminlər, şəkərlər və əvəz olunmayan amin turşuları ilə zəngindir. Ərzaq-paxlalı bitkiləri əkinlərə sərf olunan mineral gübrələrin (azot gübrəsinin) məsrəflərini azaltmaqla yanaşı, növbəli əkinlərdə əvəzolunmaz sələf bitkisi rolunu oynayırlar.

Son zamanlarda az vaxt tələb edən daha sadə cihazlardan və ekspes-metodlardan istifadə etməklə bitkilərin quraqlığa davamlılığı haqqında məlumat almaq olur. Bu kimi ölçmələrdə yarpaqların su saxlamaq qabiliyyətini təyin etmək üçün "Turqoromer-1", yarpaqlarda baş verən transpirasiyanın hesabına əkin səviyyəsində temperaturun dəyişilməsini isə infraqırmızı termomertlə təyin etmək olur.

Bu metodlardan istifadə etməklə buğda bitkisində (Абдулбагиева и др., 2007), çöl sarımsağında (Безменова и др., 2010) bitkinin quraqlığa davamlılığı öyrənilmiş və nəticədə tədqiq olnunan materiallar arasından quraqlığa davamlı nümunələr seçilmişdir. Eyni zamanda, quraqlığın mərcimək bitkisinin köklərinin kütləsinə (Dharmendra et al., 2013), noxudun məhsuldarlığına və çiçəklənməyə qədər olan günlərinin sayına, vegetasiya müddətinə və s. (Krishnamurthy et al., 2010), ağızcıqların keçiriciliyinə, məhsul indeksinə, fotosistem II-nin fotokimyəvi effektivliyinə (Masoumeh et al., 2013), 40 noxud nümunəsində bitkilərin boy və inkişafına, 100 dənin kütləsinə, məhsuldarlığına, xlorofilin miqdarına (Sayyed et al., 2006, Ulemale et al., 2013), müxtəlif su təminatı şəraitində becərilən mərcimək nümunələrinin kök sisteminə və quru biokütləsinin dəyişməsinə təsiri öyrənilmişdir (Mohammad, 2012).

Universal adaptiv xüsusiyyətə malik olan xüsusi yarpaq kütləsi bitkilərin ətraf mühitlə qaz mübadiləsində əhəmiyyətli rol oynayır. Bir çox tədqiqatlarda fotosintezin intensivliyi ilə xüsusi yarpaq kütləsi arasında sıx əlaqənin olması faktı müəyyən olunmuşdur (Deloney, Dobrens, 1974; Расулов, Асроров, 1982; Алиев, 1983). Kifayət qədər işıq olduğu şəraitdə fotosintezin intensivliyi ilə xüsusi yarpaq kütləsi arasında sıx əlaqənin olmasını yarpaqda fotosintetik aparatın sturuktur elementlərinin konsentrasiyasının artması ilə izah etmək olar. Yarpaqlarda fotosintetik aparatın struktur elementlərinin qatılığının artması $CO_2$-nin assimilyasiyası üçün zəruridir.

Xüsusi yarpaq kütləsi ilə məhsuldarlıq arasında əlaqənin olması haqqında ədəbiyyat məlumatları birmənalı deyil. Belə ki, xüsusi yarpaq kütləsinin artması ilə təkcə fotosintezin intensivliyi və qaz mübadiləsinin işıqdan asılılıq əyrilərinin doyma səviyyəsi artmır, eyni zamanda tənəffüsün intensivliyi də artır (Тооминг, 1984).

Bu bitkilərin istehsalını artırmaq üçün yeni, ətraf mühitin stres amillərinə davamlı, məhsuldar sortların yaradılması, toxumçuluğunun təşkili, becərilmə texnologiyalarının müəyyən edilməsi, yığımının mexanikləşdirilməsi və təsərrüfatlarda tətbiq edilməsi qarşıya qoyulmuş əsas məqsədlərdən biridir. Bu baxımdan, qida paxlalı bitkilərin müxtəlif ekoloji-coğrafi mənşəyə malik dünya kolleksiyası nümunələri və yerli nümunələr toplanaraq öyrənilməli, onların respublikamızın müxtəlif bölgələrində ekoloji sınaqları keçirilərək üstün xüsusiyyətlərinin müəyyənləşdirilməsi və seleksiya yolu ilə hər bölgə üçün əlverişli sortların yaradılması zəruridir. Təqdim olunan iş Quraq ərazilərdə Kənd Təsərrüfatı Tədqiqatlarının Beynəlxalq Mərkəzi-***ICARDA***-dan alınmış qida paxlalı bitkilərin dünya genofondu nümunələrinin və yerli nümunələrin öyrənilmsinə həsr olunmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti kimi, noxudun quraqlığa, askoxitoz xəstəliyinə davamlı formaları, yazlıq formaları, qışa davamlı formaları və s., mərcinin iri

dənli, soyuğa davamlı, yazlıq formaları, qırmızı dənli və s. nümunələri, eyni zamanda əvvəlki tədqiqat illərində seçdiyimiz perspektivli nümunələrdən istifadə edilmişdir.

Tarlada bitki örtüyünün temperaturu infraqırmızı termometrlə, yarpaqların su saxlamaq qabiliyyəti "Turqoromer-1" cihazı vasitəsilə Kuşnirenko metoduna görə (Кушниренко, 1991), fotosintezin sürəti, ağızcıqların keçiriciliyi, hüceyrələrarası sahələrdə $CO_2$-nin qatılığı, transpirasiyanın sürəti isə LI-COR-6400XT Daşınan Fotosintez Sisteminin köməyi ilə, xüsusi yarpaq kütləsi yarpağın quru kütləsinin onun sahəsinə bölməklə hesablanmışdır.

Tarla təcrübələri Əkinçilik ET İnstitutunun Abşeron Yardımçı Təcrübə Təsərrüfatı sahəsində, Dağlıq Şirvan zonasının yağmurla təmin olunma-mış dəmyə şəraitində yerləşən Qobustan Bölgə Təcrübə Stansiyasında və Cənubi Muğanda yerləşən, yağmurla təmin olunmamış Cəlilabad Bölgə Təcrübə Stansiyasında qoyulmuşdur.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Bitkilərin məhsuldarlığı əsasən fotosintezin sürətindən və effektivliyindən, eyni zamanda ətraf mühit amillərindən (işıq, temperatur, karbon qazının miqdarı, su və qida maddələri ilə təmin olunma dərəcəsindən, yarpağın yaşından və s.) asılıdır.

Qida paxlalı bitkilərin vegetasiya dövrünün böyük bir hissəsi yaz və yay aylarına düşdüyündən, quraqlığın bu bitkilər üçün nə dərəcədə arzu olunmaz olduğu görünür. Məlumdur ki, quraqlığın müddəti artdıqca məhsul itkisi də artır. Əkində vegetasiyanın sonunadək davam edən quraqlıq məhsuldarlığın 75%-ə qədər azalmasına gətirib çıxara bilir (Калинина, Андреева, 1991). Bir qayda olaraq, bitkilərin çiçəkləmə dövründən başlayaraq bar orqanlarının əmələ gəlməsi dövrünə kimi olan müddətdə baş verən quraqlıq məhsuldarlığa daha cox təsir edir. Bu dövrdə quraqlığın təsirindən çiçəkləmə zəyifləyir, mayalanma prosesi pozulur, dənin formalaşma müddəti qısalır və nəticədə məhsul kəskin sürətdə azalır. Quraqlıq zamanı torpaqda suyun miqdarının azalması yarpaqlarda turqorun azalmasına, köklərdə sintez olunan kimyəvi birləşmələrə (absis turşusu və s.) cavab olaraq ağızcıqların bağlanmasına səbəb olur (Araus et al., 2008; Anjum et al., 2011), suyun transpirasiya yolu ilə itkisi azalır və assimilyasiyaedici orqanlarda fotosintetik qaz mübadiləsi zəifləyir.

Bununla əlaqədar olaraq, bəzi noxud nümunələrinin yarpaqlarında fotosintezin sürəti, ağızcıqların keçiriciliyi, hüceyrələrarası sahələrdə $CO_2$-nin qıtlığı və transpirasiya sürəti təyin olunmuşdur (cədvəl 1). Ölçmələr zamanı nümunələrin daha yuxarıda yerləşən tam formalaşmış yarpaqlarından istifadə olunmuşdur. Qeyd etmək lazımdır ki, tədqiq olunan nümunələr arasında Sanford sortu daha az məhsuldarlığa malik olmuşdur (0,8-1 t/ha). Digər nümunələrin məhsuldarlığı 1,0-1,5 t/ha arasında dəyişmişdir.

Cədvəl 1-dən görünür ki, Sultan sortu istisna olmaqla, tədqiq olunan digər nümunələrdə fotosintezin sürəti nisbətən daha yüksək olmuşdur. Fotosintezin sürəti ilə hüceyrəarası sahələrdə $CO_2$ qatılığını müqayisə etdikdə məlum olmuşdur ki, nümunələrdə fotosintezin sürəti yüksək olduğu halda, $CO_2$-nin hüceyrələrarası qatılığı aşağı olur. F.03-36 nümunəsində fotosintezin sürəti ən yüksək qiymətə (20,4 μmol $CO \cdot m^{-2}s^{-1}$) malik olmasına baxmayaraq, $CO_2$-nin hüceyrələrarası qatılığı ən azdır (277 μmol $CO_2$ $mol^{-1}$). Sultan sortunda isə əksinə fotosintezin sürəti ən aşağı (16,74 μmol $CO_2$ $m^{-2} \cdot s^{-1}$), $CO_2$-nin hüceyrələrarası qatılığı isə ən yüksək qiymət almışdır (318 μmol $CO_2$ $mol^{-1}$). Öyrənilən digər nümunələr üçün də belə uyğunluq müşahidə olunmuşdur. Bunu hüceyrələrarası sahələrdən $CO_2$-nin xloroplastlara diffuziyasının azalması və bunun nəticəsində fotosintezin sürətinin zəifləməsi ilə izah etmək olar. Buğda bitkisi ilə aparılan tədqiqatlarda bu kimi nəticələr alınmışdır (Allahverdiyev və b., 2012).

Respublika əhalisinin ərzaq təhlükəsizliyinin təmin olunması üçün mövcud əkin sahələrindən maksimum istifadə olunmalıdır. Ölkəmizin əkin sahələrinin böyük bir hissəsi isə dəmyə şəraitində yerləşir. Noxud və mərcimək bitkiləri quraqlığa davamlılığı ilə nisbətən fərqlənirlər.

**Cədvəl 1.** Dən dolma fazasında noxud nümunələrində qaz mubadiləsi göstəriciləri

| Nümunələrin adı | Fotosintezin sürəti (μmol $CO_2$ $m^{-2}$ $s^{-1}$) | Ağızcıqların keçiriciliyi (mol $H_2O$ $m^{-2}$ $s^{-1}$) | Hüceyrəarası sahələrdə $CO_2$ qatılığı (μmol $CO_2$ $mol^{-1}$) | Transpirasiya sürəti (mmol $H_2O$ $m^{-2}s^{-1}$) |
|---|---|---|---|---|
| Sanford | 17,5±1,13 | 0,808±0,07 | 316±7 | 6,73±0,51 |
| F.00-19 | 19,4±1,55 | 0,759±0,04 | 301±5 | 7,50±0,34 |
| F.03-36 | 20,4±1,20 | 0,689±0,01 | 277±12 | 7,54±0,89 |
| Sultan | 16,7±0,91 | 0,984±0,05 | 318±6 | 9,06±0,51 |
| Nərmin | 18,9±0,98 | 0,918±0,01 | 311±8 | 8,37±0,42 |

**Cədvəl 2.** Noxud nümunələrinin temperatur və turqoromer göstəriciləri.

| Nümunənin adı | $T_1$ | $T_2$ | $T_2/T_1$ | Temperatur, °C |
|---|---|---|---|---|
| Sanford | 24,0±1,48 | 18,6±0,71 | 0,78 | 31,7 |
| F.00-19 | 22,7±0,56 | 20,3±1,41 | 0,89 | 34,3 |
| Sultan | 28,8±0,35 | 18,0±0,71 | 0,63 | 30,0 |
| Nərmin | 21,7±0,91 | 16,0±5,65 | 0,74 | 30,7 |
| F.97-706 | 26,7±0,56 | 20,3±4,24 | 0,77 | 29,3 |
| F.97-24 | 26,7±0,77 | 22,0±0,71 | 0,82 | 29,7 |
| F.99-25 | 18,7±0,42 | 15,7±3,53 | 0,84 | 29,3 |
| F.03-36 | 26,3±0,14 | 21,7±0,71 | 0,83 | 28,3 |
| F.03-34 | 23,0±0,77 | 19,5±5,3 | 0,84 | 27,3 |
| F.06-143 | 25,0±0,56 | 19,5±0,35 | 0,78 | 28,0 |

**Cədvəl 3.** Mərcimək nümunələrinin temperatur və turqoromer göstəriciləri.

| Nümunənin adı | $T_1$ | $T_2$ | $T_2/T_1$ | Temperatur, °C |
|---|---|---|---|---|
| F.2010-65 | 17,0±5,30 | 15,3±4,24 | 0,8 | 21,5 |
| F.2014-19 | 14,8±3,36 | 10,0±1,53 | 0,7 | 21,1 |
| F.2014-32 | 13,1±0,71 | 10,8±0,35 | 0,8 | 21,3 |
| F.2010-3L | 14,0±1,55 | 11,8±2,47 | 0,8 | 22,7 |
| F.97-040L | 11,2±2,12 | 9,8±1,76 | 0,9 | 23,4 |
| F.2011-5L | 15,0±3,18 | 9,2±1,06 | 0,6 | 22,6 |
| F.2011-3L | 16,5±3,88 | 12,2±2,12 | 0,7 | 22,9 |
| F.2011-6L | 12,3±2,12 | 9,2±1,18 | 0,7 | 23,1 |
| F.2003-52 | 16,7±0,71 | 9,3±0,47 | 0,6 | 24,1 |
| Arzu | 19,0±0,71 | 10,3±0,49 | 0,5 | 23,1 |

Əkin səviyyəsində temperaturun ölçülməsindən müəyən olunmuşdur ki, adi torpağın temperaturu 38°C olduğu halda, noxud əkini sahələrində ayrı-ayrı nümunələr üçün temperatur 27,3-34,3°C arasında dəyişmişdir. F.03-34 nümunəsində bu göstərici 27,3°C, Sanford sortunda isə 31,7°C olmuşdur (cədvəl 2).

Mərcimək nümunələri ilə aparılan ölçmələrdən aşkar olmuşdur ki, torpaqda temperatur 30°C olduğu halda, əkin səviyyəsində temperatur ayrı-ayrı nümunələr üçün 21,1-24,1°C arasında dəyişmişdir. Bu göstərici F.2014-19 nümunəsində ən aşağı-21,1°C, F-2003-52 nümunəsində isə ən yüksək-24,1°C olmuşdur (cədvəl 3).

Beləlikə, ayrı-ayrı nümunələrdə əkin səviyyəsində temperaturun nisbətən aşağı olması onlarda transpirasiya prosesinin sürətlə getməsi ilə izah oluna bilər. Quraqlıq nəticəsində transpirasiyanın aşağı düşməsi yarpağın istilik rejimini pozaraq onun temperaturunu artırır, nəticədə tənəffüs prosesi güclənir və yarpaqda maddələr mübadiləsinin pozulması baş verir.

Bitkilərin fotosintetik aparatının aktivliyi ilə bağlı olan əsas morfo-fizioloji əlamətlərdən biri də xüsusi yarpaq kütləsidir ki, bu da vahid yarpaq sahəsinə düşən quru biokütlənin göstəricisidir. Xüsusi yarpaq kütləsi vasitəsi ilə bitkilər fotosintetik aktiv şüalardan daha səmərəli istifadə etmək üçün öz arxitektonikalarını formalaşdırırlar (Мурей, Шульгин, 1978). Baxmayaraq ki, xüsusi yarpaq kütləsi yüksək irsiliyə malikdir, bu əlamət xarici faktorların təsiri altında dəyişə bilər (Тооминг, Тамметс 1984, Deloney, Dobrens 1974). Xüsusi yarpaq kütləsinin qiymətinə bitkiyə düşən fotosintetik aktiv şüaların miqdarı, əkinin strukturu, bitkinin su ilə təminatı, mineral gübrələrin verilməsi, bitkinin inkişaf mərhələsi, əkində yerləşmə yeri və s. faktorlar təsir edirlər. İşıq radiasiyası az olduqda fotosintezin sürəti ilə yarpaqların kütləsi və ya xüsusi kütləsi arasında müsbət korrelyasiya alınmır. Müsbət korrelyasiya o zaman mümkün olur ki, yarpağın bütöv xloroplastları yaxşı işıqlansın, daha doğrusu fotosintetik aktiv şüalar fotosintezin yüksək səviyyədə getməsini təmin etsin (Тооминг, 1984).

Noxud bitkisi üzərində uzun müddət məhsuldarlığın artması istiqamətində süni seçmə yolu ilə aparılan tədqiqatlarda müəyyən olunmuşdur ki, bitkilərin məhsuldarlığının artması, eyni zamanda onlarda xüsusi yarpaq kütləsinin artmasına gətirib çıxartmışdır (Амелин, 2012). Xüsusi yarpaq kütləsinə quraqlıq stresi də təsir edir. Bəzi tədqiqatlardan (Liu, Stutzel 2004) aydın olmuşdur ki, quraqlıq stresi xüsusi yarpaq kütləsini azaltmış, ancaq müxtəlif genotiplər su srtesinə müxtəlif cür reaksiya vermişlər.

Xüsusi yarpaq kütləsinin vegetasiya dövrü ərzində dəyişməsini izləmək üçün 10 noxud və 10 mərcimək nümunəsi seçilmişdir. Cədvəl 4 və 5-dən göründüyü kimi, vegetasiyanın əvvəlindən başlayaraq hər iki bitki xüsusi yarpaq kütləsinə görə bir-birindən fərqlənirlər (cədvəl 4 və 5). Vegetasiyanın əvvəlində bu göstəricinin ən böyük qiyməti noxud nümunələri arasında daha iriyarpaqlı olan Sanford sortunda müşahidə olunmuşdur. Bu göstəricinin ən kiçik qiyməti isə bu fazada F.99-25 sortunda aşkar olunmuşdur.

**Cədvəl 4.** Noxud nümunələrində xüsusi yarpaq kütləsinin vegetasiya dövründə dəyişməsi (q/dm$^2$).

| Nümunələrin adı | Vegetasiya dövrü | | | | |
|---|---|---|---|---|---|
| | 15.05.2014 | 22.05.2014 | 29.05.2014 | 06.06.2014 | məhsuldarlıq, s/ha |
| Sanford | 0,44 | 0,45 | 0,49 | 0,89 | 6,7 |
| F.00-19 | 0,41 | 0,47 | 0,51 | 0,94 | 10,8 |
| Sultan | 0,41 | 0,44 | 0,69 | 1,21 | 11,4 |
| Nərmin | 0,30 | 0,43 | 0,68 | 1,22 | 11,5 |
| F.97-706 | 0,38 | 0,55 | 0,64 | 1,13 | 10,9 |
| F.97-24 | 0,34 | 0,45 | 0,66 | 1,01 | 7,9 |
| F.99-25 | 0,29 | 0,40 | 0,59 | 0,96 | 8,4 |
| F.03-36 | 0,32 | 0,52 | 0,65 | 1,03 | 7,2 |
| F.03-34 | 0,36 | 0,52 | 0,58 | 1,04 | 8,4 |
| F.06-143 | 0,39 | 0,51 | 0,58 | 1,03 | 7,2 |

**Cədvəl 5.** Mərcimək nümunələirində xüsusi yarpaq kütləsinin vegetasiya dövründə dəyişməsi (q/dm$^2$)

| Nümunənin adı | Vegetasiya dövrü | | | | |
|---|---|---|---|---|---|
| | 01.04.2014 | 15.04.2014 | 25.04.2014 | 06.05.2014 | məhsuldarlıq, s/ha |
| Arzu | 0,21 | 0,35 | 0,53 | 0,38 | 7,7 |
| F.2010-65 | 0,22 | 0,35 | 0,71 | 0,52 | 20,0 |
| F.2010-19L | 0,32 | 0,35 | 0,66 | 0,47 | 8,3 |
| F.2011-15 | 0,33 | 0,34 | 0,56 | 0,53 | 10,3 |
| F.2010-8L | 0,36 | 0,40 | 0,44 | 0,43 | 8,9 |
| F.97-040L | 0,35 | 0,40 | 0,42 | 0,37 | 9,0 |
| F.2011-5L | 0,38 | 0,41 | 0,68 | 0,59 | 11,8 |
| F.2011-3L | 0,27 | 0,32 | 0,53 | 0,50 | 8,5 |
| F.2011-6L | 0,27 | 0,37 | 0,53 | 0,51 | 10,4 |
| F.2003-52 | 0,34 | 0,37 | 0,50 | 0,45 | 9,8 |

Mərcimək nümunələri arasında bu göstəricinin ən böyük qiyməti vegetasiyanın əvvəlində daha iriyarpaqlı olan F.2011-5L nümunəsində müşahidə olunmuşdur. Görünür daha iri yarpaqlı nümunələr fotodintetik aktiv şüalardan maksimum istifadə edərək vahid sahədə daha böyük biokütlə formalaşdırırlar.

Vegetasiyanın çiçəkləmə fazasında bitkilərin yan budaqları əmələ gəlməyə başlayır, bu zaman bitkilərin assimilyasiya səthinin sahəsi daha da artır. Daha çox fotosintetik aktiv şüalar qəbul edən orta yarus yarpaqları tam formalaşmağa başlayır, amma hələ tam formalaşmış vəziyyətdə olmurlar. Bu fazada tədqiq olunan nümunələrdə xüsusi yarpaq kütləsi nisbətən artmışdır. Tədqiq olunan nümunələr arasında noxudun rayonlaşmış Nərmin və Sultan sortlarında, mərcimək nümunələrindən isə F.2010-8L, F.97-040L, F.2011-5L iriyarpaqlı nümunələrdə xüsusi yarpaq kütləsi daha böyük olmuşdur. Dənin dolması fazasında əvvəlki tədqiqatlarımızda göstərdiyimiz kimi, istər noxud, istərsə də mərcimək nümunələri assimilyasiya səthinin maksimal qiymətinə çatırlar.

Məlum olmuşdur ki, dəndolma fazasında xüsusi yarpaq kütləsi istər noxud, istərsə də mərcimək nümunələrində özünün maksimal qiymətinə çatır. Bu fazada xüsusi yarpaq kütləsi noxudun Sultan və Nərmin nümunələrində, mərciməyin isə F.2010-65, F.2011-15 və F.2011-5L nümunələrində daha böyük olmuşdur. Eyni zamanda, xüsusi yarpaq kütləsi böyük olan bəzi noxud və mərcimək nümunələrində məhsuldarlıq da yüksək olmuşdur (cədvəl 4 və 5). Beləliklə, vegetasiya dövrü ərzində noxud və mərcimək nümunələrinin xüsusi yarpaq kütləsi özünün maksimal qiymətinə dəndolma fazasında çatır, yüksək məhsuldar sortların alınması prosesində seleksiyada bəzi fizioloji göstəricilərin (yüksək fotosintez sürəti, xüsusi yarpaq kütləsi) nəzərə alınması məqsədəuyğun hesab olunur.

Yekun olaraq, aparılan uzunmüddətli fizioloji və seleksiya tədqiqatları nəticəsində noxudun məhsuldar, xarici mühit amillərinə davamlı “Sultan” və “Nəzrin”, mərciməyin isə “Zəfər” sortları yaradılmışdır. “Sultan” sortu artıq rayonlaşmış, “Nəzrin” və “Zəfər” sortları isə Bitki Sortlarının Qeydiyyatı və Toxuma Nəzarət üzrə Dövlət Xidmətinə rayonlaşmaq üçün təqdim olunmuşdur.

## ƏDƏBİYYAT

**Allahverdiyev T.I, Zamanov A.A, Təlai C.M.** (2012) Quraqlıq zamanı yumşaq buğda genotiplərinin yarpaqlarında qaz mübadiləsinin öyrənilməsi. *AMEA-nın Xəbərləri (biol. və tibb elm.)*, **67(1):** 147-154.

**Абдулбагиева С.А., Талаи Дж.М., Тамразов Т.Г.** (2007) Изучение засухоустойчивости сортов пшеницы в различных экологических зонах Азербайджана. Материалы VII Межд. Симп. *«Новые и нетрадиционные растения и перспективы их использования»*. Москва, **2:** 20-23.

**Алиев Д.А.** (1983) Современное представление об идеальной пшенице. *Изв. АН.Аз.ССР (серия биол. наук)*, **№3:** 3-14.

**Амелин А.В.** (2012) Физиологические основы селекции гороха *Жр.Зернобобовые и крупяные культуры*, **№1:** 46-52.

**Безменова М.Ф., Сорокопудов В.Н., Реза-нова Т.А.** (2010) Некоторые аспекты адапта-ции видов черемухи (*Padus* Mill) в условиях Белегорья. *Научные ведомости (серия естеств. науки)* (Белгород), **№15(86) (вып. 12):** 66-71

**Калинина М.Ф., Андреева А.Ф.** (1991) Связь показателей водного режима сортов яровой пшеницы с их засухоустойчивостью. *Матер. Всес. Науч. Конфер. пос. хим. биотехнол.* Целеногорад.

**Кушниренко М.Д.** (1991) Физиология водообмена и засухоустойчивости растений. Кишинев: Штиница, 307 с.

**Мурей И.А., Шульгин И.Ф.** (1978) Физиологический анализ приходящей ФАР к растению. *Бот. журнал*, **63(№7):** 962-973.

**Расулов Б.Х., Асроров К.А.** (1982) Зависимость интенсивности фотосинтеза различных видов хлопчатника от удельной поверхностной плотности листа. *Физиология фотосинтеза*. М.: Наука, с. 270-283.

**Тооминг Х.Г.**(1984) Экологические принципы максимальной продуктивности посевов. Л.: Гидрометеоиздат, 264 с.

**Тооминг Х.Г., Тамметс Т.Х.** (1984) Связь удельной поверхностной плотности листьев некоторых видов растений с радиацией приспособления и режимом ФАР. *Физиология растений*, **31(вып. 2):** 258-265.

**Araus J.L., Slafer G.A., Royo C., Serret M.D.** (2008) Breeding for yield potential and stress adaption in cereals. *Critical Reviews in Plant sci.,* **27:** 377-412.

**Anjum S.A., Xie X.Y., Wang L.C., Saleem M.F., Man C., Lei W.** (2011) Morphological physiological and biochemical responses of plants to drought stress *African Journal. Of Agricultural Research*, **6(9):** 2026-2032.

**Deloney R.R., Dobrens A.K.** (1974) Morphological and anatomical features of alfalfa leaves as releted to $CO_2$ exchange. Crop Sci., **14(3):** 444-447.

**Dharmendra S., Harsh K,. Rajendra S. (**2013) A new phenotyping technique for screening for drought tolerance in lentil (*Lens culinaris* Medik). *Plant Breeding*, **132:**185-190.

**Krishnamurthy L., Kashiwagi J., Gaur P.M., Upadhyaya H,D. Vadez V.** (2010) Sources of tolerance to terminal drought in the chickpea (*Cicer arietinum* L.) minicore germplasm. *Field Crop Reserach*, **119:** 322-330.

**Liu F., Stutzel H.** (2004) Biomass partitioning leaf area, and water use officiency of vegetable amarant (*Amaranthus* spp) in response to drought stress. *Scientia Horticulturea*, **102:**15-27.

**Masoumeh P., Ramazan A., Javad M., Farzaneh N., Foad M.** (2013) Effeciency of screening criteria for drought tolerance in chickpea. *Archives of Agronomy and soil science*, **59(12):** 1675-1693.

**Salehi M.** (2012) The study of drought tolerance of Lentil (*Lens culinaris* Medik.) in seedling growth stages. *Int. J. of Agronomy and Plant production*, **3:** 38-41.

**Sayyed H.S., Ali Akbar M., Ali Saeed, Masood K, Molhotra R.S.** (2006) Study on chickpea drought tolerance lines under dryland condition of Iran. *Indian J.Grop Science*, **1(1-2):** 70-73.

**Ulemale C.D., Mate S.N, Deshmukh** (2013) Physiological Indices for Drought Tolerance in chickpea (*Cicer arietinum* L.). *World J. of Agric. Sci.*, **9(2):** 123-1331.

## Изучение Некоторых Физиологических Показателей Пищевых Зернобобовых Культур

**Р.С. Мирзоев, Л.А. Амиров, Т.И. Аллахвердиев**

*Научно-исследовательский институт земледелия МСХ Азербайджанской Республики*

Определены интенсивность фотосинтеза, устьичная проводимость, концентрация $CO_2$ в межклеточных пространствах, скорость транспирации и удельная масса листьев, а также температура растительного покрова. Некоторые физиологические параметры (высокая скорость фотосинтеза, удельная масса листьев) могут быт использованы в создании высокопродуктивных образцов нута и чечевицы.

***Ключевые слова:*** *Нут, чечевица, газообмен, удельная масса листьев, урожайность, сорт*

**Study Of Some Physiological Parameters Of Food Legumes**

**R.S. Mirzayev, L.A. Amirov, T.I. Allahverdiyev**

*Research Institute of Crop Husbandry, Ministry of Agriculture of the Republic of Azerbaijan*

The rate of photosynthesis, stomatal conductance, intercellular $CO_2$ concentration and transpiration rate, as well as leaf specific mass and the canopy temperature were studied in chickpea and lentil plants. Some physiological traits (high photosynthesis rate, leaf specific mass) can be used as selection criteria for the creation of productive chickpea and lentil varieties.

***Keywords:*** *Chickpea, lentil, gas exchange, leaf specific mass, productivity, variety*

# Tiol Birləşmələrin Yüksək Dərəcəli Güləşçilərin Qanındakı Qlütationun MiqdarınaTəsiri

**S.A. Əliyev**

*Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası,Fətəli xan Xoyski küç., 98a, Bakı AZ1110, Azərbaycan; E-mail:Saadat.aliyev@mail.ru*

**Məqalədə idmançıların qanında qlütationun maddələr mübadiləsindəki rolu və yeri, onun ümumi və reduksiya olunmuş formasının miqdarı ilə bağlı məsələlər öz əksini tapmışdır. Tədqiqatda bilavasitə yarışlara hazırlıq mərhələsində olan 18 idmançı (18-22 yaş) iştirak etmişdir. Əsas eksperimentdən əvvəl idmançıların qanında ümumi qlütationun miqdarı və onun antioksidant xüsusiyyətə malik bərpa olunmuş növlərinin qatılığı müəyyən edilmişdir. Qanda qlütationun miqdarının korreksiyası üçün iki metabolik kompleksdən istifadə edilmişdir. Birinci kompleksin tərkibində qlütationun əmələ gəldiyi amin turşulardan ibarət olmuşdur. İkinci kompleksdə - kreatinfosfatın sələfi olan maddələr iştirak etmişdir. İdmançılar bu komplekslərdən üç həftə müddətində istifadə etmişdilər. Onların qanındakı qlütationun səviyyəsinə onun əmələ gəldiyi amin turşuların istifadə olunması daha effektiv təsirə malik olmuşdur. Müəyyən edilmişdir ki, qlütation sistemin vəziyyətinin korreksiyasının yollarından biri kükürdlü birləşmələrin, o cümlədən tiol antioksidantlardan istifadə etməkdir.**

***Açar sözlər:*** *İdmançılar, güləşçilər, cüdocular, SH-qrup, qlütation, N-asetilsistein, tiollar, antioksidantlar, metabolizm*

## GİRİŞ

Məlum olduğu kimi, əzələ aktivliyinin artması oksigen nəqlinin və onun əzələlər tərəfindən sərfinin yüksəlməsinə, mitoxondrilərin, miokard və skelet əzələlərinin sarkoplazmatik retikulumunun liflərinin funksiyalarının yüksəlməsi ilə qarşılıqlı əlaqədə olur.Bununla əlaqədar olaraq fiziki yüklələmələrin yerinə yetirilməsi toxumalara, bioloji membranlara, nuklein turşuları və zülal makromolekullarına dağıdıcı təsir göstərən sərbəst radikalların yaranmasının intensivləşməsi müşahidə olunur (Ткаченко, 1999).

Antioksidant (AO) mexanizmlərin funksional gərginliyi və onların potensial imkanları haqqında dərin təsəvvürlər əldə etmək üçün onun ayrı-ayrı hissələrinin funksional xüsusiyyətlərini öyrənmək lazımdır. Onu da qeyd etmək lazımdır ki, bu sistemlərin funksional vəziyyətini korreksiyası üçün farmakoloji vasitələrini müəyyən edilməsi və onlardan istifadə yollarını araşdırmaq lazımdır. Bu zaman aparılan korreksiyasının əsas məqsədi orqanizmin gərgin fiziki yükləmələrə qarşı dözümlüyünü artırmaqla, artan fiziki gərginlik nəticəsində lipidlərin peroksidli oksidləşməsinin prosesinin (POL) qarşısını almaqdır. Çünki əzələ aktivliyin artması hüceyrə membranında çoxlu sayda sərbəst radikaların yaranmasına rəvac verir. Gərgin fiziki iş zamanı antioksidant (AO) müdafiyə sistemi funksiyası sıxışdırılır, onların potensial imkanlarının artırılması üçün yeni üsulların araşdırılmasına yönəldilmiş tədqiqatlar idmançıların fiziki iş qabiliyyətini artırmağa şərait yaradır (Барабой и др., 1992).

Bir çox müəlliflərin tədqiqatlarının nəticələri göstərmişdir ki, AO müdafiə sistemin funksiyalarında adaptatiya prosesdə kiçikmolekullu və yüksəkmolekulu tiol birləşmələri aparıcı rol oynayır (Альциванович, 2001, Булыгина и др., 2009). Tiol birləşmələri sərbəst radikalları zərərsizləşdirərək hüceyrənin sitoplazmasında və ya qanın plazmasında özmüdafiə funksiyasını yerinə yetirir. Bioloji molekulların funksional qruplarını və hüceyrə membranlarını oksigenin aktiv radikallarının təsirindən qorumaq üçün ilk növbədə orqanizmdə olan tiol birləşmələri onların hücumlarına məruz qalırlar. Əzələ təqəllüsündə, hüceyrələrin bölünməsində, oksidləşdirici fosforlaşmada, peroksid oksidləşmədə, fotosintez prosesində, radioaktiv zədələmələrdə, sinir fəaliyyətində, o cümlədən neyromediatorların təsiri zamanı toil qruplarının mühüm rolunu təsdiqləyən məlumatda öz əksini tapmışdır (Gutman, 2002; Гаджиев и др., 2014; Агаева, 2016).

Antioksidant müdafiə sisteminin əsas tərkib hissəsi lipidlərin peroksidlərinin neytrallaşdıran və zülallarda –SH qruplarının reduksiya olunmuş vəziyyətini qoruyan, onların funksional fəallığını təmin edən qlütation sistemi təşkil edir. Qlütation qara ciyər, ürək, ağ ciyər və qan hüceyrələrinin antioksidant sistemlərinin əsas komponentidir. Qlütation əvəz olunmayan maddə deyil və L-sistein aminturşusundan, L-qlutamin turşusundan və qlisindən sintez oluna bilər. İnsan orqanizminin bütün hüceyrələri qlütationu sintez edə bilir, qara ciyərdəki qlütationsintetaza fermenti üçün isə o artıq dərəcədə vacibdir (Земцова и др., 1999).

*Tədqiqatın məqsədi* - qlütationun və kreatinfosfatın sələfləri olan amin turşularından ibarət metabolik komplekslərin istifadəsi zamanı dərəcəli cüdoçuların qanında qlütationun ümumi miqdarının və onun oksidləşmiş və reduksiya olunmuş formalarının miqdarının artmasının effektivliyini müqayisə etməkdən ibarət olmuşdur.

Qlütationun əsas xüsusiyyəti ondan ibarətdir ki, o ancaq hüceyrənin özü tərəfindən sintez olunmalıdır. Qlütationu həb və ya toz şəklində qəbul etməyin mənasız olduğu haqqında fikirlərdə irəli sürülür və bunu onun həzm traktında dağılması ilə əlaqələndirirlər. Qidaların tərkibində sistein, qlutamin turşusu, qlisin amin turşuların və qida əlavələrin daxil edilməsi ilə zənginləşdirilməsi qlutationun sintezi üçün zəmin yaradır (Мазо, 1988).

Qlütationun sələflərindən biri sistein amin-turşusudur. Bu amin turşu $B_6$ vitaminin mütləq istirakı ilə orqanizmdə L-metionindən yaranır. Sisteminin əvəzinə sistin və ya asesilsistein istifadə etmək olar. Sistin və ya qlütationun özündən fərqli olaraq N-asesilsistin orqanizmdə qlütationun səviyyəsini daha effektiv olaraq qaldırır. Tədqiqatlar göstərmişdir ki, qlütationdan fərqli olaraq N-asesilsistin orqanizmdə qlütationun miqdarının artmasına daha effektiv təsir göstərir, çünki daxilə qəbul edilən qlütationun çox hissəsi həzm traktında dağılır (Stromme and Flaim, 2008). Məşq və yarış yükləmələri icrası prosesində intensiv şəkildə yaranan sərbəst radikallara qarşı N-asesilsisteindən daha effektiv mübarizə vasitəsi kimi istifadə etmək olar. Alman alimi müəyyən etmişdir ki, həftədə 3 dəfə 400 mq dozada qəbul edilən N-asesilsistin əzələlərdə zülalların sintezini intensivləşdirməyə, əzələlərin həcminin və gücün göstəricilərini artırmağa qadirdir (Александрова и др., 2009).

V.L.Smulskinin apardığı tədqiqatlarda tiol preparatlarının gərgin əzələ fəaliyyəti zamanı iş qabiliyyətinə və bərpa proseslərinə effektiv təsiri öz əksini tapmışdır. Qeyd edilir ki, gərgin fiziki yükləmələrdən əvvəl tiol preparatlardan istifadə olunması ferment və zülalların endogen SH-qruplarının oksidləşməsinin qarşısını alır, idmançı orqanizminin ehtiyat imkanlarını genişləndirir, iş qabiliyyətini aşağı düşməsi haqqında xəbərdarlıq edir və ya onu ləngidir (Березов и Коровкин, 1998). Doktor M.Atalay fin alimləri ilə birlikdə qlütationun və N-asesilsisteinin qəbulunun immun sisteminə müsbət effektli təsirini (Гончарова, 2003), məşq tapşırıqlarından sonra bərpa vaxtının azalmasını, əzələ yorğunluğunun və xəstəliklərin azalmasını, eyni zamanda idman nəticələrinin yaxşılaşmasını göstərmişdir (Соколовский, 1988). İllinoys Universitetinin bir qrup tədqiqatçıları (Atalay et al., 1996) oksidativ stress zamanı zədələnmiş hüceyrələrin bərpasında qlütationun rolunu qiymətləndirmək məqsədi ilə tədqiqat aparmışlar. Orqanizmin ayrı-ayrı hissələrində qlütationun miqdarının dəyişilməsi, qlütationun toxumalar arasında yerdəyişməsi və qlütationun miqdarından fiziki yükləmələrin intensivliyindən, idman formasından və qidalanmanın tipindən asılılığı müəyyən edilmişdi. B.Dufaux və O.Heine (1997) uzaq məsafəyə qaçış zamanı və bərpa prosesində qlütationun səviyyəsini təyin etmişdi. Qlütationun sərf olunmasının artması immunitetin zəifləməsinə səbəb olmuşdur. Qlütationun səviyyəsinin bərpa olunması bir neçə saatla bir neçə günə qədər davam etmişdir. Digər idman növlərində də idmançıların orqanizminın toxumalarında qlütationun səviyyəsinin azalması müəyyən edilmişdir (Кулинский и Колесниченко, 2009).

Bütün bunları nəzərə alaraq, intensiv məşqlər zamanı qlütationun səviyyəsini artıran qida əlavələrinin qəbul edilməsi məqsədə uyğundur. Bununla bağlı İspaniyanın Valensiya Universitetinin əməkdaşı C.Sastr və başqaları heyvanlar üzərində apardıqları tədqiqatlarda vitamin C və NAS-dan (qlütationun səviyyəsini artıran kimyəvi preparat) istifadə etməklə oksidativ stress zamanı toxumaların zədələnməsi zəiflədiyini, qanda qlütationun səviyyəsinin sabit saxlağandığını göstərmişlər (Chen, 2007). Kaliforniyalı doktor S.K.Senon və həmkarları göstərmişlər ki, qlutatinonun yüksək səviyyəsi bir çox antioksidantların fəaliyyətini yaxşılaşdırır, aşağı səviyyəsi isə onların effektivliyini azaldır. Tədqiqatlarda xüsusi preparatdan istifadə edərək qəsdən qlütationun səviyyəsini aşağı salmış və nəticə etibarı ilə eksperimental heyvanlarda fiziki yükləmələrə qarşı yaranmış dözümlülük 50% azalmışdır (Dufaux and Heine, 1997).

Qlütationun sələflərini istifadə etməklə əzələ qüvvəsinin artırılmasına dair Monrealın MakQill Universitetin doktoru Lari Lende və əməkdaşları göstərmişlər ki, oksidativ stress əzələ yorğunluğunu yaradır. Bunun üçün idmançılara 3 ay ərzində immunokal (tərkibində süd-zərdabı olan inşaat bloku olan qlütation) verilmişdir. Bu müddət ərzində maksimal güc və maksimal iş qabiliyyəti aşkarlanmışdır (dözümülüyün və qüvvənin indikatorları). Bu prepatatın təsiri altında alınan nəticələr 10-15% yüksəlmişdir.

Orqanizmin tiol-disulfid vəziyyətinə başqa kükürdlü birləşmələr də (məsələn metionin) təsir göstərə bilər. Metionin insan orqanizmində sintez olunmayan əvəzolunmayan amin turşusudur. O, adrenalinin, kreatinin və başqa bioloji vacib birləşmələrin sintezində iştirak edir, hormonların, vitaminlərin ($B_{12}$, askorbin və fol turşuların) və fermentlərin fəaliyyətini aktivləşdirir. Metionin zülal və lipid mübadiləsini tənzimləmək üçün istifadə olunur, qanda xolesterinin miqdarının azalmasına imkan yaradır, qara ciyərdə piylərin yığılmasını azaldır və qara ciyərin funksiyasini yaxşılaşdırır, mülayim antidepressiv təsir göstərə bilir (Аскеров и др., 2011а, 2011б).

Orqanizmin AO-sisteminin tiol–disulfid həlqəsinin funksional vəziyyətini öyrənən zaman, əsas fikir fermentlərin (qlütationperoksidaza və qlütationprediktaza) fəallığınn, toxumalarda qlütationun ümumi miqdarının, onun oksidləşdirilmiş və reduksiya edilmiş formalarının mütənasibliyinin, eyni zamanda –SH və –S–S– qrupların miqdarının və mütənasibliyinin öyrənilməsinə yönəldirilir. O da məlumdur ki, qanda –SH qrupun əsas hissəsini (95%) qlütationun –SH qrupları təşkil edir. Onda qanda onun ümumi miqdarına, eyni zamanda oksidləşdirilmiş və reduksiya edilmiş formalarının miqdarına görə idmançılarının orqanizminin tiol–disulfid hissəsinin vəziyəti haqqında mühakimə irəli sürmək olar.

Fiziki yükləmələrin təsiri altında AO-sistemində baş verən adaptasiya dəyişikliklərinin mürəkkəb xüsusiyyətini qlütationun qanda olan balansına görə qiymətləndirilən zaman orqanizmin AO-sisteminin tiol–disulfid hissəsinin vəziyyətinin dinamikası əksini tapmalıdır. Bu fikri V.L.Smulskinin (Березов и Коровкин, 1998), N.V.Tkaçenkonun (Гаджиев и Алиев, 2016) və başqa müəlliflərin (Chen, 2007; Gutman, 2002) əldə etdiyi nəticələr təsdiq edirlər. Gərgin əzələ fəaliyyəti zamanı qanda olan tiol qruplarına tələbatın artması ilə əlaqədar olaraq onların miqdarının müəyyən edilməsi, ümumi qlütationun və onun oksidləşmiş və reduksiya edilmiş formalarının miqdarının müəyyən edilməsi, idmançının orqanizminin funksional vəziyyətinin diaqnostikasının, fiziki yükləmələrin təsirinə qarşı adaptasiyasının və fiziki iş qabiliyyətinin korreksiyasının qiymətləndirilməsi üçün tətbiq olunan vasitələr kompleksində istifadə olunan üsullardan biridir. Nəzəri və praktik qaynaqlara əsaslanaraq demək olar ki, yuxarıda qeyd edilmiş məlumatlar tədqiqatın aktuallığını bir qədər də artırır.

## TƏDQİQATIN MATERİALI VƏ METODU

Tədqiqatda yarışlara hazırlaşan 15 cüdoçu (18÷23 yaşlı) iştirak etmişdir. Birinci tədqiqat qrupun idmançıları 3 həftə ərzində qlütationun sələfləri olan (qlisin, sistein, qlutamin turşusu) amin turşularından ibarət metabolik kompleksdən istifadə etmişlər (bax: cədvəl). İkinci tədqiqat qrupun idmançıları kreatinfosfatın sələfləri olan metabolik kompleksdən istifadə edirdilər. Nəzarət qrupun idmançıları nişasta həblərindən istifadə edirdilər.

M.S.Çulkovanın modifikasiyasında Vudvord və Freyin üsulundan istifadə edərək əsas tədqiqata qədər və ondan sonra cudoçuların kapilyar qanında qlütationun həm ümumi həm oksidləşmiş və həm də reduksiya olunmuş formasının miqdarını müəyyən edilmişdir (Аскеров и др., 2011). "Dr.Lange, Almaniya" firmasının istehsalı olan hazır reaktivlərdən istifadə edərək LP-420 fotometrdə kapilyar qanda eritrositlərin miqdarını müəyyən edirdilər.

**Cədvəl.** Metabolik komplekslər

| Komponentlər | Səhər yeməyi | Nahar | Şam |
|---|---|---|---|
| **Birinci metabolik kompleks** | | | |
| Qlutamin turşusu (yeməkdən 30 dəq əvvəl) | 2 həb | 2 həb | - |
| ACC (yeməkdən sonra) | 1 həb | 1 həb | - |
| Qlisin (yeməkdən sonra dilin altına) | 1 həb | 1 həb | 1 həb |
| **İkinci metabolik kompleks** | | | |
| Metionin (yeməkdən 30 dəq əvvəl) | 2 həb | 2 həb | 2 həb |
| Qlisin (yeməkdən sonra dilin altına) | 1 həb | 1 həb | 1 həb |
| Arqinin | Məşqdən əvvəl 1 kapsul | | |

Alınan nəticələrin statistik işlənməsi standart kompyuter proqramlarından istifadə edərək həyata keçirilmişdir.

***Alınan nəticələr***

Qlütationun AO-sistemin funksional vəziyyətinin tənzimlənməsinin çoxsaylı yolları arasında, aşağıda verilən sxem üzrə qlütationun AO-sisteminin vəziyyətini korreksiya edən tiol birləşmələrinin (sistein, metionin, suksimer və s.) istifadəsi xüsusi diqqət cəlb edir (Алиев и Агаева, 2012):




Əldə etdiyimiz məlumatlara əsasən,gərgin fiziki fəaliyyətin cudoçuların kapilyar qanında ümumi qlütationun və onun reduksiya olunmuş formasının miqdarının azalmasına səbəb olduğuna görə belə korreksiyanın aparılmasının məqsədəuyğun olduğu hesab olunur (cədvəl 1). Əldə etdiyimiz nəticələrə əsasən müəyyən edilmişdir ki, tədqiqatda iştirak edən idmançıların qanında qlütationun ümumi miqdarı və onun reduksiya olunmuş formasının miqdarı idmanla məşqul olmayan şəxslər üçün müəyyən edilmiş fiziki normaların ən aşağı həddindədir (ümumi – 32-35 mq·100 ml, reduksiya olunmuş – 20-30 mq·100 ml), bu da yarışlara hazırlıq mərhələsi üçün yolverilməzdir.

**Cədvəl 1.** Yüksək dərəcəli cudoçuların qanında (n=12) qlütationun ümumi, oksidləşdirilmiş və reduksiya olunmuş formalarının miqdarının ilkin göstəriciləri

| Qlütation, mq·100 ml | | |
|---|---|---|
| **Ümumi** | **Reduksiya olunmuş** | **Oksidləşdirilmiş** |
| 32,0±2,5 | 20,0±3,1 | 12,0±1,2 |

Qlütationun miqdarının aşağı göstəriciləri orqanizmin AO-sisteminin bütün funksiyalarını pozaraq, idmançıların immunitetinin və fiziki iş qabiliyyətinin aşağı enməsinin səbəblərindən biridir. Belə

olduqda, tərkibində kükürd birləşmələri, o cümlədən ekzogen anti-oksidantların, köməyi ilə qlütation sisteminin vəziyyətinin korreksiyası mümkündür (Мазо, 1988).

Son illərdə idman praktikasında idmançıların orqanizminin AO-potensialını artırmaq və əzələ kütləsini artırmaq (dopinqlərə alternativ olaraq) məqsədi ilə tiol birləşmələrindən, xüsusi ilə də N-asesilsisteinin (ASS), istifadəsi haqqında bir sıra məlumatlar dərc olunmuşdur [Александрова Л.А., 2009]. Preparatin bu xüsusiyyətindən istifadə edərək verilən komplekslərin birinin tərkibinədaxil edilmişdir və hər iki kompleksin qlütasionun vəziyyəti vasitəsi kimi öyrənilmişdir. Qlütasionun sələflərinə (qlütamin turşusu, qlisin və ASS) və kreatinfosfatın sələfləri (metionin, qlisin, arqinin) güləşçilərin və qan göstəricilərinin metabolizmini və onların effektliyinin müqaisəli təhlili aparılmışdır. Yüksək dərəcəligüləşçilər tərəfindən üç həftə ərzində qəbul edilən metabolik komplekslərdən sonra alınan göstəricilər cədvəl 2-də verilmişdir.

**Cədvəl 2.** Yüksək dərəcəligüləşçilərin qanında qlütationun müxtəlif formalarının miqdarına təsir edən kükürdlü birləşmələrdən ibarət biokorrektorlarının qəbulunun təsiri (mq·100 ml) (M±m)

| **İdmançı qrupları** | **Qlütation, mq·100 ml$^{-1}$** | | |
|---|---|---|---|
| | **ümumi** | **reduksiya olunmuş** | **oksidləşmiş** |
| 1 (nəzarət) | 32,5±3,2 | 22,1±3,3 | 10,4±1,2 |
| 2 (qlisin, qlutamin turşusu, ASS) | 50,3±2,5*** | 39,2±3,5** | 11,1±1,4 |
| 3 (metionin, qlisin, arqinin) | 45,2±2,1** | 35,2±2,5** | 10,0±1,5 |

**Qeyd:** 1 qrupla muqayisədə: ** - p<0,01 ; ***- p<0,001.

Nəzarət qrupundan olan idmançılarla müqaisədə digər iki eksperimental qrupun iştirakçıların qanında ümumi və reduksiya olunmuş qlütationun mütləq miqdarı əhəmiyyətli dərəcədə artmışdır (p<0,05). Bütün qrupların idmançılarının qanında qlütationun oksidləşmiş formasının miqdarı isə demək olar ki fərqlənməmişdir.

Qeyd etmək lazımdır ki, qanda ümumi qlütationun və onun reduksiya olunmuş formasının miqdarına qlütationun sələfləri olan amin turşuların kompleksi daha effektiv təsir göstərir. Əldə olunmuş göstəricilər digər tədqiqatların göstəriciləri ilə təsdiqlənir. Onlar, tiol tripeptidlərdən və digər kükürdlü birləşmələrdən fərqli olaraq, qlütationun sələfləri olan amin turşuların kompleksindən istifadə edərək qanda qlütationun ümumi miqdarını daha effektiv artdığını qeyd edirlər (Мазо, 1988; Stromme and Flaim, 2008).

Qanda qlütationun müxtəlif formalarının və eyni zamanda ümumi qlütationun və eritrositlərin miqdarının müəyyən edilməsi maraq doğurur. Normal vəziyyətdə adi məşq etməyən insanların kapilyar qanında bu mütənasiblik 6,0-9,3 civarında olduğu halda, eksperimental qruplarda belə göstəricilər alınmışdır: "nəzarət" – 6,4; 2-ci qrupda – 9,8; 3-cü qrupda – 9.9 (cədvəl 3).

**Cədvəl 3.** Biokorrektorlardan istifadə zamanı idmançıların qanında qlütationun müxtəlif formalarının göstəriciləri. *- p<0,05; ***-p<0,001

| **Idmançı qrupları** | **Qlütation formalarınnın nisbəti** | | |
|---|---|---|---|
| | **OQ:RQ** | **RQ:ÜQ** | **ÜQ: QE** |
| 1 (nəzarət) | 0,47 | 0,66 | 6,46 |
| 2 (qlisin, ASS, qlutamin turşusu) | 0,28* | 0,77* | 9,96*** |
| 3 (metionin, qlisin, arqinin) | 0,28* | 0,77* | 9,82*** |

**Qeyd:** OQ – oksidləşmiş, RQ – reduksiya olunmuş, ÜQ – ümumi qlütation formaları, QE – qandakı eritrositlər.

Əgər "nəzarət" qrupunda bu göstərici mütənasibliyin aşağı həddinə uyğundursa, onda 2-ci və 3-cü qruplarda bu göstəricilər, eritrositlərin qanda olan ümumi miqdarına görə deyil, idmançıların istifadə etdikləri biokorrektorların təsiri altında qlütationun ümumi miqdarının artmasının hesabına əhəmiyyətli dərəcədə yüksəlmişdir.

Əldə olunmuş nəticələrdən görünür ki, qlütation sistemin vəziyyətini korreksiya etmək üçün fərqli kükürdlü komplekslərdən istifadə edən iki eksperimental qrupun idmançılarında qlütationun oksidləşmiş və bərpa edilmiş formalarının və eyni zamanda ümumi və bərpa edilmiş qlütationun mütənasibliyi demək olar ki eynidir. Tiol birləşmələrin qəbulunun təsiri altında qlütationun oksidləşdirilmiş formasının miqdarının artması qiymətində öz əksini tapdı - qlütationun oksidləşmiş: bərpa edilmiş formasının mütənasibliyində – bu göstərici nəzarət qrupdan aşağadır, bərpa edilmiş:ümumi qlütation mütənasibliyində isə qanda bu tripeptidin reduksiya olunmuş formasının miqdarının artması hesabına nəzarət qrupundan yüksəkdir. Buna baxmayaraq, qlütationun sələfləri olan amin turşularının təsiri altında (2 qrup) qanda qlütationun ümumi miqdarı və onun oksidləşdirilmiş forması həm 3 qrupun idmançılarının nəticələrinə, həm də "nəzarət"dən istifadə edən qrupa nisbətən olduqca çox artdı (cədvəl 2).

Cüdo ilə məşqul olanların idman fəaliyyətində enerji təminatı qarışıq xüsusiyyətə malikdir (anaerob–aerob), buna görə də məşq və yarış fəaliyyəti prosesində idmançının dözümlülüyünü təmin edən enerji sərfi aerob sisteminin müəyyən qoyuluşunu tələb edilir. AO-sistemin tiol-disulfid (qlütationun sələfləri və kreatinfosfatın sələfləri olan amin turşularının) hissəsinin vəziyyətini korreksiya etmək üçün bizim təklif etdiyimiz vasitələrin istifadə edilməsi, yüksək təsnifatlı cüdoçuların qanında ümumi qlütationun miqdarının və onun AO fəallığına malik bərpa olunmuş formasının artmasından ibarət olan müsbət effekti doğurdu. Əlbəttə ki, müəyyən edilmiş

effekt müsbətdir, çünki məhz qlütationun bərpa olunmuş forması antioksidant bacarığına malikdir və bu bacarığı eritrositlərin optimal fəaliyyətini və bunun hesabına da, yüksək təsnifatlı cüdoçuların qanının oksigen daşıyıcı fəaliyyətini təmin etməklə nümayiş etdirir. Öz növbəsində orqanizmin yüksək aerob imkanları bərpa proseslərin tezləşməsinə imkan yaradır. Sonuncusu məşq təlimlərinin intensivliyinin və müddətinin artırılması hesabına onların effektivliyini artırmağa və cüdoçuların dözümlülüyünün artırılmasına imkan verir. Bu da bilavasitə yarışlara hazırlıq dövründə xüsusi ilə aktualdır.

## NƏTİCƏLƏR

Müəyyən edilmişdir ki, əsas tədqiqatlar aparılana qədər cüdoçu idmançıların qanında qlütationun ümumi miqdarı və onun bərpa olunmuş forması idmanla məşqul olmayanlar üçün müəyyən edilmiş normanın ən aşağı həddinə uyğun idi. Qlütationun miqdarının səviyyəsi bütün qlütation AO-sisteminin vəziyyətini, immuniteti, idmançıların dözümlülüklə əlaqədar olan fiziki işgüzarlığını müəyyən etdiyinə görə, bu sistemin korreksiyası üçün bir sıra tədbirləri həyata keçirmək lazım gəlirdi.

Qlütationun AO-sisteminin vəziyyətinin korreksiyası yollarından biri kükürdlü birləşmələrin, o cümlədən tiol antioksidantların istifadəsidir. Onların çoxsaylı sadalanmasından, istifadə olunan komplekslərin – qlütationun və kreatinfosfatın sələflərinin - tərkibinə tiol qrupların miqdarını artırmağa və orqanizmdə bütövlikdə tiol-disulfid hissənin vəziyyətini yaxşılaşdırmağa imkanları olan N-asetilsistein və metionin daxil edilmişdir.

Yüksək təsnifatlı cüdoçuların qrupları tərəfindən üç həftə ərzində metabolik komplekslərin qəbul edilməsindən sonra müəyyən edilmişdi ki, plasebo istifadə edən qrupun idmançılarına nisbətən digər iki qrup idmançıların qanında ümumi və bərpa olunmuş qlütationun mütləq miqdarı əhəmiyyətli dərəcədə artdı. Bütün tədqiq olunan qrupların idmançılarının qanında qlütationun oksidləşmiş formasının miqdarı isə dəyişilməz olaraq qaldı.

Qeyd etmək lazımdır ki, qlütationun sələfləri olan amin turşuların kompleksi qanda ümumi qlütationun və onun bərpa olunmuş formasının miqdarına daha qabarıq effektli təsir göstərirdi. Ümumi qlütationun və onun bərpa olunmuş formasının miqdarının artması qlütationun bütün AO-sisteminin vəziyyətinə və müvafiq olaraq, immunitetin, bioloji membranların vəziyyətinə, idmançıların dözümlülüyünü təmin edilməsinin əsas hissəsi olan qanın oksigen həcminə müsbət təsir göstərə bilər.

Gələcəkdə cüdoçu-idmançıların xüsusi işgüzarlığının fərqli komponentlərinin xassələrini öyrənmək üçün yerinə yetirdiyi test kompleksləri zamanı bizim istifadə etdiyimiz biokorrektorların fiziki işgüzarlığın göstəricilərinə təsirini öyrənmək məqsədi ilə yeni tədqiqatların aparılması təxmin edilir.

## ƏDƏBİYYAT


**Агаева С.Э.** (2016) Влияние физической нагрузки на активность глутатионпероксидазы в скелетных мышцах в норме и на фоне добавок селена. *Научные труды V Съезд Физиологов СНГ*. Россия: Сочи-Дагомыс, с.186

**Александрова Л.А., Михайлова И.А., Томсон В.В.** (2009) Специальные вопросы биологии человека. Учебное пособие. СПб.: СПбГУ ИТМО, 99 с.

**Алиев С.А., Агаева С.Е.** (2012) Динамика тиолового содержания и продуктов перекисного окисления липидов в структурах мозга у крыс при голодании. Тамбов: ТРОО «Бизнес-наука-общество», с. 13-19.

**Аскеров Ф.Б., Мовсумов Г.Д., Алиев С.А.** (2011) Влияние пищевой депривации на ход перекисного окисления и на условно рефлекторную деятельность животных различных возрастов. *Материалы III Международной научной конференции «Свободные радикалы, антиоксиданты и старение»*. Астрахань.

**Аскеров Ф.Б., Керимов В.Ф., Алиев С.А., Аскерова У.Ф. Набибейли Л.Б.** (2011) Метаболические особенности глутатионовой защитной системы мозга при экстремальных состояниях организма. Монография. Баку: Мутарджим, с. 388.

**Альцыванович К.К.** (2001) 1000+1 о питании при занятии спортом. Мн.: Современный литератор, 288 с.

**Барабой В.А., Брехман И.И., Голотин В.Г.** (1992) Перекисное окисление и стресс. СПб.: Наука, 148 с.

**Березов Т.Т., Коровкин Б.Ф.** (1998) Биологическая химия. М.: 750 с.

**Булыгина Е.Р., Карпова Л.В., Степанова М.С., Болдырев А.А.** (2009) Экспериментальная нейрохимия (практические работы). Учебное пособие (электронная версия). Научный редактор – академик РАМН З.А.Суслина. Москва: 215 с.

**Гаджиев А.М., Алиев С.А.** (2016) Физические нагрузки и оксидант-антиоксидантные взаимоотношения в мышечной деятельности. *Науч. тр. V Съезд Физиологов СНГ*. Россия: Сочи-Дагомыс, с. 32.

**Гаджиев А.М., Алиев С.А., Агаева С.Е.** (2014) Роль эндогенных и экзогенных антиоксидантов в адаптивной мышечной деятельности. *Теория и практика физической культуры и спорта* (Москва), **№8:** 53-56

**Гончарова Л.Л.** (2003) Тиолдисульфидная система в клинической практике. Terra Medika Nova, **2:** 2-11.

**Земцова И.И., Смульский В.Л. и др.** (1999) Повышение устойчивости организма к напряженной мышечной деятельности путем коррекции состояния его антиоксидантной системы. *Наука в олимпийском спорте*, **1:** 87-92.

**Кулинский В.И., Колесниченко Л.С.** (2009) Система глутатиона 1. Синтез, транспорт глутатионтрансферазы, глутатионпероксидазы. *Биомед. Химия*, **55(вып. 3):** 255-277.

**Мазо В.К.** (1988) Глутатион как компонент антиоксидантной системы желудочно-кишечного тракта. *Российский журнал гастроэнтерологии, гепатологии, калопроктологии*, **№1:** 47-53.

**Соколовский В.В.** (1988) Тиоловые антиоксиданты в молекулярных механизмах неспецифической реакции организма на экстремальное воздействие. *Вопросы медицинской химии*, **34(№6):** 2-11

**Ткаченко Н.В.** (1999) Эффективность применения липоевой кислоты с учетом модулирующего влияния мочевины на состояние антиоксидантной системы для повышения физической работоспособности спортсменов, специализирующихся в видах спорта, требующих проявления выносливости. *Наука в олимпийском спорте*, **№1:** 97-102

**Тринус Ф.П., Бравер-Чернобульская Б.С., Чубенко А.В. и др.** (1984) *Вести АМН СССР*, **№11:** 75-84.

**Atalay M., Marnila P., Lilius E.** (1996) Glutathione-dependent modulation of exhausting exercise-induced changes in neutrophils functions of rates. *Journal of Applied Physiology*, **74:** 120-125.

**Chen Y.** (2007) Hepatocyte-specific GCLC deletion leads to rapid onset of steatosis with mitochondrial injury and liver failure. *Hepatology*, **5:** 92-98.

**Dufaux B., Heine O.** (1997) Blood glutathione status following distance running. *Int. J. of Sports Medicine*, **18:** 89-93.

**Gutman J.** (2002) Glutathione (GSH) – your body's most powerful protector. 3rd ed. Montreal: Com-munications Kudo Ca Inc.,. 269 p.

*Stromme S.B., Flaim K.E.* (2008) The effects of exercise on serum total antioxidant activity and the influence of training in humans. *Abstr. Sci. Meet. Physiol. Soc. Journal. Proceed.*, p. 144.

## Влияние Тиоловых Соединений На Содержание Глутатиона в Крови У Борцов Высокой Квалификации

**С.А. Алиев**

*Азербайджанская государственная академия физической культуры и спорта*

Рассмотрены вопросы о месте в обмене веществ глутатиона, общего количества восстановленной его формы в крови спортсменов. В исследовании приняли участие 18 спортсменов (возраст – 18÷22 лет), находящихся на этапе непосредственной подготовки к соревнованиям. Определено, что перед основным экспериментом кровь спортсменов содержала малое количество общего глутатиона и его восстановленной формы с антиоксидантными свойствами. Для коррекции содержания глутатиона в крови было использовано два метаболических комплекса. Первый комплекс содержал аминокислоты – предшественники глутатиона. Второй – предшественники креатинфосфата. Спортсмены использовали комплексы в течение трех недель. Более эффективно влияло на уровень глутатиона в крови спортсменов использование аминокислот – предшественников глутатиона. Установлено, что одним из путей коррекции состояния системы глутатиона является применение серосодержащих соединений, в том числе тиоловых антиоксидантов.

***Ключевые слова:*** *Спортсмены, дзюдоисты, борцы, SH-группы, глутатион, N-ацетилцистеин, тиолы, антиоксиданты, метаболизм*

**Influence Of Thiol Compounds On Glutathione Maintenance In Blood Of Highly Qualified Judoists**

**S.A. Aliyev**

*Azerbaijan State Academy of Physical Training and Sports*

The role of glutathione in metabolism, amounts of its general and reduced forms in blood of sportsmen have been studied. 18 sportsmen (aged 18-24) at the stage of the preparation to compatitions took part in the research. The total glutathione and concentrations of its reduced forms having anioxidant properties were determined in the blood of the sportsmen before the experiments. Two metabolic complexes were used for the correction of the glutathione in blood. The first complex contained amino acids formed by glutathione. The precursors of creatine phosphate were involved in the second complex. Sportsmen used these complexes during three weeks. The use of amino acids - glutathione precursors had more effect on the glutathione levels in blood of the sporemen. It was found that one of the ways of the correction of the glutathione system state was the use of sulfur – containing compounds, including thiol antioxidants.

***Keywords:*** *Judo, Sh-groups, glutathione, N-acetylcysteine, thiols, antioxidants, metabolism*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №2, səh. 154-158 (2017)

# Daş palıdda (*Quercus ilex* L.) Yarpaqların Variasiya Sırasına Əsasən Morfoloji Polimorfizmin Analizi

**Z.Ə. Məmmədova*, G.N. Əliyeva**

*AMEA Dendrologiya İnstitutu, Mərdəkan qəs., S.Yesenin küç. 89, Bakı AZ 1044, Azərbaycan;*
**E-mail: bio890@mail.ru*

**Bitkilərdə ətraf mühitin əlverişsiz şəraitinə uyğunlaşmaq üçün morfoloji adaptasiyalar yaranır, bu isə vegetativ və generativ orqanlarda müəyyən forma müxtəlifliyinin – morfoloji, eləcə də genetik polimorfizmin yaranması ilə müşayət olunur. Növün genofondunun qorunub saxlanması fenotipik dəyişkənliyin səviyyəsindən asılıdır. Məqalədə Azərbaycana gətirilərək introduksiya edilmiş həmişəyaşıl palıd növü olan daş palıdın (*Q.ilex* L.) yarpaqlarında müşahidə olunmuş modifikasiya dəyişiklikləri, morfoloji polimorfizm analiz edilmiş və riyazi üsullarla təhlil edilmişdir: müəyyən edilmişdir ki, yarpağın uzunluğuna görə reaksiya normasının maksimal həddi $l_{max}$=10,50±1,46 sm, minimal həddi isə $l_{min}$=3,50±1,46 sm-dir, eninə görə $e_{max}$=5,50±0,88sm, $e_{min}$=1,50±0,88 sm-dir.**

***Açar sözlər***: *Quercus ilex* L.*, variasiya sırası, morfoloji polimorfizm, modifikasiya dəyişkənliyi*

## GİRİŞ

Daş palıda (*Quercus ilex* L.) təbii halda Aralıq dənizi ölkələrində, Cənubi Avropa, Şimali Afrika və Kiçik Asiya ölkələrində rast gəlinir. 1580-ci ildən Cənubi Avropa, Atlantik okeanı sahillərində, Cənubi İngiltərədə becərilməyə başlayıb. 1819-cu ildən Nikita adına Botanika bağında, Cənubi Kırımda, Qafqazın Qara dəniz sahillərində, becərilməyə başlayıb. Hazırda Avropanın, Şimali Afrikanın, MDB ölkələrinin, Çin,Yaponiya və s.ölkələrdə park və xiyabanların salınmasında geniş istifadə olunan ağac növlərindən biridir (Алексеиченко и Головачева, 2012). H.Ə.Əliyevin verdiyi məlumata görə daş palıdın Bakıda becərilməsinə 1880-ci ildən başlanıb (Qarayev, 2004; Əliyev, 1975). Hazırda Bakıda bəzi parklarda, eləcə də Nəbatat bağında və Dendroloji parkda daş palıdın müxtəlif yaşlı nümunələrinə rast gəlmək olar.

Daş palıdın dünyanın bir çox ölkələrində becərilməsinin əsas səbəbi uzunömürlü, həmişəyaşıl “oksigen mənbəyi” olmasından əlavə, onun “təbii kondisianer” olmasıdır, belə ki, onun kölgsində havanın temperaturu kənara nisbətən 4°C aşağı olur, bu da isti yay günlərində əhalinin istirahəti üçün əvəzedilməzdir

Daş palıd (*Q.ilex* L.) boyu 25 m, diametri 60 sm olan iri gövdəli geniş çətirli həmişəyaşıl ağacdır. Cavan budaqlarının qabığı hamar, tünd bozumtul rənglidir, gövdəsinin qabığı isə qeyri-bərabər çatlıdır. Zoğları və tumurcuqları bozumtul rəngli sıx tükcüklüdü. Yarpaq saplağı sıx bozumtul tükcüklüdür, 0,5-1,5 sm uzunluğundadır, üstdən yaşıl, çılpaq, və ya seyrək tükcüklüdür. Yarpağı dairəvidir, kənarları bütöv və ya seyrək, küt və ya iti dişlidir. Qaidə hissəsindən pazvari və ya dairəvidir, yan damarları 8-12 cütdür. Yarpaqların uzunluğu 2-7 sm, eni isə 1-3 sm-dir (Əsədov və b., 2014; Əsgərov, 2010).

Yaxşı məlumdur ki, əksər ağac növlərində yarpaqlar mövsümdən və ağac üzərində vəziyyətindən asılı olaraq geniş variasiya əmələ gətirir (Borzan & Babaç, 2003). Fenotipik quruluşun öyrənilməsi bütövlükdə növün və ayrı-ayrı populyasiyanın davamlılığını qiymətləndirməyə, eləcə də növün genofondunun saxlanılması səviyyəsini öyrənməyə imkan verir (Путенихин, 2013). Növlərin klassifikasiyası üçün indiyə qədər xüsusi genetik və morfoloji marker müəyyən edilməmişdir. Morfoloji və genetik xüsusiyyətlərin birgə tədqiqi növün əlamətlərini xarakterizə etməyə, növ və populyasiyaları adaptiv əlamətlərə görə fərqləndirməyə imkan verir (Bruschi et al., 2000). Morfoloji əlamətlər biokimyəvi və fizioloji reaksiyaların sonuncu zənciri olaraq dərin dəyişikliyə məruz qalır, orqanizmlərdə və populyasiyalarda heterogenliyin (polimorfizmin) yaranmasına səbəb olur. Heterognlik hər bir həyat səviyyəsində mövcuddur və adaptiv əhəmiyyətə malikdir (Axundova, 2004; Алтухов, 1984).

Azərbaycanda meşə zolaqlarının formalaşmasında palıd növləri əvəzsiz rol oynayır ki, palıd meşələrinin də əsas ekoloji problemlərdən biri olan, qlobal istiləşmə, torpaq erroziyası və dağların, çayların su rejiminin tənzim olunmasında xüsusi əhəmiyyəti vardır (Məmmədov, 2009). Daş palıd introduksiya olunmuş növ olsa da, yüksək uyğunlaşmaq və nəsl vermək qabiliyyətinə malikdir, bu baxımdan meşəsalmada, eləcə də park və xiyabanların yaşıllaşdırılmasında ondan müvəffəqiyyətlə istifadə etmək olar. Yüksək ekoloji, iqtisadi və bioloji dəyərə sahib olan palıd növlərinin müqayisəli şəkildə morfoloji, molekulyar-genetik tədqiqi meşələrin

yüksək genetik resurlarının qorunub-saxlanması baxımından da öz aktuallığını qoruyub saxlayır.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti kimi palıd cinsinə aid olan daş palıd növü götürulmüşdür. AMEA, Dendrologiya İnstitutunun tədqiqat bazasında müşahidə obyekti kimi 10 ağac nümunəsi 2016-cı il mart-iyul aylarında fenoloji müşahidədən keçirilmişdir. İyul ayında tam formalaşmış yarpaq nümunələri toplanaraq morfoloji tədqiq edilmişdir. Belə ki, 89 yarpaq nümunəsi yığılmış və onların hər birində yarpağın qaidəsindən ayanın ucuna qədər və eninə ölçmə işləri aparılmış və qeydə alınmışdır. Qeyri-ardıcıl yazılan rəqəmlərdə heç bir qanunauyğunluq izləmək olmur. Alınan rəqəmlər sistemləşdirilmiş və variasiya sırası tərtib edilmişdir, variasiya sırasının müxtəlifliyini özündə əks etdirən variasiya əyrisi qurulmuş (şəkil 1 və 2), yarpağın eninə və uzunluğuna görə variasiyanın ən kiçik və ən böyük hüdudları müəyyən edilmiş, riyazi üsullarla təhlil edilmişdir (cədvəl 1 və 2) (Quliyev və Babayeva, 2002).

Təsadüfi seçilmiş 10 ədəd yarpaqda isə yarpaq saplağının uzunluğu ölçülmüş, ədədi ortanın hesablanması yolu ilə orta qiymət tapılmışdır.

Variasiya sırasını əsas nə xarakterizə edir? Öyrənilən materialı digər materiallarla necə müqayisə etmək olar? Bu suallara variasiya sırasının orta riyazi parametrlərini müəyyən edəndən sonra cavab vermək olar. Bu göstərici $\bar{x}$ ilə işarə olunur və bütün variantların cəminin onların sayına nisbəti ilə müəyyən olunur:

$$\bar{x} = \frac{\sum Xf}{n} \qquad (1)$$

burada: $X$ - variasiyalar, $f$ - variasiyaların rastgəlmə tezliyi, $n$ - tezliyin cəmi və yaxud seçmənin həcmi, $\bar{x}$ - adlı ədəd, orta qiymət.

Morfoloji əlamətlərin orta riyazi göstəricisi modifikasiya dəyişkənliyinin əsasını səciyyələndirir. Orta riyazi qiymət həmin o qiymətdir ki, variasiya sırasında digər ölçülərdən ən az fərqlənir. Dəyişkənliyi düzgün xarakterizə etmək üçün variasiya sırasının ikinci parametri: standart kənarlanmadan istifadə edilmişdir. Standart kənarlanma aşağıdakı düsturla hesablanır:

$$\Im = \pm\sqrt{\frac{\left(x-\bar{x}\right)^2 f}{n-1}} \qquad (2)$$

Düsturdan göründüyü kimi, siqmanı ( $\Im$ □, standart kənarlanma) almaq üçün hər bir variasiyadan ($X$) standart olan orta riyazi göstəricini ( ) çıxmaq, ($n$-1)-ə bölmək, sonra isə kök altından çıxartmaq, yəni xətti miqdar almaq lazımdır. Standart kənarlanma orta hesabla hər bir variasiyanın orta riyazi göstəricisindən nə qədər fərqləndiyini göstərir. Siqma modifikasiya dəyişkənliyinin ölçüsüdür (Quliyev və Babayeva, 2002).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Cədvəl 1-də daş palıdda yarpağın uzunluğuna görə variasiya sırasının əsas parametrləri öz əksini tapmışdır. Cədvəldən göründüyü kimi yarpağın uzunluğuna görə reaksiya normasının maxsimal həddi $l_{max}$=10,5 sm, minimal həddi isə $l_{min}$=3,5 sm-dir. Uzunluğa görə orta riyazi göstərici (1) dusturuna əsasən hesblanmış və reaksiya normasının hüdudları təhlil edilmişdir. Belə ki, =6,64sm sm hesablanmışdır.

1 saylı cədvəldə əks olunduğu kimi variantların rastgəlmə tezliyi müxtəlifdir: variasiyanın kənar ölçüləri çox nadir hallarda rast gəlinir, sıranın hər iki qurtaracağına doğru rastgəlmə tezliyi azalır. Variantların sayı hesablanaraq müəyyən edilmişdir ki, variasiya sırasının orta üzvlərinə daha tez-tez rast gəlinir. Yarpağın uzunluğuna görə orta riyazi göstəricinin standart kənarlanması hesablanmışdır, =±1,46. Bu onu göstərir ki, hər bir variasiya orta riyazi göstəricidən ( -dən) təx-minən ±1,46 qədər fərqlənə bilər.

Cədvəl 2-də isə yarpağın eninə görə variasiya sırasının əsas parametrlərinin təhlili göstərilmişdir. Variasiya sırasının orta riyazi qiyməti =3,46 sm, reaksiya normasının maksimal həddi $e_{max}$=5,5 sm, minimal həddi isə $e_{min}$=1,5 sm-dir. Cədvəldən göründüyü kimi variasiyanın orta qiymətinə daha çox, orta qiymətdən maksimum və minimum kənarlanmalara isə daha az rast gəlinir. Yarpağın eninə görə də orta riyazi göstəricinin standart kənarlanması hesablanmışdır: =±0,88. Yəni hər bir variasiya orta göstəricidən =±0,88 qədər fərqlənə bilər. Alınmış nəticələr artıq modifikasiya dəyişkənliyi haqqında təsəvvür verir. Variasiya sırasında isə bu qanunauyğunluq daha aydın nəzərə çarpır (cədvəl 1 və 2).

Şəkil 1-də daş palıdın yarpaqlarının uzunluğuna görə müşahidə olunmuş modifikasiya dəyişkənliyini özündə əks etdirən variasiya əyrisi verilmişdir. Absis oxu üzrə variasiyanın qiyməti ($X$) yarpağın qeydə alınmış uzunluğu, ordinat oxu üzrə isə həmin göstəricilərin rastgəlmə tezliyi ($f$) ifadə olunmuşdur. Verilən rəqəmlərdən aydın görünür ki, variasiyaların hamısı eyni tezlikdə rast gəlinmir. Variasiyaların tezliyinə ən çox sıranın ortasında, ən az isə kənarlarında təsadüf edilir.

Şəkil 2-də isə daş palıdın yarpaqlarının eninə görə variasiya sırasının qrafik ifadəsi verilmişdir.

**Cədvəl 1**. Daş palıdında yarpaqların uzunluğuna görə variasiya sırasının əsas parametrlərinin riyazi təhlili.

| Variasiyaların rastgəlmə tezliyi (*f*), ədəd | Variasiyalar (*X*), sm | *X·f* | $X-\bar{x}$ | $(X-\ )^2$ | $(X-\ )^2f$ |
|---|---|---|---|---|---|
| 4 | 5,0 | 20,0 | -1,64 | 2,69 | 10,76 |
| 2 | 9,5 | 19,0 | 2,86 | 8,18 | 16,96 |
| 11 | 8,0 | 88,0 | 1,36 | 1,85 | 20,35 |
| 13 | 6,0 | 78,0 | -0,64 | 0,41 | 5,33 |
| 11 | 5,5 | 60,5 | -1,14 | 1,30 | 14,30 |
| 18 | 6,5 | 117,0 | -0,14 | 0,02 | 0,36 |
| 6 | 8,5 | 51,0 | 1,86 | 3,46 | 20,76 |
| 1 | 10,5 | 10,5 | 3,86 | 14,90 | 14,90 |
| 7 | 7,5 | 52,5 | 0,86 | 0,74 | 5,18 |
| 5 | 7,0 | 35,0 | 0,36 | 0,13 | 0,65 |
| 3 | 4,0 | 12,0 | -2,64 | 6,97 | 20,91 |
| 3 | 9,0 | 18,0 | 2,36 | 5,57 | 16,71 |
| 1 | 10,0 | 10,0 | 3,36 | 11,29 | 11,29 |
| 2 | 3,5 | 7,0 | -3,14 | 9,86 | 19,72 |
| 2 | 4,5 | 9,0 | -2,14 | 4,58 | 9,16 |
| **n=∑f=89** | | **587,5** | | | **187,34** |

**Cədvəl 2.** Daş palıdda yarpaqlarının eninə görə variasiya sırasının əsas parametrlərinin riyazi təhlili.

| Variasiyaların rastgəlmə tezliyi (*f*), ədəd | Variasiyalar (*X*), sm | *X·f* | *X-* | $(X-\ )^2$ | $(X-\ )^2f$ |
|---|---|---|---|---|---|
| 9 | 2,5 | 22,5 | -0,96 | 0,92 | 15,00 |
| 10 | 4,5 | 45,0 | 1,04 | 1,08 | 0,07 |
| 18 | 4,0 | 72,0 | 0,54 | 0,29 | 8,19 |
| 24 | 3,0 | 72,0 | -0,46 | 0,21 | 4,33 |
| 19 | 3,5 | 66,5 | 0,04 | 0,001 | 1,70 |
| 3 | 5,0 | 15,0 | 1,54 | 2,37 | 11,05 |
| 3 | 2,0 | 6,0 | -1,46 | 2,13 | 5,44 |
| 1 | 5,5 | 5,5 | 2,04 | 5,86 | 5,86 |
| 2 | 1,5 | 3,0 | -1,96 | 3,69 | 7,38 |
| **n=∑*f*=72** | | **330** | | | **69,12** |




**Şəkil 1.** Daş palıdda yarpağın uzunluğuna görə qurulmuş variasiya sırasının qrafik təsviri.




**Şəkil 2**. Daş palıdda yarpağın eninə görə qurulmuş variasiya sırasının qrafik təsviri

Variasiya sırasının kənarlarına doğru variantların rastgəlmə tezliyi azalır, variasiya sırasının ortasında isə variantların rastgəlmə tezliyi artır. Yarpaq saplaqlarının ölçülməsindən alınan nəticəyə əsasən tədqiq etdiyimiz ağacda yarpaq saplağının maksimal uzunluğu 10 mm, minimal uzunluğu isə 5 mm-dir, orta qiymət isə 7,4±1,2 mm qeydə alınmışdır.

Daş palıdda da reaksiya normasının kəskin dəyişməsini müşahidə etdik. Reaksiya normasının geniş miqyasda tərəddüd etməsinin orqanizmin təbii şəraitə uyğunlaşması üçün böyük əhəmiyyəti vardır, belə ki, bu növün saxlanılmasını və artmasını təmin edir (Axundova, 2004). Orqanizmin reaksiya norması genotiplə müəyyən olunur, müxtəlif əlamətlər xarici mühitin təsiri nəticəsində müxtəlif hüdudlarda fərqlənir, yəni reksiya normasına görə müxtəlif olur (Quliyev və Babayeva, 2002). Hazırda ölkəmizdə park və xiyabanların yaşıllaşdırılmasında geniş istifadə olunan, xarici ölkələrdən yüksək maliyyə vəsaiti hesabına gətirilən, kölgəverməyən həmişəyaşıl ağac və kolların əkilməsindənsə, müxtəlif təbii şəraitə yüksək uyğunlaşmaq qabiliyyətinə malik, həmişəyaşıl, uzunömürlü "təbii kondisioner" - daş palıdın əkilməsi daha məqsədəuyğundur.

Daş palıdda növ daxilində müşahidə olunan morfoloji polimorfizmi qiymətləndirmək üçün tərəfimizdən populyasiyadaxili və populyasiyalararası arşdırmalar aparılır və nəticələr silsilə şəklində məqalə formasında dövri mətbuata təqdim ediləcək. Morfoloji əlamətlərdə vizual olaraq müşahidə edilmiş modifikasiya dəyişkənliyinin – morfoloji polimorfizmin müasir dövrün ən etibarlı silahı olan molekulyar-genetik markerlərdən istifadə edilərək genetik səviyyədə yoxlanılması, eləcə də populyasiyalararası qohumluq əlaqələrinin, genetik polimorfizmin öyrənilməsinə ehtiyac olduğundan, yalnız daş palıd deyil, Azərbaycan florasında mövcud olan bəzi, digər palıd növlərində bu sahədə molekulyar-genetik analizlərin aparılması planlaşdırılır. Tədqiqat işi davam etdirilir.

## ƏDƏBİYYAT


**Əsgərov A.** (2010) Azərbaycan florasının konspekti. Bakı: Elm, s. 92.

**Axundova E.M.** (2004) Ekoloji genetika. Bakı: "Təhsil" NPM, s. 34-40, 114-118.

**Əliyev H.Ə.** (1975) Palıd meşələrinə səyahət. Bakı: "Ədəbiyyat və incəsənət qəzeti, **№28:** 6-7.

**Əsədov K.S., Mirzəyev O.H., Məmmədov F.M.** (2014) Dendrologiya. Bakı: Gənclik, s. 193-201.

**Quliyev R., Əliyeva K.** (2002) Genetika. Bakı: BDU, s. 212-220.

**Qarayev S.Q.** (2004), Abşeron şəraitində palıd növlərinin bioekologiyası və becərilməsi. *Dissertasiya*. Bakı, 2004.

**Məmmədov Q.Ş., Həşimov A.C.** (2009) Çayların gətirmə konusları ərazilərində torpaqların münbitliyinin qorunması problemləri. *AMEA-nın Məruzələri*, **№4:** 159.

**Алексеиченко Н.А., Головачева О.С.** (2012) Полиморфизм *Quercus ilex L.* в условиях Никитского ботанического сада. *Бюллетень Государственного Никитского ботанического сада*, **вып.105:** 40-44.

**Алтухов Ю.П.** (1984), Генетические процессы в популяциях. М.: Наука, с. 26-35.

**Путенихин В.П.** (2013) Фенотипическая структура популяций дуба черешчатого в Башкирском Предуралье как основа сохранения генофонда вида в регионе. *Известия Самарского научного центра РАН*, **15(№3(4)):** 1410-1412.

**Borzan A., Babaç M.T.** (2003) Morphometric leaf variation in oaks (*Quercus*) of Bolu, Turkey. *Ann. Bot.Fenicci,* **40:** 233-242.

**Bruschi P., Vendramin G.G., Busotti F., Grassoni P.** (2000) Morphological and molecular differentiation between *Quercus petraea* (Matt.) Liebl. and *Quercus pubescens* Willd. (*Fagaceae*) in Northern and Central Italy. *Annals of Botany*, **85:** 325-333.

## Анализ Морфологического Полиморфизма Согласно Вариационному Ряду Листьев У Каменного Дуба (*Q. ilex* L.)

**З.А. Мамедова, Г.Н. Алиева**

*Институт дендрологии НАН Азербайджана*

Для адаптации к неблагоприятным условиям окружающей среды у растений создаются морфологические адаптации и это сопровождается появлением определённых разнообразий форм – морфологического и генетического полиморфизма в вегетативных и генеративных органах. Сохранение генофонда вида зависит от уровня фенотипической изменчивости. В статье проанализирована модификационная изменчивость, наблюдаемая у листьев вечнозелёного каменного дуба (*Q.ilex* L.), интродуцированного в Азербайджан, которая исследована математическими методами. Выявлено, что по длине листьев максимальный показатель нормы реакции равен $l_{max}$=10,50±1,46 см, минимальный показатель - $l_{min}$=3,50 ±1,46 см, по ширине соответственно - $e_{max}$=5,50±0,88 см, $e_{min}$=1,50±0,88 см.

***Ключевые слова:*** *Quercus ilex* L., *вариационный ряд, морфологический полиморфизм, модификационная изменчивость*

## Morphological Analysis Of Polymorphism According To Variation Number Of Leaves In *Quercus ilex* L.

**Z.A. Mammadova, G.N. Aliyeva**

*Institute of Dendrology, Azerbaijan National Academy of Sciences*

Morphological adaptations were created in plants under adverse environmental conditions and it was accompanied by the appearance of certain varieties of forms-morphological and genetic polymorphism in vegetative and generative organs. Preservation of the genefund of a species depends on the level of phenotypic variability. In this article modification variability observed in leaves of evergreen *Quercus ilex* L. introduced in Azerbaijan was analyzed and studied by the mathematical methods: it was revealed that the maximum and minimum indications of norm of the reaction along and across the leaves are $l_{max}$=10.50±1.46 cm, $l_{min}$=3.50±1.46 cm; $e_{max}$=5.50±0.88 cm, $e_{min}$=1.50±0.88 cm, respectively

***Keywords:*** *Quercus ilex* L.*, variation number, morphological polymorphism, modification variability*

# Fiziki Yükləmələr Zamanı İdmançıların İmmun Sisteminin Vəziyyətinin Tədqiqi

**S.S. Əlibəyova**

*Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası,Fətəli xan Xoyski küç., 98a, Bakı AZ1110, Azərbaycan; E-mail: Saadat.aliyev@mail.ru*

**Məqalədə məşqlərdən əvvəl və sonra xüsusi dözümlülüyün inkişafına yönəldilən yüksək intensivlilki yükləmələr zamanı peşəkar idmançıların immun statusunun parametrlərinin dəyişilməsinin dinamikası öyrənilmişdir. Müəyyən edilmişdir ki, məşqlərdən əvvəl yüksək dərəcəli idmançıların immun statusu nəzarət qrupunun nümayəndələrinin analoji göstəricilərindən fərqlənmir. Bu da immun sistemin fiziki yükləmələrin həcminə uyğunlaşdığını sübuta yetirir. Xüsusi dözümlülüyün inkişafına yönəldilmiş yüksək intensivlifiziki yükləmələrlə keçirilən məşqlərdən sonra idmançıların immun statusu bir qədər dəyişir. Yüksək fiziki yüklərin təsiri nəticəsində yaranan immunoloji dəyişiklikləri müvəqqəti hesab etmək olar və yalnız immun sistemin hüdud vəziyyətindəki inkişafı zamanı onların qeyri-tibbi korreksiyası məqsədə uyğun hesab edilir.**

***Açar sözlər:*** *İmmunitet, böyük fiziki yüklər, dərəcəli idmançılar, adaptasiya*

## GİRİŞ

İdman nailiyyətlərinin sürətli inkişafı daim böyük həcimli və intensiv fiziki yüklərin icrasını və təkmilləşməsini tələb edir. Bu da məşq prosesinin fərdiləşməsini daha da çətinləşdirir və müxtəlif xəstəliklərin yaranmasına rəvac verir.

İmmun sisteminin homeostaz mexanizmlərin qorunmasında vacib rolunu nəzərə alaraq, idmançılarda onun statusunun öyrənilməsi idman praktikasında aktual bir məsələ olaraq qalmaqdadır. Uzunmüddətli və intensiv məşqlər zamanı idmançılarda faqositar, T- və B-hüceyrəimmuniteti həlqələrinin parametrlərində ciddi dəyişikliklər yarana bilər. Bu da idmançılarda fiziki iş qabiliyyətini məhdudlaşdıran ikincidərəcəli immun-çatışmamazlıq vəziyyətinin yaranmasına səbəb olur (Алибекова, 2016; Бацков, 2003; Исаев и др., 2004; Сашенков и др., 2008; Стерлинг и др., 2013).

Müasir ədəbiyyatda ayrı-ayrı idman növlərindən olan idmançıların immun sisteminin öyrənilməsinə aid tədqiqatlar çox azdır. Boksçuların, üzgüçülərin, xizəkçilərin illik məşq prosesində immun sisteminin vəziyyəti haqqında məlumatlar olsa da, güləş növləri ilə məşğul olan idmançıların immun sisteminin statusu haqqında, demək olar ki, heç bir məlumat yoxdur (Гаврилова, 2009; Першин и др., 2003).

Mərkəzi sinir və immun sistemlərin funksiyalarının pozulması tam olaraq homeostazın neyro-humoral tənzimlənməsinin disbalansının əsas amillərindən biridir (Бацков, 2003). Hərəkət fəallığı ilə immun sistemin funksiyası arasında neyroendokrin sistemi tərəfindən tənzimlənən qarşılıqlı əlaqə mövcuddur (Shephard and Shek, 2000). Həmçinin, elmi ədəbiyyatda hərəkət fəallığının immun sisteminin molekulyar və hüceyrə mexanizmlərinə təsiri ilə bağlı məlumatlar öz əksini tapmışdır (Moynihan, 2003; Padgett and Glaser, 2003; Suzuki et al., 2002).

Lakin idman fəaliyyəti ilə əlaqədar aparılan tədqiqatlarda immun sistemi ilə idmançıların fiziki iş qabiliyyəti arasında qarşılıqlı əlaqələrin olması haqqında məlumatlar bir qədər ziddiyyətlidir. Belə ki, R.S.Suzdalniski və B.A.Levando (2003), N.P.West və b. (2008) göstərmişlər ki, orta intensivlikli fiziki yükləmələr patoloji dəyişikliklərə səbəb olmur və hətta immun sisteminin cavabını stimullaşdırırlar (Сашенков и др., 2008; West və b., 2008). V.A.Çereşnev və həmkarları (2002) apardığı tədqiqatların nəticələrinə görə orta intensivlikli fiziki yükləmələr immun sisteminə müsbət effektli modullaşdırıcı təsir göstərirlər (Суздальницкий и Левандо, 2003). Bəzi tədqiqatçılar hərəkət aktivliyi ilə immun sisteminin funksiyaları arasında qarşılıqlı əlaqələrin olmasını qəti olaraq inkar edirlər (Marsland et al., 2002). V.A.Kolupayev (2009) idmançıların immun statusunun dəyişilməsini əzələ fəaliyyətinin enerji təminatının xarakteri ilə əlaqələndirir (Житписбаева, 2010).

Fiziki yüklərin icrasının immun sisteminin funksiyasına təsiri stress amilin təsiri fonunda daha qabarıq şəkildə büruzə verilir (Агаева и Алибекова, 2015; MacKinnon, 2000; Moseley, 2000; Novas et al., 2003). Son zamanlara kimi belə hesab edilirdi ki, bütün növ stress amilləri əsasən immuno-supressiv təsirə malik olur. Lakin, o da müəyyən edilmişdir ki, stresin növü və təsir xüsusiyyətləri immun sisteminin funksiyalarının dəyişilməsinin xarakterini müəyyən edə bilər. Məsələn, stress amili orqanizm tərəfindən neqativ (distress) kimi qəbul edilərsə, onda neyroendokrin fəallığın dərəcəsi immun sistemin

funksiyasının zəifləməsinə gətirib çıxara bilər. Əgər stress müsbət (eustress) qəbul edilirsə, o zaman endokrin sistemin yaratdığı təsir immun sistemin fəaliyyətinin güclənməsini stimullaşdıra bilər (Цыган и др., 2012). Beləliklə, fiziki yükləmələrlə immun sistemin funksiyaları arasındakı qarşılıqlı əlaqələri müəyyən etdikdə məlum olur ki, təkcə stres amilin mövcud olduğunu deyil, eyni zamanda onun xarakterini, yəni immun sistemin güclənməsinə və ya zəifləməsinə səbəb olmasını nəzərə almaq vacibdir. R.S.Suzdalski və B.A.Levando (2003) tərəfindən stress nəticəsində immun sistemində yaranan əsas fazalara aiddir: aktivasiya, kompensasiya (stabilləşmə), dekompensasiya və bərpa olunma (Сашенков и др., 2008). De-kompensasiya fazasında immunitetin öyrənilən humoral, sekretor və hüceyrə göstəricilərinin əksəriyyətinin zəifləməsi qeyd olunur, bu da ikinci dərəcəli immunçatışmamazlığına aid olan və "stressor immun çatışmamazlığı" adlanan adaptasiyanın pozulmasını, immunitet ehtiyyatlarının tükənməsini göstərir. Müəyyən edilmişdir ki, immunoqlobulinlərin və "normal antitellərin" titrləri sıfra enirlər, yəni immun sistemin funksional iflici yaranır. Bu təzahür "itən immunoqlobulinlərin və antitellərin fenomeni" adlandırılır.

Orqanizmin adaptasiya qabiliyyəti T-sisteminin vəziyyətindən asılıdır. Bir sıra xəstəliklərin yaranmasında T-sistemlərin çatışmamazlığı durur (Зурочка и др., 2005). T-limfositlərin və onların subpopulyasiyasının miqdarının və funksional fəallığının öyrənilməsi immunoloji monitorinq sisteminə daxildir.

Yüksək məşq yüklərinin icrası zamanı immun statusun pozulması orqanizmin həddən artıq gərginləşməsinə səbəb olur, bu da öz növbəsində daxili və xarici mühitin amillərinə qarşı onun rezistentliyinin zəifləməsinə səbəb ola bilər (Padgett and Glaser, 2003). O da təsdiq olunmuşdur ki, məşq prosesinin ilkin mərhələlərindəqan zərdabında təbii killer-hüceyrələrin (TK-hüceyrələrin) miqdarı artır, neytrofillərin (Smith, 2003) və sIgA (Черешнев и др., 2002) azalması müşahidə olunur. Məlumdur ki, belə dəyişikliklər zamanı infeksiyaların yaranma riski artır. İntensiv idman məşqləri zamanı orqanizmin immuniteti xeyli zəifləyir, patogen mikroorqanizmlərin daxil olması və gizli (latent) infeksiyaların reaktivasiya təhlükəsi artır (Moynihan, 2003).

Aparılmış elmi tədqiqatlarda (Казьмин, 2005; Лебедев и Понякина, 2003) müəyyən edilmişdir ki, yüksək fiziki yükləmələr idmançıların immun sisteminin funksional imkanlarına mühüm təsir göstərir, faqositozedici hüceyrələrin mikrob antigenlərə adekvat immun cavabını formalaşdırmaq bacarığını zəiflədirlər. Belə hesab edilir ki, həddən artıq məşqlərdən zəifləmə sindromu üçün səciyyəvi olan və immuno-uyğun hüceyrələrin populyasiyasının azalmasına mühüm təsir göstərən əsas amil stress-hormonların, xüsusi ilə də kortizolun yüksək səviyyəsidir (Бацков, 2003). T-hüceyrə immunitetin zəifləməsinin nəticələrindən biri kimi autoimmunizasiyanın inkişafı ilə müşahidə edilən B-sistemin fəallaşması ola bilər (Стерлинг и др., 2013). İdman stresi (katexolaminlərin və qlükokortikodların səviyyəsinin artması nəticəsində) sitokinlər qəfəsində interleykinlərin (İL) 1,6 ilkin supressiyasınınvə şişlərin α-nekroz faktoru (α-NRF) şəklində mühüm dəyişikliklərə, sonradan isə onların miqdarının kəskin çoxalmasına səbəb olur.

Müəyyən edilmişdir ki, idmançılarda yarışlar zamanı immunoloji reaktivliyin mühüm dəyişiklikləri qeydə alınır (Дорофеева, 2008; Першин и др., 2003; Платонов, 2013; Потявина, 2004; Романова, 2010). Bu pozulmaları periferik qanda immunoqlobulinlərin əsas siniflərinin miqdarının neqativ dinamikası ilə və qeyri spesifik rezistentli hüceyrələrin funksional fəallığının zəifləməsi ilə əlaqələndirirlər (Мирошниченко, 2007; Стернин и Сизякина, 2007; Стерлинг и др., 2013, 2013). Lakin belə bir fikir var ki, birdəfəlik və dəfələrlə təkrarlanan fiziki yükləmələr immunoqlobulinlərin, o cümlədən IgG, ümumi səviyyəsinin dəyişilməsinə səbəb olmurlar (Heint, 2007). İdmançıların immun statusuna aid olan məsələlərin çoxu hələ də tam öyrənilməyib. İdman fəaliyyətindən asılı olaraq idmançılarda fiziki yükləmələrin miqdarı ilə immun sistemin cavab reaksiyasında baş verən pozğunluqlar arasındakı qarşılıqlı əlaqə müəyyən edilməmiş qalır. Fiziki yüklərə fərdi dözümlülüyün olması idmançılarda bu yüklərin təsiri altında yaranan immunoqlobulinlərin (xüsusilə də, A- və E sinfindən olan) disbalansının fenomeni və onların yuxarı tənəffüs yolların iltihablı xəstəliklərin və allergik reaksiyaların inkişafını törədən təsirinin öyrənilməsi həllini gözləyən əsas məsələlərdəndir. Müxtəlif idman yükləmələrin hüceyrənin immun çatışmamazlığına təsiri, xüsusi ilə də onların peşəkar idmançılarda ikinci dərəcəli immun çatışmamazlığının inkişafındakı rolu, immunoloji reaktivliyin inkişafında pro- və iltihab əleyhinə sitokinlərin vəziyyəti və onların iltihablı reaksiyaların formalaşmasına təsiri hələ də tam öyrənilməmişdir.

Yüksək dərəcəli idmançılarda (güləşçilərdə) xüsusi dözümlülüyünün inkişaf etdirilməsinə yönəldilən intensiv məşq yükləmələrindən əvvəl və sonra immun statusunun parametrlərin dəyişilməsinin xüsusiyyətlərini öyrənmək işin əsas məqsədini təşkil etmişdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatda 18-19 yaşlı 15 idmançı kişilərin immunoloji müayinələrinin nəticələri ümumiləşdirilmişdir. Qan nümunələrinin götürülməsi ac qarına fiziki yüklərin icrasından 15-30 dəqiqə əvvəl və

xüsusi dözümlülüyün inkişafına yönəldilən yüksək intensivli yüklərin icrasından sonra 1 saat müddətində həyata keçirilmişdir (OMS-nin 95-100% səviyyəsində). Tədqiqatda tam sağlam idmançılar istirak etmişdir. Tədqiqatlar xüsusi hazırlıq mərhələsinin sonunda həyata keçirilmişdir. Nəzarət qrupunu (kontrol) idmanla sistematik məşğul olmayan, tam sağlam olan 18-19 yaşlı 10 nəfər təşkil etmişdir. Tədqiqatda qarşıya qoyulan vəzifələrin həll olunması üçün: periferik qanda limfositlərin miqdarının təyin olunması, onların kəmiyyət və keyfiyyət xüsusiyyətlərinin müəyyən edilməsi üçün ho-meopatik üsullardan istifadə edilmişdir.

Əslində immunoloji üsullara daxildir:

- əsas siniflərə daxil olan immunoqlobulinlərin miqdarı;
- limfositlərin fitohemoqlütinləşməsinin aktivləşməsi (FQA) və lipopolisaxaridlərin (LPS) stimullaşdırılması;
- limfositlərin subpopulyasiyasının miqdarı;
- toxuma antigenlərin (autoaqressiv reaksiyalar) iştirakı ilə blasttransformasiya reaksiyasında limfositlərin fəallığı;
- autoloji zərdabın və onun müxtəlif fraksiyalarının sitoloji aktivliyi;
- iltihab yaradan və iltihab əleyhinə olan interleykinlərin miqdarı (Коган, 2009; Насолодин, 2005).

Alınmış nəticələr riyazi statistikanın ümumi qəbul edilmiş metodlarının köməyi ilə işlənilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Tədqiqatlarda alınmış nəticələrdən məlum olmuşdur ki, muayinə olunan idmançılarda fiziki yükləmələri yerinə yetirməzdən əvvəl limfositlərin səviyyəsi 21,07±0,45% təşkil etmişdir. Fiziki yükləmələrin yerinə yetirilməsindən sonra periferik qanın leykositlərinin tərkibini tədqiq etdikdə, bu göstəricinin 25,07±0,22%-dək yüksəldiyi müəyyən olunmuşdur. Bu da aparılan məşqin adaptasiya reaksiyalarının meyyarlarına uyğundur.

Böyük həcimli fiziki yükləmələrdən sonra müayinə edilən idmançılarda limfositlərin subpopulyasiyasının miqdarının təyini zamanı CD3+ göstəricilərinin nəzarət qrupuna nisbətən (p<0,05) aşağı enməyə meyillilik müşahidə olunmuşdur (şəkil 1). Bu vaxt CD4+ (p<0,05) daha da aşağı düşməsi və eyni zamanda CD8+ səviyyəsinin qalxması müşahidə olunmuşdur. Nəzarət qrupunun ilkin göstəricilərinin (p<0,05) CD16+ilə müqayisəsi zamanı onların (p<0,05) miqdarının artması aşakar olunmuşdur. CD22+miqdarı bütün müşahidələr dövrü dəyişilməz olaraq qalmışdır.CD16+ miqdarının artması və CD22+sabit qalması bu meyilliliyi immun sistemin fiziki yükləmələrə verdiyi adaptasiya reaksiyası kimi qəbul etməyə imkan verir (şəkil 1a). İmmun tənzimləmənin əsas sabiti (İTƏS) 1,07 təşkil edirdi (nəzarət qrupunda bu sabit - 1,45) (şəkil 1b).




(a)




(b)

**Şəkil 1**. Birdəfəlik fiziki yüklərin icrası zamanı (n=10) müayinə olunan idmançılarda hüceyrə immunitetin göstəricilərinin dəyişilməsi




**Şəkil 2.** İdmançılarda birdəfəlik fiziki yükləmələrin icrasında blasttransformasiya reaksiyası zamanı limfositlərin funksional aktivliyinin göstəricilərinin vəziyyəti

Yoxlamaya cəlb olunan idmançılarda məşq yüklərinin icrasından sonra limfositlərin blasttransformasiya reaksiyasında funksional aktivliyin yoxlanılması üzrə keçirilən tədqiqatlar nəticəsində fitohemaqlütin aktivliyin tənzimlənməsinin stimullaşmasına cavab olaraq limfositlərin funksional fəallığının artmasına dair meyilliliyin olduğu müəyyən edilmişdir (şəkil 2). Eyni zamanda, bütün müşahidə dövrü boyu LPS stimullaşdırmasına cavab olaraq

limfositlərin funksional fəallığının göstəriciləri dəyişilməz olaraq qalmışdır. İlkin göstəricilərə nisbətən yüksək yükləmələri yerinə yetirdikdən sonra hummoral immunitetin göstəricilərinin müəyyən edilməsi Ig G, A, M tərkibinin azalmasını göstərmişdir (şəkil 3). Nəzarət qrupunun əsas hissəsinə nisbətən bu göstəricilərin azalması müvafiq olaraq 26,0% ($p<0,05$), 21,0% ($p<0,05$) və 11,0% ($p<0,05$) təşkil etmişdir. Nəzarət qrupuna nisbətən IgE-nin konsentrasiyasının 21,1% qalxması müşa-hidə olunmuşdur.




**Şəkil 3.** İdmançılarda birdəfəlik fiziki yüklərin icra dinamikası zamanı hummoral immunitetin göstəricilərinin dəyişilməsi

Yüksək intensivli fiziki yükləri icra etdikdən sonra idmançıların qanında sitokinlərin miqdarının təyini zamanı nəzarət qrupuna ($p<0,05$) və ilkin nəticələrə nisbətən IL-1, IL-2 və IL-8 artması (şəkil 4) müşahidə olunmuşdur. Eyni zamanda müşahidə edilən idmançıların qan zərdabında ilkin göstəricilərə ($p<0,05$) və nəzarət qrupunun göstəricilərinə ($p<0,05$) nisbətən alfa (a-ŞNF) şişlərin nekroz faktorunun konsentrasiyasının artması da müşahidə edilmişdir.

Müşahidə edilən idmançılarda limfositlərin autosensibilizasiyasının səviyyəsi yoxlanılan zaman onların funksional aktivliyinin dərinin, qara ciyərin və miokardın antigenlərinə nisbətən artması meylliliyi müşahidə edilmişdir. Lakin bu göstəricilər nəzarət qrupunun ilkin nəticələrindən bir o qədər də yüksək olmamışdır(şəkil 5).

Aparılmış tədqiqatlardan məlum olmuşdur ki, böyük həcimlifiziki yükləmələrin icrasından əvvəl idmançıların immun sisteminin göstəriciləri dəyişikliyə uğramır, bu da bir çox hallarda onlarda immun sistemin dəyişilmədiyini iddia edən bəzi müəlliflərin fikirlərini təsdiqləyir (Nieman, 2003).




**Şəkil 4.** Yoxlamaya məruz qalmış idmançılarda iltihab yaradan və iltihab əleyhinə sitokinlərin miqdarına birdəfəlik fiziki yükləmələrin təsirinin dinamikası




**Şəkil 5.** Yoxlamaya məruz qalmış idmançılarda birdəfəlik fiziki yükləmələrin icrası zamanı toxuma antigenlərlə stimullaşdırmaya cavab olaraq limfositlərin proliferativ fəallığının göstəricilərinin dinamikası

Böyük həcimli intensiv yüklərin icrası hətta yüksək dərəcəli idmançıların qanında immun hüceyrələrinin səviyyəsində-qısamüddətli dəyişikliklərin yaranmasına səbəb ola bilər. Buna baxmayaraq, onların uzun müddət qalması və immun sisteminin fəaliyyətinə necə təsir etməsi haqqında eti-

barlı dəlillər yoxdur. Buna görə də, bəzi müəlliflər belə hesab edirlər ki, idmanın immunologiyası – sağlam insanın idman yükləmələrinin icra şəraitində olan immunologiyasıdır (Агаева и Алибекова, 2015; Стерлинг и др., 2013; Green et al., 2003).

Aparılan tədqiqatları yekunlaşdıraraq qeyd etmək olar ki, böyük həcimli yükləmələr periferik qanda T-killer hüceyrələrin sayının azalmasına, eyni zamanda supressiv və sitotoksin funksiyalı hüceyrələrin sayının artmasına səbəb olmuşdur. Lakin, elmi ədəbiyyatda yüksək dərəcəli idmançıların qanında T-hüceyrələrin və onların T-mitogenlərə (Высочин и Денисенко, 2002) reaksiyası haqqında bir-birinə zidd məlumatlar vardır. Bu hüceyrə immunitetindən tutmuş qanda T-limfositlərin miqdarının artmasınadək bütün dəyişiklikləri əhatə etmişdir (Малахова, 2004; Gleeson et al., 2002; Green et al., 2002).

Yüksək intensivli fiziki yükləmələr zamanı T-hüceyrə immuniteti T-xelperlərin (Tx, CD4+) və T-sitotoksin hüceyrələrin (Ts, CD8+) artması və sonradan onların azalması ilə cavab reaksiyası verir (Steensberg, 2002). Killer-hüceyrələrin sitotoksik fəallığının artması ilə parallel olaraq onların miqdarının artması haqqında da mülahizələr mövcuddur. Lakin tədqiqatların çoxunun nəticələrinə əsasən onların aktivliyi dəyişilməz olaraq qalır (Heint, 2007).

Beləliklə, yuxarıda qeyd olunan məsələlər idmançılarda immunitetin T-sisteminin vəziyyəti haqqında suallarındiskusiya xarakterli olduğunu göstərir və gələcəkdə onların yaşını, cinsini, idman növünü və dərəcəsini, idman stajını, fiziki yükləmələrin müddətini və yükləmələrə qarşı fərdi dözümlülüyünü nəzərə almaqla daha dərindən öyrənilməsinin tələb edir.

Böyük intensivli fiziki yükləmələrin təsiri altında immunoqlobulinlərin əsas siniflərinin qatılığının xeyli azalması tərəfimizdən müəyyən edilmişdir. Eyni zamanda bu fikir xüsusi elmi ədəbiyyatda yüksək dərəcəli idmançıların gərgin məşq və məsul yarışlar zamanı IgG və IgM immunoqlobulinlərin səviyyəsinin azalması haqqında verilmiş dəlillər ilə uyğunluq təşkil edir. Həddən artıq məşq etmədən zəifləmə sindromunun əsas əlamətlərindən biri, immunoqlobulinlərin, xüsusilə sekretorimmunoqlo-bulinlərin səviyyəsinin azalması ilə müşahidə olunan hüceyrə və humoral immunitetin depressiyasıdır (Dimitriou et al., 2002). Bu da çox güman ki, onların əzələ toxumasının hüceyrələrində fiksasiyası iltihablı proseslərin inkişafı səbəblərindən biri ola bilər (Стерлинг и др., 2013). Ayrı-ayrı idman növlərində ixtisaslaşan yüksək səviyyəli idmançıların qan zərdabında bir dəfəlik fiziki yükləmələrdən sonra IgA səviyyəsinin aşağı düşməsi müəyyən edilmişdir (Padgett and Glaser, 2003). IgA miqdarının tüpürcəkdə azalmasına doğru meyillilik, yuxarı tənəffüs yollarının xəstələnməsi riskini artırır. Lakin, bu əlaqənin nə qədər etibarlı olduğunu sübut etmək gələcəkdə aparılacaq elmi-tədqiqat işlərinin nəticəsində məlum olacaqdır (Nieman, 2003; Pyne et al., 2001).

Belə güman edilir ki, IgE miqdarının artması fiziki yükləmələrə cavab olaraq idmançılarda təcili tipli allergik reaksiyanın inkişafına vadar edir. Müəyyən olunduğu kimi, disimmunoqlobulinemiyalı (IgE səviyyəsinin artması ilə əlaqədar) immunitetin humoral hissəsinin depressiyası idmançılarda tez-tez rastlaşdığımız və burun-udlaqda müşahidə olunan latent xroniki infeksiyanın mövcud-luğundan irəli gəlir (Антонова, 2006).

Məşqlərin intensivliyi artırdıqda və fiziki yükləmələrin maksimal yüksək həcmə çatdıqda və natamam bərpa prosesləri getdikdə idmançılar da yuxarı tənəffüs yollarının xəstəliklərinə daha tez-tez rast gəlinir (Heint, 2007). Göründüyü kimi, onların yaranması çox vektorlu funksiyalara malikimmun sisteminin sıxışdırılmasının təcili effektlərinin müvəqqəti toplanmasından ibarət olub, məşqlərin dəfələrlə təkrarlanmasından, məşqlər arası bərpanın az olmasından, qidalanmanın xüsusiyyətlərindən, əlavə stressor amilərindən, virus infeksiyalarının təsirindən (və ya latent infeksiyasının reaktivləşməsindən) və s asılıdır.

Sitokinin qəfəsdə müəyyən olunmuş balans pozulmaları bir çox tədqiqatçıların aldığı nəticələrlə uyğunluq təşkil edir. İdman stressi katexolaminlərin və qlükokortikoidlərin səviyyəsində sitokin statusunda kəskin dəyişikliklər yaradır və buIL-1, IL-6 interleykinlərin və şişlərin nekroz amilinin-alfa (α-ŞNA) ilkin supressiyası şəklində dəyişilməsinəvə sonradan onların kəskin artmasına səbəb olur. Sitokininlərin səviyyəsinin artmasının mümkün mexanizmlərindən biri (xüsusi ilə də IL-6) fiziki yüklənmələrin təsiri zamanı dayaq-hərəkət aparatının mikrozədələnmələridir. Elmi ədəbiyyatın məlumatına əsasən fiziki yükləmələrin təsiri altında sitokin qəfəsdə baş verən dəyişikliklər iltihab və septik dəyişikliklərlə uyğunluq təşkil edir (Подколзина, 2005; Стерлинг и др., 2013). Suzuki və həm-müəlliflərin icmal məqaləsində məşq təlimlərindən sonra qanda sitokinlərin səviyyəsinin analizi üzrə bir sıra tədqiqatların yekunu verilmişdir (Suzuki et al., 2002). Fiziki yükləmələrə cavab olaraq iltihab əleyhinə sitokinlərin səviyyəsi daha çox dəyişilmişdir məsələn IL-1-in (interleykin-1reseptorunun antaqonisti olan sitokin) qanda qatılığının artması. Buna bənzər dəyişikliklər IL-4-ün qatılığında da müşahidə edilmişdir. Eksperimental olaraq sübut olunmuşdur ki, böyük fiziki yükləmələr orqanizmin iltihaba qarşı reaksiyasının sürətləndirə bilər. Belə bir reaksiyanı IL-6-da yarada bilər (Padgett and Glaser, 2003). Onun səviyyəsinin artmasının əzələ toxumasının zədələnməsi ilə əlaqədar olduğu da sübut olunmuşdur (Таймазов и др., 2003).

## NƏTİCƏLƏR

1. Yüksək dərəcəli idmançıların immun statusu fiziki yüklərin icrasından əvvəl nəzarət qrupunun göstəricilərindən fərqlənmir, bu onlar üçün nəzərdə tutulan yüklərin həcminə adaptasiyasın getdiyini təsdiq edir.
2. Böyük həcmli fiziki yüklərin icrasından sonra periferik qanda hüceyrə və humoral immunitetin göstəricilərindən olanT-hüceyrələrin CD4+(xelperlərin), CD22+(supressorların) miqdarınınqorunması, CD8+(supressorların), CD16+(killerlərin) yüksəlməsi, həmçinin də immunoqlobulinlərin əsas siniflərinin azalması, iltihab yaradan və iltihaba əks olan IL-1, IL-2, IL-6, IL-8, ŞNA sitokininlərin artmasıimmun statusunda baş verən funksional dəyişikliklərinin dinamikasını əks etdirir, bu da müvəqqəti xarakter daşıyır və heç bir immunokorreksiyanı tələb etmir.
3. Yüksək dərəcəli idmançıların immun sisteminin funksional vəziyyətinin fiziki hazırlığının çoxillik mərhələlərində tədqiqinin davam etdirilməsi bu sistemin müqayisəli qiymətləndirilməsini aparmaqla yanaşı uzunmüddətli fiziki yüklərin müddətinin və intensivliyinin nəzərə alınması ilə immunoprofilaktika və immunoreabilitasiyası üçün səmərəli proqramların yaradılmasına imkan verəcəkdir.

## ƏDƏBİYYAT


**Агаева С.Э., Алибекова С.С.** (2015) О взаимосвязи между физической нагрузкой, окислительным стрессом и иммунной реакцией. *Медико-биологические аспекты физической культуры и спорта*. Москва, с. 121-123.

**Алибекова С.С.** (2016) К изучению связи между иммунными и липидными показателями у спортсменов. *Научные труды V Съезд Физиологов СНГ*. Россия: Сочи-Дагомыс, с. 188

**Антонова И.** (2006) Иммунитет. Москва, 96 с.

**Бацков С.С.** (2003) Основы клинической иммунологии СПб.: Олимп, 121 с.

**Высочин Ю.В., Денисенко Ю.П.** (2002) Современные представления о физиологических механизмах срочной адаптации организма спортсменов к воздействиям физических нагрузок. *Теория и практика физ. Культуры,* **№7:** 2-6.

**Гаврилова Е.А.** (2009) Стрессорный иммунодефицит у спортсменов. М.: Сов. спорт, 192 с.

**Дорофеева Е.Е.** (2008) Влияние значительных физических загрузок на состояние иммунной системы спортсменов с очагами хронической инфекции. *Укр. мед. альманах,* **11(№1):** 174-176.

**Житписбаева Х.С.** (2010) Особенности влияния стрессовых факторов на клеточное звено иммунной системы. *Теория и эксперимент. Медицина*, **№3:** 8-12.

**Зурочка А.В., Журило О.В., Сашенков С.Л.** (2005) Динамика изменения состояния иммунной системы спортсменов различных специализаций в течение годового цикла тренировочного процесса. *Мед. иммунол*., **2/3(№7):** 223.

**Исаев А.П., Личагина С.А., Аминов А.С.** (2004) Физиология иммунной системы спортсменов. *Спорт. Иммунитет. Адаптация. Здоровье*. Челябинск: ЮУрГУ, с. 199

**Казьмин В.Д.** (2005) Иммунитет. М.: Феникс, 162 с.

**Коган О.С. Савельева В.В.** (2009) Особенности иммунорезистентности организма представителей циклических видов спорта в различные периоды тренировочного процесса. *Теория и практика физ. культуры*, **№1:** 31-36.

**Лебедев К.А., Понякина И.Д.** (2003) Иммунная недостаточность. Выявление и лечение. М.: Мед. книга, 443 с.

**Малахова Г.** (2010) Эффективные способы повышения иммуниета. М.: 160 с.

**Мирошниченко С.** (2007) Уникальные способности восстановления и повышения иммунитета. Москва: БАО, 224 с.

**Насолодин В.В., Зайцев О.Н., Ладких И.П.** (2005) Обеспеченность железом и состояние иммунологической реактивности у студентов-спортсменов в разное время года. *Гигиена и санитария*, **№2:** 45-49.

**Першин Б.Б., Гелиев А.Б., Чуракова Г.Г. и др.** (2003) Длительное изучение сывороточных иммуноглобулинов у профессиональных лыжниц в тренировочном периоде. *Иммунология,* **24(№5):** 298-304.

**Платонов В.Н.** (2013) Периодизация спортивной тренировки. К.: Олимп. лит., 624 с.

**Плисов В., Харченко Т.** (2012) Укрепляем иммунитет. М.: 223 с.

**Подколзина В.А.** (2007) Иммунитет. Как защитить себя от болезней. М.: АСТ, 127 с.

**Потявина Е.В.** (2012) Иммунитет. Лучшие методы восстановления. М.: АРИА АиФ, 128 с.

**Романова О.** (2010) Иммунитет без лекарств. Москва: Вектор, 128 с.

**Сашенков С.Л., Колупаев В.А., Долгушин И.И.** (2008) Взаимосвязь показателей фагоцитоза у спортсменов с анаэробным и аэробным энергообеспечением мышечной деятельности. *Рос. иммунол. журн.,* **2(11)(№2-3):** 184.

**Стерлинг Ю.И., Кнорранг Г.Ю., Сизякина Л.П.** (2013) Особенности регуляции иммунной

системы при высокой физической активности. *Цитотоксины и воспаления*, **№2:** 29-41.

**Стернин Ю.А., Сизякина Л.П.** (2007) Изучение особенностей состояния иммунной системы при высокой физической активности. *Акт. вопр. терапии*, **№4:** 31-34.

**Суздальницкий Р.С., Левандо В.А.** (2003) Новые подходы к пониманию спортивных стрессорных иммунодефицитов. *Теория и практика физ. Культуры*, **№1:** 18-22.

**Таймазов В.А., Цыган В.Н., Мокеева Е.Г.** (2003) Спорт и иммунитет. СПб.: Олимп. СПб., 200 с.

**Цыган В.П., Спальный А.В., Макеева Е.Г.** (2012) Спорт. Иммунитет. Питание. СПб.: 240 с.

**Черешнев В.А., Юшков Б.Г., Климкин В.Г., Лебедева Е.Г.** (2002) Иммунофизиология. Екатеринбург: УрО РАН, 260 с.

**Dimitriou L., Sharp N. C., Dougherty M.** (2002) Circadian effects on the acute responses of Salivary cortisol and IgA in well trained swimmers. *British J. of Sports Medicine,* **36:** 260-264.

**Gleeson M., McDonald W.A., Cripps A.W. et al.** (2002) Exercise, stress and mucosal immunity in elite swimmers. *Advances in Experimental Med. Biology*, **371(A):** 571-574.

**Green K.J., Rowbottom D.G.** (2003) Exercise-induced changes to *in vitro* T-lymphocyte mitogen responses using CFSE. *J. of Applied Physiology*, **95:** 57-63.

**Green K.J., Rowbotton D.G., Mackinnon L.T.** (2002) Exercise and T-lymphocyte function comparison of proliferation in PBMC and NK cell-depleted PBMC culture. *J. Appl. Physiol*., **92(6):** 2390-2396.

**Heint H.G.** (2007) Stress. Biol. Med., 510 p.

**Kolupaiev V.A.** (2009) Authoref. of the diss. of Dr. of Sci. in biology. Chelyabinsk, 49 p.

**MacKinnon L.T.** (2000) Special feature for the Olimpics (effect of execise on the immunt system. *Immunol. Cell Biol*., **78(5):** 444-451.

**Marsland A.L., Bachen E.A., Cohen S. et al.** (2002) Stress, immune reactivity and susceptibility to infectious disease. *Physiology and Behavior*., **77:** 711-716.

**Moseley P.L.** (2000) Exercise, stress, and the immune conversation. *Exercise and Sports Sci. Rev.*, **28:** 128-132.

**Moynihan J.A.** (2003) Mechanisms of stress-induced modulation of immunity. *Brain, Behavior and Immunity*, **17 (suppl. 1):** 11-16.

**Nieman D.C.** (2003) Current perspective on exercise immunology. Curr. Sports Med. Rep, **2:** 239-242.

**Novas A.M., Rowbottom D.G., Jenkins D.G.** (2003) Tennis incidence of URTI and salivary IgA. *Int. J. of Sports Medicine*, **24:** 223-229.

**Padgett D.A., Glaser R.** (2003) How stress influences the immune response. *Trends in Immunol.*, **24:** 444-448.

**Pyne D.B., McDonald W. A., Gleeson M.et al.** (2001) Mucosal immunity, respiratory illness and competitive performance in elite swimmers. *Medicine and Science in Sports and Exercise*, **33:** 348-353.

**Shephard R.J., Shek P.N.** (2000) Does regular physical activity reduce susceptibility to cancer? *Exercise and Immune Function* (Shephard R.J., ed.). Philadelphia: Adis Int., p. 131-154.

**Smith L.L.** (2003) Overtraining, excessive exercise, and altered immunity. *Sports Medicine*, **33:** 347-364.

**Steensberg A., Morrow J., Toft A.D. et al.** (2002) Prolonged exercise, lymphocyte apoptosis and F2-iso-prostanes. *European J. of Applied Physiology*, **87:** 38-42.

**Suzuki K., Nakaji S., Yamoda M. et al.** (2002) Systemic inflammatory response to exhaustive exercise. Cytokine kinetics. *Exercise Immunology Review,* **8:** 6-48.

**West N.P., Pyne D.B., Kyd J.M.** (2008) The effect of exercise on innate mucosal immunity. *Br. J. Sports. Med*., **5:** 22-28.

## Изучение Имунного Статуса Спортсменов При Физической Нагрузке

**С.С. Алибекова**

*Азербайджанская государственная академия физической культуры и спорта*

Установлено, что иммунный статус квалифицированных спортсменов до выполнения тренировочных занятий не отличается от аналогичных показателей лиц референтной группы, что свидетельствует об адаптации иммунной системы к объему нагрузок. После выполнения тренировочных занятий с большими нагрузками, направленными на развитие специальной выносливости, иммунный статус спортсменов видоизменяется. Иммунологические сдвиги, возникающие после больших нагрузок, следует считать временными, и их немедикаментозная коррекция целесообразна лишь в случаях развития пограничных состояний со стороны иммунной системы.

***Ключевые слова:*** *Иммунитет, большие нагрузки, квалифицированный спортсмен, адаптация*

## The Study Of The Immune Status Of Athletes During Exercise

**S.S. Alibeyova**

*Azerbaijan State Academy of Physical Training and Sports*

Dynamics of the changes in the immune system parameters of the professional sportsmen was studied. It was found that the immune status of qualified athletes before training session did not differ from that of the reference group. This suggests adaptation of the immune system to the amount of training loads. After the training sessions with large loads aimed to develop the special endurance, immune status of athletes changed. Immunological changes arising after large training loads should be considered as temporary, and their non-pharmacological correction is appropriate only in borderline states of immune system.

***Keywords:*** *Immunity, large loads, qualified athlete, adaption*

# Abşerona İntroduksiya Edilmiş *Allium* L. Cinsinə Aid Bəzi Növlərin Toxumla Çoxaldılması

**S.Q. Quliyeva**

*AMEA Mərkəzi Nəbatat Bağı, M. Müşfiq küç., 103, Bakı AZ1004, Azərbaycan; E-mail: sevff@mail.ru*

**Məqalədə Naxçıvan MR-nın təbii florasında bitən *Allium* L. cinsinin (*A. callidictyon, A. lacerum, A. dictyoprasum, A. affine, A. fuscoviolaceum, A. waldsteinin, A. materculae, A. pseudoflavum, A. paczoskianum, A. cardiostemon, A. kunthianum, A. leucanthum, A. atroviolaceum, A. vineale, A. schoenoprasum, A. szovitsii, A. woronovii, A. akaka*) Abşerona introduksiya olunmuş bəzi yabanı növlərinin toxumla çoxaldılması öyrənilmişdir. Bütün introduksiya edilmiş soğan növləri toxumlarının cücərməsinə görə 3 tipə bölünmüşdür: 1. Dərin endogen sakitlik dövrü keçirən soğan növlər (*A.callidictyon, A. szovitsii*); 2. Qismən sakitlik dövrü keçirən soğan növləri (*A. rubellum, A.akaka, A. atroviolaceum*); 3. Toxumları sakitlik dövrünə malik olmayan digər soğan növləri (*A. waldsteinin, A. materculae* və s.).**

***Açar sözlər:*** *Naxçıvan florası***,** *yabanı soğanlar, introduksiya, toxumla çoxaldılma*

## GİRİŞ

Qafqazın bitki aləmi müstəsna zənginliyi və yüksək səviyyəli endemizmi ilə məşhurdur. İnsanların uzun müddətli təsərrüfat fəaliyyəti Qafqazın bitki aləmini çox dəyişdirmişdir. Son illər antropogen təsirlər nəticəsində ekosistemlər pozulmuş, orada bir çox bitkilərin, o cümlədən endem və nadir bitkilərin məhv olub getmək və ya ciddi genetik eroziyaya uğramaq təhlükəsi yaranmışdır.

Bu səbəbdən yabanı, nadir və nəsli kəsilməkdə olan ot bitkilərinin öyrənilməsi ən aktual məsələlərdən biridir. Bu baxımdan *Allium* L.cinsinin təbii florada bitən yabanı növlərinin introduksiyası, kultura şəraitində onların inkişaf biologiyasının və çoxaldılmasının öyrənilməsi olduqca aktualdır.

Soğanın əksəriyyət növləri kulturada toxumla çoxaldılır. Soğanlarda təbiətdə vegetativ çıxalmasının üstün olmasına baxmayaraq onların kultura şəraitində toxumla çoxaldılması mühüm əhəmiyyətə malikdir. Yəni, bu üsul cinsin çoxaldılmasında əsas vasitələrdən biridir. Qeyd etmək lazımdır ki, soğanların çoxunun toxumunun sakitlik vəziyyətində olma qabiliyyəti cücərtilərin vaxtından əvvəl əmələ gəlməsinə mane olur və torpaqda toxum ehtiyatının əmələ gəlməsinə səbəb olur, bununla da növün genofondunun qorunmasını təmin edir.

İntroduksiya şəraitində soğanların toxumla çoxaldılması üstünlük təşkil edir. Soğanlarda hər il çiçək qrupunda 200-1000-ə qədər cücərməyə tam yararlı toxumlar formalaşır. Bir çox soğan növləri kultura şəraitində toxumla öz-özünü bərpa edir. Soğan növlərinin bəzilərinin toxumu çətinliklə cücərir. Bütün bunlar kultura şəraitində introduksiya edilmiş soğanların toxumla çoxaldılmasının öyrənilməsini zəruri edir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat materialı kimi Naxçıvan MR-nın ərazisindən toplanmış və Mərkəzi Nəbatat Bağına introduksiya edilmiş 18 növ yabanı soğan növündən (*A. callidictyon, A. lacerum, A. dictyoprasum, A. affine, A. fuscoviolaceum, A. waldsteinin, A. materculae, A. pseudoflavum, A. paczoskianum, A. cardiostemon, A. kunthianum, A. leucanthum, A. atroviolaceum, A. vineale, A. schoenoprasum, A. szovitsii, A. woronovii, A. akaka*) toplanmış toxumlardan istifadə edilmişdir.

Soğanın əksəriyyət növləri toxumla çoxalma qabiliyyətinə malikdirlər.

Toxumun cücərməsinin morfoloji xüsusiyyəti və cücərtilərin inkişafı İ.Q.Serebryakovun (Серебряков, 1962) metodikası üzrə tədqiq edilmişdir. Öyrənilən növlərin toxumunun səpini oranjereyada qış-yaz-yay dövrlərində işıqda və havanın orta temperaturu +21°C-dən +26°C-ə qədər olan şəra-itdə aparılmışdır.

Toxumlar laboratoriya şəraitində Petri çaşkasında ikiqat filtir kağızının üzərində cücərdilmişdir. Toxumun cücərməyə başlaması, birinci yarpağın əmələ gəlməsi qeyd edilmişdir. Cücərtilərin bio-ölçülməsi bilavasitə birinci yarpağın əmələ gəlməsindən əvvəl ləpə yarpağı mərhələsindən aparılmışdır.

Soğanlarda təbiətdə vegetativ çoxalmasının üstün olmasına baxmayaraq, toxumla çoxaldılma da çox vacib əhəmiyyətə malikdir. Toxumla çoxaldılma cinsin növlərinin yayılmasının və kütləvi çoxaldılmasının əsas vasitələrindən biridir. Əksəriyyət soğanların toxumunun sakitlik vəziyyətində olma qabiliyyəti onun cücərtilərinin vaxtından əvvəl əmələ gəlməsinə mane olur. Bu isə torpaqda toxumun ehtiyatının əmələ gəlməsinə səbəb olur ki, bu da növün genofondunun qorunmasını təmin edir.

İntroduksiya şəraitində soğanların toxumla çoxaldılması üstünlük təşkil edir. Hər il soğanın öyrənilən növlərinin çiçək qrupunda 200-dən 1000-cən cücərməyə tam yararlı toxumlar formalaşır. Qeyd etmək lazımdır ki, bir çox soğanlar kultura şəraitində toxumla özü-özünü bərpa edir.

Bununla yanaşı olaraq, toxumu çətinliklə cücərən soğan növlərinə də rast gəlinir. Bütün bunlar kultura şəraitinə introduksiya edilmiş soğanların toxumla çoxaldılmasının hər tərəfli öyrənilməsini zəruri edir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Soğanın əksəriyyət növlərinin toxumu müsbət temperaturda cücərir, ancaq növlərin çoxu cücərmə qabiliyyətini yalnız quru saxlanma prosesində əldə edir. Cinsin bir sıra növlərinin toxumu dərin endogen sakitlik vəziyyətində olur və soyuq stratifikasiyaya ehtiyacı var.

Sakitlik vəziyyətində olan toxumların cücərmə qabiliyyətini müəyyən etmək üçün introduksiya edilmiş soğanların təzə yığılmış toxumlarının laboratoriya şəraitində cücərməsinin yoxlanılması üzrə təcürbələr qoyulmuşdur.

*A. cardiostemon, A. viride, A. waldsteinin, A. pseudoflavum, A. dictyoprasum, A. fuscoviolaceum, A. materculae, A. vineale, A. affine, A. mariae*-nin təzə yığılmış toxumları 2-4 gün ərzində cücərir. *A. woronovii, A. lacerum*-un toxumları 1-2 həftədən sonra cücərməyə başlayır. Bütün bu növlərin toxumunda toxumun endogen sakitli dövrü yoxdur. Əksəriyyət hallarda toxumların cücərmə faizi yüksəkdir (80%-dən çox). Ədəbiyyat məlumatına görə (Даева, 1971; Даева, 1968) *A. dictyoprasum*-un toxumunda sakitlik dövrünün mövcud olduğu qeyd edilir, ancaq bizim aldığımız nəticələr bunu təsdiq etmədi.

Bütün efemeroid soğanların, həmçinin *A. akaka*-nin təzə toxumları cücərmir. *A. rubellum* və *A. atroviolaceum*-da toxumların tək-tək cücərməsi müşahidə olunur. Dərin sakitlik dövrünə malik olan efemeroid soğanlardan fərqli olaraq, bu növlər dərin olmayan fizioloji sakitlik mərhələsinə malikdirlər.

Beləliklə, efemeroid növlərin toxumu dərin üzvü sakitlik dövrünə malikdir, arid şəraitdə bitən soğanın digər kserofit növlərin toxumunun bir hissəsində də sakitlik dövrü aşkar edilmişdir (Даева, 1968). Buna cücərtilərin yayın quraqlığından qorunmasına uyğunlaşma kimi baxmaq olar. Buna görə də, növün vegetasiya dövrü nə qədər qısa olarsa, toxumun sakitlik dövrü bir o qədər dərin olar və yaxud əksinə, növün vegetasiya dövrü nə qədər uzun olarsa, toxumun sakitlik dövrü bir o qədər qısa olar.

İntroduksiya edilmiş soğanların toxumunun cücərməsinin optimal rejimini təyin etmək üçün Petri çaşkasında +10, +15, +20°C temperaturda təcrübə qoyulmuşdur. Təcrübədə soğan toxumları otaq şəraitində 6 ay saxlanıldıqdan sonra istifadə edilmişdir. Toxumların cücərməsinin qeydiyyatı 1 ay ərzində aparılmışdır.

Aparılmış təcrübənin nəticələri cədvəldə verilmişdir. *A. affine, A. akaka, A. lacerum* və başqalarında müxtəlif temperatur rejimində yüksək cücərmə faizi (>80%) qeydə alınmışdır.

**Cədvəl.** Müxtəlif temperatur rejimində soğan toxumlarının laboratoriya şəraitində cücərməsi/

| Növ | Cücərmə temperaturu, °C | Cücərmiş toxumlar, % | Cücərməmiş toxumlar, % | | Səpindən cücərmənin başlamasına qədər olan dövr, gün |
|---|---|---|---|---|---|
| | | | sağlam | çürük | |
| 1 | 2 | 3 | 4 | 5 | 6 |
| | 10 | - | - | - | - |
| *A. callidictyon* | 15 | 2 | 2 | 2 | 13 |
| | 20 | 2 | 2 | 2 | 10 |
| | 10 | 27 | 27 | 27 | 9 |
| *A. lacerum* | 15 | 78 | 78 | 78 | 5 |
| | 20 | 93 | 93 | 93 | 3 |
| | 10 | 21 | 21 | 21 | 7 |
| *A. dictyoprasum* | 15 | 30 | 30 | 30 | 4 |
| | 20 | 50 | 50 | 50 | 2 |
| | 10 | 90 | 90 | 90 | 7 |
| *A. affine* | 15 | 88 | 88 | 88 | 5 |
| | 20 | 95 | 95 | 95 | 3 |
| | 10 | 56 | 56 | 56 | 6 |
| *A. fuscoviolaceum* | 15 | 46 | 46 | 46 | 3 |
| | 20 | 81 | 81 | 81 | 2 |
| | 10 | 32 | 32 | 32 | 6 |
| *A. waldsteinin* | 15 | 38 | 38 | 38 | 5 |
| | 20 | 66 | 66 | 66 | 4 |

*Cədvəlin davamı*

| 1 | 2 | 3 | 4 | 5 | 6 |
|---|---|---|---|---|---|
| *A. materculae* | 10<br>15<br>20 | 76<br>75<br>89 | 76<br>75<br>89 | 76<br>75<br>89 | 7<br>4<br>2 |
| *A. pseudoflavum* | 10<br>15<br>20 | 78<br>65<br>81 | 78<br>65<br>81 | 78<br>65<br>81 | 7<br>5<br>3 |
| *A. paczoskianum* | 10<br>15<br>20 | 22<br>8<br>68 | 78<br>87<br>31 | -<br>5<br>1 | 8<br>5<br>2 |
| *A. cardiostemon* | 10<br>15<br>20 | 48<br>19<br>70 | 52<br>71<br>16 | -<br>10<br>14 | 8<br>5<br>3 |
| *A. kunthianum* | 10<br>15<br>20 | 51<br>33<br>72 | 49<br>64<br>24 | -<br>3<br>4 | 8<br>5<br>2 |
| *A. leucanthum* | 10<br>15<br>20 | 20<br>15<br>33 | 80<br>85<br>60 | -<br>-<br>7 | 7<br>5<br>2 |
| *A. atroviolaceum* | 15<br>20<br>20 | 15<br>33<br>30 | 85<br>60<br>70 | -<br>7<br>- | 5<br>2<br>3 |
| *A. vineale* | 10<br>15<br>20 | 63<br>73<br>79 | 37<br>27<br>19 | -<br>-<br>2 | 7<br>4<br>2 |
| *A. schoenoprasum* | 10<br>15<br>20 | 59<br>63<br>91 | 41<br>35<br>8 | -<br>2<br>1 | 5<br>3<br>2 |
| *A. szovitsii* | 10<br>15<br>20 | -<br>1<br>- | 100<br>99<br>100 | -<br>-<br>- | -<br>22<br>- |
| *A. woronovii* | 10<br>15<br>20 | 63<br>57<br>64 | 37<br>42<br>33 | -<br>1<br>3 | 8<br>5<br>4 |
| *A. akaka* | 10<br>15<br>20 | 81<br>93<br>69 | 16<br>5<br>29 | 3<br>2<br>2 | 6<br>3<br>3 |

Soğanın toxumu +10°C temperaturda 6-11 gündən, +15°C temperaturda 3-5 gündən və +20°C temperaturda isə 2-3 gündən sonra cücərməyə başlayır. Əksəriyyət növlər üçün toxumun cücərmə sürətinin səpindən sonra maksimum 5-10 gün olması xarakterikdir. Növlərin çoxunun toxumu 5-15 gün ərzində cücərir.

*A. materculae, A. vineale, A. affine, A. pseudoflavum,* və başqalarının toxumlarının cücərməsi geniş temperatur amplitudasına malikdir. Soğanın əksəriyyət növlərində temperatur yüksəldikcə to-xumların cücərmə faizi artır (məsələn, *A. lacerum*-da 27-dən 93%-cən). Bəzilərində (*A. pseudoflavum, A. fuscoviolaceum, A. paczoskianum, A. viride*) temperatur +15°C olduğu zaman cücərmənin azalması müşahidə olunur. *A. akaka*-da isə əksinə, toxumların cücərməsi üçün optimal temperatur +15°C-dir.

*A. dictyoprasum, A. atroviolaceum, A. viride, A. rubellum*-un toxumları bütün temperatur rejimlərində 50%-dən az cücərti verirlər. Görünür ki, bu soğanların toxumunun bir həssəsi sakitliyin fizioloji dövrünə malikdirlər.

*A. callidictyon, A. szovitsii*-n toxumları praktiki olaraq cücərti vermir. Bu növlər toxumun dərin endogen sakitlik dövrü ilə xarakterizə olunurlar və onların cücərdilməsi üçün soyuq stratifikasiya lazımdır.

Biz bu iki növ efemeroid soğanın (*A.callidictyon, A. szovitsii*) stratifikasiya edilmiş toxumlarının cücərməsi üzərində təcrübə aparmışıq. Stratifikasiya iki ay ərzində soyuducuda nəm qumda +5°C temperaturda aparılmışdır. Cücərmə bir aydan sonra başlayır və ümumi toxumların 65-87%-i cücərir. Deməli, soyuq stratifikasiya toxumun endogen sakitlik dövrünü pozur və buna görə də ondan efemeroid soğanların çoxaldılmasında istifadə etmək olar.

Açıq şəraitdə soğan toxumlarının ən yaxşı səpin müddətini təyin etmək üçün yazda, payızda və qışda toxumların səpini üzrə təcrübə qoyulmuşdur. Yaz səpini zamanı soğanların cücərməsi tək-tək olur. Payız səpini zamanı isə qənaətbəxş sayda cücərtilərin alınması müşahidə olunur. Soğanın bütün növləri üçün qış səpini ən yaxşı nəticə vermişdir. Belə ki, efemeroid soğanların qış səpini zamanı çox yüksək cücərti faizi alınır (90% və daha çox).

Beləliklə, aparılan analizlər göstərdi ki, *Allium* cinsinin müxtəlif növlərinin toxumunun cücərmə xarakterini xeyli dərəcədə onların növ xüsusiyyətləri müəyyənləşdirir. Növlərin xüsusiyyəti isə M.V.Kultiasov (Культиасов, 1963) və O.V.Dayevin (Даева, 1971) qeyd etdiyi kimi yalınız müasir iqlim şəraitinin təsiri altında deyil, növün bütün tarixi formalaşması ərzində müəyyənləşir. Bütün introduksiya edilmiş soğanları toxumlarını cücərmə tipinə görə 3 qrupa bölmək olar:

1. Dərin endogen sakitlik dövrü keçirən soğan növlər (*A.callidictyon, A. szovitsii*).
2. Qismən sakitlik dövrü keçirən soğan növləri (*A. rubellum, A.akaka, A. atroviolaceum*).
3. Toxumları sakitlik dövrünə malik olmayan digər soğan növləri (*A. waldsteinin, A. materculae* və s.).

Toxumların cücərməsini müəyyənləşdirən faktorlar arasında temperatur vacib faktorlardan biridir. Soğanın növlərinin çoxu yüksək temperaturda daha yaxşı cücərir (+20°C).

Həmçinin aşkar olmuşdur ki, toxumun sakitlik dövrü onların kütləsindən də asılıdır. Belə ki, toxumun mütləq çəkisi nə qədər çox olarsa, onun endogen sakitli dövrü bir o qədər dərin olar. Bu efemeroid soğanlarda yaxşı ifadə olunmuşdur (*A.callidictyon, A. szovitsii* və b.). Toxumunun mütləq çəkisi kiçik olan soğanlar (*A. schoenoprasum, A. fuscoviolaceum, A. pseudoflavum*) tez cücərir və onların toxumları sakitlik dövrünə malik olmur.

Açıq şəraitdə soğanların optimal səpin müddəti qış səpinidir. Bir sıra soğanlar müntəzəm surətdə toxumla təbii yolla özü-özünü bərpa edir. Bizim kolleksiyadakı bir sıra soğan növlərində təbii yolla özü-özünü bərpa etmə qeyd edilmişdir (*A. dictyoprasum, A. schoenoprasum, A. pseudoflavum, A. vineale, A. viride, A. affine* və s.). Bu isə həmin növlərin Abşeron şəraitində yaşıllaşdırma işlərində uğurla istifadə edilməsinin göstəricisidir.

## ƏDƏBİYYAT

**Даева О.В.** (1971) Ритм развития кавказских видов лука в Подмосковье. *Бюлл. ГБС*, **вып. 82:** 27-31.

**Даева О.В.** (1968) Биологические особенности прорастания семян кавказских видов лука. *Бюлл. ГБС*, **вып.71:** 41-46.

**Культиасов М.В.** (1963) Экологические основы интродукции растений природной флоры. *Труды ГБС АН СССР*, **№9:** 257-280.

**Серебряков И.Г.** (1962) Экологическая морфология растений: Жизненные формы покрытосеменных и хвойных. М.: Высшая школа, 378 с.

## Семенное Размножение Некоторых Видов Из Рода *Allium* L., Интродуцированных На Апшерон

**С.Г. Кулиева**

*Центральный ботанический сад НАН Азербайджана*

В статье приводятся данные изучения семенного размножения интродуцированных на Апшерон некоторых дикорастущих видов из рода *Allium* L. (*A. callidictyon, A. lacerum, A. dictyoprasum, A. affine, A. fuscoviolaceum, A. waldsteinin, A. materculae, A. pseudoflavum, A. paczoskianum, A. cardiostemon, A. kunthianum, A. leucanthum, A. atroviolaceum, A. vineale, A. schoenoprasum, A. szovitsii, A. woronovii, A. akaka*), распространенных в естественной флоре Нахчыванской АО. Все интродуцированные виды луковичных по всхожести семян разделены на 3 типа: 1) Виды с глубоким эндогенным периодом покоя (*A.callidictyon, A. szovitsii*); 2) Виды лука с частичным периодом покоя (*A. rubellum, A.akaka, A. atroviolaceum*); 3) Другие виды лука, семена которых не имеют периода покоя (*A. waldsteinin, A. materculae* и др.).

***Ключевые слова:*** *Нахчыванская флора, дикорастущий лук, интродукция, семенное размножение*

**The Seed Propagation Of Some *Allium* L. Species Introduced In Absheron**

**S.G. Guliyeva**

*Central Botanical Garden, Azerbaijan National Academy of Sciences*

The seed propagation of some wild species of the genus *Allium* L (*A.callidictyon, A. lacerum, A. dictyoprasum, A. affine, A. fuscoviolaceum, A. waldsteinin, A. materculae, A. pseudoflavum, A. paczoskianum, A. cardiostemon, A. kunthianum, A. leucanthum, A. atroviolaceum, A. vineale, A. schoenoprasum, A. szovitsii, A. woronovii, A. akaka)* introduced in Absheron and growing in the Nakchivan flora were studied. All the introduced onion species were divided into 3 type for their seed germination: 1) The species with deep endogenous silence period (*A.callidictyon, A. szovitsii)*; 2) Onion species with the partially silence period (*A. rubellum, A.akaka, A. atroviolaceum)*; 3) Onion species with the non-silence seed period *(A. waldsteinin, A. materculae*).

***Key words:*** *Flora of Nakchivan, wild onion, introduction, seed propagation*

# AKADEMİK QƏRİB MƏMMƏDOV - 70



Torpaqşünaslıq və ekologiya elmləri sahəsində görkəmli alim, biologiya üzrə elmlər doktoru, professor, AMEA-nın aqrar məsələlər üzrə müşaviri, AMEA-nın Torpaqşünaslıq və Aqrokimya İnstitutunun Torpaqların aqroekologiyası və bonitirovkası laboratoriyasının müdiri, Bakı Dövlət Universitetinin Torpaqşünaslıq kafedrasının müdiri, akademik Qərib Məmmədov 6 yanvar 1947-ci ildə Ermənistan Respublikasının Ağbaba mahalının Amasiya rayonunun Yeniyol kəndində anadan olmuşdur.

1970-ci ildə V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun Coğrafiya-biologiya fakültəsini fərqlənmə ilə bitirdikdən sonra Azərbaycan Kənd Təsərrüfatı Nazirliyinin Elmi-tədqiqat Eroziya Bölməsində laborant kimi əmək fəaliyyətinə başlamışdır. Alim 1972-ci ildən elmi fəaliyyətini Azərbaycan Elmlər Akademiyasının Torpaqşünaslıq və Aqrokimya İnstitutunda davam etdirmişdir. Bir il sonra həmin elmi müəssisədə əyani aspiranturaya qəbul olunan Q.Məmmədov 1978-ci ildə "Mil düzünün qərb hissəsinin otlaq torpaqlarının aqroekoloji xarakteristikası və bonitirovkası" mövzusunda dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmişdir. 1979-cu ildə SSRİ AAK tərəfindən Q.Məmmədova aqrar elmlər üzrə fəlsəfə doktoru elmi dərəcəsi verilmişdir. Akademik doktorluq dissertasiyasını isə 1991-ci ildə Dnepropetrovsk Dövlət Universitetində "Azərbaycanın kənd təsərrüfatı və meşə altında olan torpaqlarının ekoloji qiymətləndirilməsi" mövzusunda müdafiə etmişdir. Alim 1992-ci ildə SSRİ AAK tərəfindən ekologiya ixtisasi üzrə biologiya üzrə elmlər doktoru elmi dərəcəsini və professor elmi adını almışdır.

Akademik Qərib Məmmədovun elmi fəaliyyətinin 45 illik bir dövrü AMEA-nın Torpaqşünaslıq və Aqrokimya İnstitutu ilə bağlıdır. Alim institutda kiçik elmi işçidən bu elmi müəssisənin direktoru vəzifəsinə qədər böyük bir yol keçmişdir. 1972-1980-ci illərdə institutun Torpaqların aqroekologiyası və bonitirovkası laboratoriyasının kiçik elmi işçisi, 1980-1984-cü illərdə baş elmi işçisi, 1984-1994-cü illərdə isə laboratoriya rəhbəri işləmiş Q.Məmmədov 1994-2000-ci illərdə institutun direktoru, eyni zamanda «ixtisaslaşdırılmış müdafiə» və «elmi» şuralarının sədri olmuşdur.

52 fəlsəfə doktoru, 11 elmlər doktoru hazırlayan akademik Qərib Məmmədov torpaqşünaslıq və ekologiya sahələrində özünəməxsus elmi məktəb yaratmışdır. O, 700-ə yaxın elmi əsərin, o cümlədən 30 metodik tövsiyə və kitabçanın, 36 müəlliflik şəhadətnaməsi və patentin, 5 səmərəli təklifin, 20-dən çox dərslik və dərs vəsatinin, 30 monoqrafiyanın və bir neçə lüğətin müəllifidir.

Respublikamızda torpağın ekologiyası, relyefin plastikası nəzərə alınmaqla torpaq xəritəsinin tərtibi, torpağın bonitirovkası, demək olar ki, akademik Qərib Məmmədovun adı ilə bağlıdır. Aerokosmik şəkillərdə torpaq örtüyünün tədqiqi, onlardan alınan zəngin informatik material və onun təşkili işi akademik sayəsində inkişaf etmişdir. Alim Azərbaycanın torpaq ehtiyatları və onlardan səmərəli istifadə olunması, torpaq örtüyü quruluşunun qiymətləndirilməsi, deqradasiya olunması, torpaqların qiymətləndirilməsi, Azərbaycan torpaqlarının aqroekoloji xüsusiyyətlərinin və bonitirovkasının öyrənilməsi, ilk dəfə Azərbaycan Respublikası torpaqlarının ekoloji qiymət xəritəsinin tətbiqi, torpağın iqtisadi qiymətləndirilməsinin elmi əsasları, torpaq münbitliyinin konseptual və riyazi modelləşdirilməsi, Azərbaycanın ekoloji problemlərinin sistem halında öyrənilməsi konsepsiyasının işlənilməsi, Azərbaycan torpaq kadastrının rayonlaşdırılması və monitorinqi, Azərbaycan torpaq atlası, meşəaltı torpaqların qorunması məqsədilə bərpa olunan enerji mənbələrindən istifadənin ekoloji qiymətləndirilməsi və s. sahələrdə sanballı kitabların, elmi araşdırmaların müəllifidir.

Alim tərəfindən Azərbaycan Respublikası üzrə torpaqların aqroekologiyası və bonitirovkası, torpaqların ekoloji münbitlik modelləri, torpaqların coğrafi-yayılma qanunauyğunluqları müəyyən edilmiş və xəritələşdirilməsi aparılmış, torpaq örtüyü strukturası tədqiq edilmişdir. Akademik landşaft komplekslərinin və torpaq kadastr rayonlarının ekoloji qiymətləndirilməsi, ekoloji monitorinqi aparılmış, ekoloji qiymət xəritəsi və Azərbaycan, rus və ingilis dillərində Ekoloji atlaslar və Respublikanın ekoloji konsepsiyası hazırlanmışdır. İlk dəfə relyef

plastikası əsasında Azərbaycan Respublikasının yeni torpaq xəritəsi və Torpaq atlası hazırlanmış, məkan məlumatlarının idarəolunması və torpaq inzibatçılığı, torpaqların ekoetik problemləri və onların həlli yolları verilmişdir.

Akademik Qərib Məmmədovun qazandığı elmi uğurlar, yüksək təşkilatçılıq qabiliyyəti həmişə ölkəmizdə və xaricdə yüksək qiymətləndirilmişdir. O, 1992-ci ildən Beynəlxalq Ekoenergetika Akademiyasının akademiki, 2000-ci ildən AMEA "Xəbərlər (biologiya elmləri seriyası)" jurnalının baş redaktorunun müavini, Rusiya Ekologiya Akademiyasının akademiki, Beynəlxalq "Neosfer" Akademiyasının həqiqi üzvü, 2001-ci ildən AMEA-nın müxbir üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının akademiki, Beynəlxalq Torpaqşünaslıq Cəmiyyətinin ömürlük üzvü, Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının Ekspert Şurasının üzvü, Azərbaycan Torpaqşünaslıq Cəmiyyətinin prezidenti, Beynəlxalq Elmlər Akademiyasının (Avstriya) akademiki, Bioloji müxtəlifliyin genetik ehtiyatları üzrə Dövlət Komissiyasının üzvü seçilmişdir. Alim 2002-ci ildə Azərbaycan Respublikası ilə Rusiya, eləcə də Gürcüstan arasında dövlət sərhədinin delimitasiya və demarkasiyası dövlət komissiyalarının sədr müavini, Milli Ensiklopediya Şurasının üzvü təyin olunmuş, 2007-ci ildə AMEA-nın həqiqi üzvü, 2012-ci ildən Moldova Torpaqşünaslar Cəmiyyətinin fəxri üzvü seçilmişdir.

O, Birinci çağırış (1995) Azərbaycan Respublikası Milli Məclisinin deputatı olmuş, Azərbaycan Respublikasının Dövlət Torpaq Komitəsinin (1997), Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin (2001) sədri vəzifələrində çalışmışdır. 2011-2016-cı illərdə AMEA Aqrar Elmlər Bölməsinin akademik-katibi olmuş, 2016-cı ildə AMEA-nın aqrar məsələlər üzrə müşaviri vəzifəsinə təyin edilmişdir. Bununla yanaşı, hazırda Biologiya və Tibb Elmləri Bölməsinin büro üzvü, «AMEA-nın xəbərləri (biologiya elmləri seriyası)» jurnalının baş redaktorunun müavinidir.

Akademikin "Azərbaycan Respublikasının Milli Atlası" və dövlət əhəmiyyətli "Cənubi Qafqaz. 1903-cü il" xəritəsinin hazırlanmasındakı rolunu xüsusi qeyd etmək lazımdır.

Qərib Məmmədov elmlə yanaşı, ayrı-ayrı illərdə Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyası və Bakı Dövlət Universitetində pedaqoji fəaliyyətlə də məşğul olmuşdur. O, 1980-ci illərdən etibarən V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun (hazırki Azərbaycan Dövlət Pedaqoji Universiteti) Coğrafiya fakültəsində "Torpaqşünaslıq", "Torpaq coğrafiyası" və "Ekologiya" fənlərindən, 1998-2015-cı illərdə Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında isə "Torpaq islahatı"na və "Ekologiya məsələləri"nə həsr olunmuş mühazirələr demişdir. Onun müəllifi olduğu "Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları", "Torpaq eroziyası və mühafizəsi", iki hissədən ibarət olan "Aqroekologiya", "Geodeziya", "Hərbi topoqrafiya və geodeziyanın əsasları", "İnsan ekologiyası", "Sosial ekologiya" kimi dərslik və dərs vəsaitləri bu gündə aidiyyati ali təhsil ocaqlarında pedaqoqlar tərəfindən geniş şəkildə istifadə olunmaqdadır. Akademik BDU-da Torpaqşünaslıq kafedrası yaradıldığı vaxtdan – 2004-cü ildən ona rəhbərlik edir.

Akademik Qərib Məmmədovun fəaliyyəti həmişə ölkəmizdə və xaricdə yüksək qiymətləndirilmişdir. O, 1987-ci ildə bonitirovka, aqroekologiya və xəritəçilikdə qazandığı elmi uğurlarına görə SSRİ Xalq Nailiyyətləri Sərgisinin bürünc medalına, V.V.Dokuçayev adına medalına layiq görülmüşdür. 1997-ci ildə elmi nəticələri, elmi-təşkilati və pedaqoji fəaliyyətinə görə akademik H.Əliyev adına mükafat, fəxri diplom və medalla təltif olunmuşdur. 2001-ci ildə Rusiya Təbiət Elmləri Akademiyasının qızıl medalına, 2012-ci ildə Avrasiya Araşdırma Rəy Mərkəzi tərəfindən respublika respondentlər arasında keçirilən rəy sorğusunun nəticələrinə əsasən, respublikada torpaq islahatlarının aparılmasında və torpaq ehtiyatlarından səmərəli istifadəsində xidmətlərinə görə "Qızıl Kürə" Milli Mükafatı ilə təltif olunmuşdur. 2013-cu ildə Kembric Universitetinin sertifikatına və "Əsrin tanınmış alimi" Beynəlxalq diplomuna, 2017-ci ildə isə "Şöhrət" ordeninə layiq görülmüşdür.

Akademik Qərib Məmmədovu 70 illik yubileyi münasibətilə səmimi qəlbdən təbrik edir, ona uzun ömür, cansağlığı, elmi-pedaqoji fəaliyyətində yeni-yeni nailiyyətlər arzulayırıq.

# AMEA-nın MÜXBİR ÜZVÜ İBRAHİM ƏZİZOV – 70



İbrahim Vahab oğlu Əzizov 5 avqust 1947-ci ildə Zaqatala rayonunun Qarqay kəndində anadan olmuşdur. İlk təhsilini 1953-cü ildə Zaqatala rayonunun Qaraqay kənd yeddiillik məktəbində almışdır. 1961-ci ildə məktəbi əla qiymətlərlə bitirmiş və Zaqatala Kənd təsərrüfatı texnikumuna daxil olmuşdur. 1965-ci ildə texnikumu fərqlənmə diplomu ilə bitirərək təyinatla kolxozda işləməyə başlamışdır. 1966-cı ildə Azərbaycan Dövlət Universitetinin (hazırkı Bakı Dövlət Universiteti) Biologiya fakultəsinə daxil olmuşdur. 1971-ci ildə universiteti fərqlənmə diplomu ilə bitirmiş və Zaqatala rayonunun Qandax və Mosul kənd orta məktəblərində biologiya və kimya fənnlərini tədris etmişdir. 1972-ci ildə "Bitki fiziologiyası" ixtisası üzrə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun aspiranturasına daxil olmuş və məhsuldarlıqlarına görə fərqlənən müxtəlif buğda sortlarının ontogenezində xloroplastların fotokimyəvi fəallığını tədqiq etmişdir. Aspirantura müddətində tədqiqatlarını ET Əkinçilik İnstitutunda Cəlal Əliyevin rəhbərlik etdiyi Bitki fiziologiyası və biokimyası şöbəsində yerinə yetirmişdir.

1978-ci ildə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun nəzdində Cəlal Əliyevin rəhbərliyi ilə Fotosintezin fiziologiyası laboratoriyası təşkil olunmuş və İbrahim Əzizov həmin laboratoriyanın ilk əməkdaşı olmuşdur. Bir neçə ildən sonra Cəlal Əliyevin Sovet İttifaqının elm mərkəzlərinə göndərdiyi gənc mütəxəssislər geri qayıdaraq intensiv elmi tədqiqatlara cəlb olunmuşlar. 1987-ci ildə Fotosintezin fiziologiyası laboratoriyasının əsasında dörd laboratoriyadan ibarət Məhsuldarlıq proseslərinin molekulyar-genetik əsasları şöbəsi təşkil olunmuşdur. 2010-cu ildə şöbə daha da genişləndirilmiş və müasir dövrün tələblərinə uyğun olaraq adı "Bioloji məhsuldarlığın fundamental əsasları" kimi redaktə olunmuşdur. İbrahim Əzizov şöbənin tərkibində yeni yaradılan Xloroplastların fotokimyası laboratoriyasının müdiri təyin olunmuşdur. 2016-cı ildə AMEA Botanika İnstitutunun Bioloji məhsuldarlığın fundamental əsasları bazasında Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu yaradılmışdır. Hal-hazırda İbrahim Əzizov laboratoriya müdiri kimi bu institutda öz fəaliyyətini uğurla davam etdirir.

İ.V. Əzizov 1981-ci ildə akademik Cəlal Əliyevin rəhbərliyi ilə "*Müxtəlif məhsuldar buğdanın ontogenezində xloroplastların fotosintez qabiliyyəti*" mövzusunda dissertasiya işini müdafiə edərək, "Bitki fiziologiyası" ixtisası üzrə biologiya elmləri namizədi elmi dərəcəsini almışdır.

O, öz tədqiqatlarını geniş şəkildə davam etdirmişdir. Alınan nəticələr əsasında 1994-cü ildə "*Məhsuldarlığı və becərilmə şəraiti ilə əlaqədar olaraq müxtəlif buğda sortlarının assimiləedici orqanlarından ayrılmış xloroplastlarda fotokimyəvi reaksiyaların fəallığı*" mövzusunda dissertasiya işini müdafiə edərək, biologiya elmləri doktoru elmi dərəcəsini almışdır. 2001-ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. 2017-ci ildə Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə professor elmi adına layiq görülmüşdür.

İbrahim Əzizov fotosintezin fiziologiyası sahəsində tanınmış mütəxəssisdir. Onun elmi fəaliyyəti müxtəlif buğda genotiplərinin fotosintez qabiliyyətinin tədqiqinə həsr olunmuşdur. Bitkilərin yetişkənlik müddəti və məhsuldarlığı arasında mövcud olan korrelyativ əlaqələr üzə çıxarılmışdır. O, eyni zamanda mühitin qeyri əlverişli amillərinin, o cümlədən, yüksək temperatur, quraqlıq və şoranlığın müxtəlif buğda genotiplərinin xloroplastlarına və məhsuldarlığına təsirini tədqiq etmişdir. Alınan nəticələr akademik Cəlal Əliyevin rəhbərliyi ilə yaradılan yeni buğda sortları içərisindən daha davamlı formaların üzə çıxarılmasına kömək etmişdir.

Bioloji məhsuldarlığın fundamental problemləri şöbəsinin əməkdaşları ilə birlikdə aparılan tədqiqatlarda müasir fizioloji, biokimyəvi və biotexnoloji metodları tətbiq etməklə ali bitkilərdə və birhüceyrəli yosunlarda duzadavamlılığın mexanizminin aydınlaşdırılması istiqamətində yeni məlumatlar əldə edilmişdir. AMEA Radiasiya Probemləri İnstitutunun əməkdaşları ilə aparılan tədqiqatlarda bir sıra bitki mənşəli radioprotektor xassəli fizioloji fəal maddələr alınmış, həmin maddələr bitki və

heyvan orqanizminə daxil edilərək onların şüa-qoruyucu xassələri tədqiq edilmişdir.

İbrahim Əzizovun rəhbərliyi ilə "*Abşeronun neftlə və neft məhsulları ilə çirklənmiş torpaqların bioremediasiya üsulunun işlənib hazırlanması*", "*Gəncə ətrafı irklənmiş torpaqların təmizlənməsində yeni üsulların tətbiqi*" mövzularında beynəlxalq layihələr yerinə yetirilmiş və çirklənmiş torpaqların təmizlənməsinin yeni, ekoloji təmiz və iqtisadi cəhətdən sərfəli metodu işlənib hazırlanaraq praktikaya tətbiq edilmişdir.

İ.V.Əzizov 241 elmi əsərin, o cümlədən 2 monoqrafiyanın müəllifidir. Onun elmi nəticələri bir sıra beynəlxalq konfranslarda təqdim olunmuş və bu sahədə çalışan mütəxəssislərin marağına səbəb olmuşdur. Alimin rəhbərliyi altında 7 fəlsəfə doktoru və 6 magistr hazırlanmışdır.

İbrahim Əzizov uzun illər Botanika İnstitutunun Elmi Şurasının və İnstitutun nəzdində olan Müdafiə Şurasının üzvü olmuşdur və bu gün uğurla öz fəaliyyətini davam etdirir. O, yeni yaradılmış AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutunun Elmi şurasının üzvüdür.

İbrahim Əzizov 2001-2016-cı illərdə AMEA Biologiya və Tibb Elmləri Bölməsinin akademik-katibinin müavini, 2011-2016-cı illərdə Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının biologiya elmləri üzrə Ekspert Şurasının sədri, "AMEA-nın Xəbərləri (biologiya elmləri seriyası)" jurnalının redaksiya heyətinin üzvü olmuşdur.

İbrahim Əzizov Ukrayna Genetiklər və Seleksiyaçılar, Radiobioloqlar cəmiyyətlərinin, "Orqanizmlərin eksperimental təkamülünün amilləri" jurnalının redaksiya heyətinin üzvüdür.

Alimin elmi yaradıcılıq fəaliyyəti pedaqoji fəaliyyəti ilə üzvi surətdə bağlıdır. O, 1985-ci ildən Bakı Dövlət Universitetinin Biologiya fakültəsində ixtisas dərslərini aparır, gənc kadrların hazırlanmasında fəal iştirak edir.

Elmdə əldə etdiyi nailiyyətlərə görə 2005-ci ildə "Şöhrət" ordeni ilə təltif edilmişdir.

# AMEA-nın MÜXBİR ÜZVÜ XƏLİL QASIMOV – 75



Xəlil Məmmədəli oğlu Qasımov 1942-ci ildə Bakı şəhərində anadan olmuşdur. 1960-ci ildə 160 saylı orta məktəbi bitirmiş və Azərbaycan Dövlət Universitetinin Fizika fakültəsinə daxil olmuşdur. 1965-ci ildə universiteti uğurla başa vurduqdan sonra Azərbaycan EA Fiziologiya İnstitutunda elmi fəaliyyətə başlamışdır. 1967-ci ildə Azərbaycan EA Rəyasət Heyətinin Sərəncamı ilə Moskvaya SSRİ EA Bioloji Fizika İnstitutuna ezam olunmuşdur. Bir ildən sonra SSRİ EA Biofizika İnstitutunda əyani aspiranturaya daxil olmuş və Bitki hüceyrəsi laboratoriyasında görkəmli sovet alimi, Rusiya EA-nın həqiqi üzvi, SSRİ Dövlət mükafatı laureatı, professor E.A.Libermanın rəhbərliyi altında tədqiqatlara başlamışdır. 1972-ci ildə böyük uğurla namizədlik dissertasiyasını müdafiə etmişdir. Onun apardığı elmi işlərin aktuallığını nəzərə alaraq, 1973-ci ildə Azərbaycan EA Rəyasət Heyətinin Sərəncamı ilə o, doktorluq dissertasiyasının üzərində işləmək üçün yenidən SSRİ EA Biofizika İnstitutuna ezam edilmişdir. X.M.Qasımov 1980-ci ildə Biofizika İnstitutunda müvəffəqiyyətlə doktorluq dissertasiyasını müdafiə etmişdir. Xəlil müəllimə dəfələrlə bu institutda qalıb işləmək təklif olunsa da, o, elmi fəaliyyətini Azərbaycanda davam etdirməyi üstün tutmuş və vətənə qayıtmışdır. Uzun illər Botanika İnstitutunda Hüceyrə biofizikası laboratoriyasının müdiri vəzifəsində çalışmışdır. 2001-ci ildə Azərbaycan Milli EA-nın müxbir üzvü seçilmişdir.

X.M.Qasımovun apardığı elmi-tədqiqat işləri hüceyrə membranlarında mövcud olan transport sistemlərin molekulyar təşkili, qeyri-üzvi və üzvi birləşmələrin membranlardan seçici yolla nəql edilməsi, ion kanalların yaradılması və membranlarda kanalların işləmə prinsiplərinin mexanizminin tədqiqi, membran texnologiyasının nəzəri əsaslarının yaradılması ilə əlaqədar olan geniş problemləri əhatə edir. Onun ilk uğurlarından biri məhz membranlara həssas polien antibiotiklərin aşkar edilməsi, onların molekulyar mexanizminin tədqiqi olmuşdur. X.M.Qasımov sovet alimlərindən birinci olaraq molekulyar səviyyədə polien antibiotiklərin membranlara təsiredici mexanizmini tədqiq etmiş və ion kanallarının yaranması nəzəriyyəsini irəli sürmüşdür. İlk dəfə olaraq, polien antibiotiklərin membranlarda yaratdığı tək ion kanallarını aşkar edilmiş və onların fiziki-kimyəvi xassələri ətraflı öyrənilmişdir. Alim öz elmi-tədqiqat işlərində göstərmişdir ki, polien antibiotiklərinin membranlara olan yüksək həssaslığı onların tərkibindəki xolesterinlə bağlıdır. O, dünyada ilk dəfə olaraq polien antibiotiklərin xolesterinlə qarşılıqlı təsirini tədqiq etmiş və membranlarda molekulyar ölçüdə ion kanallarının yaradılmasını sübut etmişdir. Təsadüfi deyil ki, o, 1999 və 2000-ci illərdə Avropada tibbi biologiya sahəsində məşhur olan Pyer-Mariya Küri adına Paris Universitetində fəaliyyət göstərən professor Cak Bolardın laboratoriyasına mühazirələr oxumaq və tədqiqat işləri aparmaq üçün dəvət almışdır.

Xəlil Qasımovun apardığı tədqiqat işləri böyük praktiki əhəmiyyətə malikdir. Polien antibiotiklər tibb sahəsində göbələk infeksiyalarına qarşı istifadə olunan ən effektiv birləşmələrdən biri hesab olunur. Onların bioloji aktivliyini təyin etmək üçün Xəlil müəllimin tərəfindən yeni üsul yaradılmış və Rusiyanın Federasiyasının patenti verilmişdir. Bu patentdə yeni texnologiya öz əksini tapdığına görə Sankt-Peterburqda Antibiotiklər və Fermentlər elmi-tədqiqat Texnologiya İnstitutunda və Penzada tibb preparatları istehsal edən Biosintez zavodunda tətbiq olunmuşdur.

Xəlil Qasımov 150-dən artıq elmi əsərin və monoqrafiyanın müəllifidir. Onun rəhbərliyi altında 6 fəlsəfə doktoru və 1 doktorluq dissertasiyası müdafiə olunmuşdur. 1985-ci ildə Rusiya EA Rəyasət Heyətində fəaliyyət göstərən Bioloji membranlar şurasının üzvü seçilmişdir. 1994-ci ildən 1998-ci illərə qədər Azərbaycan Prezidenti yanında Ali Attestasiya Komissiyasının (AAK) Bioloji bölmənin sədr müavini, sonra isə sədri vəzifəsində çalışmış, AAK-ın Heyətinin üzvü olmuşdur.

Xəlil Qasımovun Azərbaycan gənc kadrların hazırlanmasında xidmətləri böyükdür. O, uzun illər Bakı Dövlət Universitetində və Azərbaycan Tibb Universitetində Biofizika ixtisası üzrə mühazirələr oxumuşdur.

Hal-hazırda X.M.Qasımov AMEA Botanika İnstitutunda baş elmi işçi, eyni zamanda Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasında Fiziologiya kafedrasının müdiri kimi öz fəaliyyətini uğurla davam etdirir.

# ZƏKƏRİYYƏ MƏMMƏDOV – 80



Biologiya elmlər doktoru, professor Zəkəriyyə Məhərrəm oğlu Məmmədov 1937-ci ildə anadan olmuşdur. 1964-cü ildə Azərbaycan Dövlət Universitetinin Biologiya fakültəsini bitirmişdir. 1960-cı ildən başlayaraq, Azərbaycan EA Zoologiya İnstitutunda baş laborant, kiçik elmi işçi, elmi işçi, böyük elmi işçi, baş elmi içşi vəzifələrində işləmişdir. 1965-ci ildə Zoologiya İnstitutunda "Entomologiya" ixtisası üzrə aspiranturaya daxil olmuşdur. 1969-cu ildə "*Naxçıvan MR-sı şəraitində meyvə bitkiləri zərərvericilərinin parazitləri*" mövzusunda namizədlik, 1993-cü ildə isə "Azərbaycanda meyvə bitkilərinə zərərverən pulcuqqanadlıların parazitləri və onlardan bioloji mübarizədə istifadə olunma yolları" mövzusunda doktorluq dissertasiyasını müdafiə etmişdir. 2015-ci ildə professor elmi adı almışdır.

Zəkəriyyə Məmmədov 2006-cı ildən "Faydalı həşəratların introduksiyası və bioloji mübarizənin nəzəri əsasları" laboratoriyasının müdiridir. 2007-2017-ci illərdə isə AMEA Zoologiya İnstitutunun elmi işlər üzrə direktor müavini vəzifəsində çalışmışdır.

Z.M.Məmmədovunelmi fəaliyyəti zərərverici həşəratlara qarşı bioloji mübarizə üsulunun təsərrüfatlarda tətbiqinə həsr edilmişdir. O, ilk dəfə respublikamızda pambıq bitkisinə ciddi zərər verən pambıq sovkasının sayının azaldılmasında mühüm rol oynayan entomofaqları və entomopatogen orqanizmləri öyrənmiş, pambıq sovkasına qarşı bioloji mübarizə məqsədilə entomofaqların say meyarını müəyyən etmişdir. Onun tərəfindən ilk dəfə alma güvəsinə qarşı bioloji mübarizədə *Ageniaspis* parazitindən, meşə və meyvə ağaclarının ciddi zərər-vericisi sayılan tək ipəksarıyana qarşı mübarizədə *Suntomis* yırtıcı həşəratından arealdaxili köçürmə üsulundan istifadə edilməklə, zərərvericilərin kənd təsərrüfatı bitkilərinə vurduqları ziyanın qarşısı alınmışdır.

Z.M.Məmmədov 112-yə yaxın elmi məqalə, bir monoqrafiya, respublikanın meyvəçilik və meşə təsərrüfatlarında zərərvericilərə qarşı bioloji mübarizə məqsədi ilə tətbiq olunmuş bir neçə tövsiyyənin müəllifidir. Onun rəhbərliyi altında 6 fəlsəfə doktoru dissertasiyası müdafiə olunmuşdur.

# ELDAR NOVRUZOV – 75



Biologiya elmləri doktoru Eldar Novruz oğlu Novruzov 30 may 1942-ci ildə anadan olmuşdur. 1969-cu ildə Gəncə Dövlət Pedaqoji İnstitutunun Biologiya fakültəsini fərqlənmə diplomu ilə bitirmiş, bir il Şərur rayonunun Gümüşlü qəsəbə orta məktəbində kimya-biologiya müəllimi işləmişdir. 1970-ci ildə Azərbaycan EA Botanika İnstitutunun əyani aspiranturasına daxil olmuşdur. 1973-cü ildə aspiranturanı bitirdikdən sonra onun bütün elmi fəaliyyəti Botanika İnstitutu ilə bağlı olmuşdur. Burada o kiçik elmi işçi vəzifəsindən baş elmi işçi vəzifəsinə kimi yüksəlmişdir. Hazırda Bitki ehtiyatları şöbəsinin müdiri, AMEA Botanika institutunun elmi işlər üzrə direktor müavini işləyir.

E.N.Novruzov 1975-ci ildə "*Solanum* cinsi növlərinin qlikoalkaloid tərkibinin tədqiqi" mövzusunda namizədlik, 2007-ci ildə "*Bitkilərin reproduktiv orqanlarının piqmentləri və onların əhəmiyyəti*" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1987-ci ildə SSRİ Ali Atestasiya Komissiyası tərəfindən "Biokimya" ixtisası üzrə baş elmi işçi elmi adı verilmişdir.

Onun elmi-tədqiqat işlərinin əsas istiqamətini bitkilər aləmində yayılmış müxtəlif qrup bioloji fəal maddələrin, o cümlədən antosianlar, flavanoidlər, karotinoidlər, betasianlar, qlikoalkaloidlər, saponinlər, sterinlər, piy yağları və başqa maddələrin kimyasını, biokimyasını, texnologiyasını tədqiq etmək, onların bitkilərin həyatında bioloji, fizioloji, biokimyəvi rolunu və praktiki əhəmiyyətini müəyyən etmək, bu maddələrin bitki materialından çıxarılmasını modifikasiya etmək və daha effektiv alınma texnologiyalarını yaratmaq, bu maddələr əsasında bioloji fəal antosian, karotinoid, flavanoid, betasian, qlikoalkaloid, steroidli saponin preparatları, bioloji fəal konsentratlar və qida əlavələri almaq, onların istehsala tədbiqini həyata keçirmək təşkil edir.

E.N.Novruzovun tədqiqatlarının nəticələri nəticələri bir monoqrafiya, 164 elmi məqalə, 18 müəlliflik şəhadətnaməsi, 3 texniki şərt və 3 texnoloji instruksiyada öz əksini tapmışdır. Onun rəhbərliyi altında 3 fəlsəfə doktoru dissertasiyası müdafiə olunmuşdur.



**5 avqust 2017-ci ildə görkəmli alim və pedaqoq, bitki mühafizəsi sahəsində tanınmış mütəxəssis, AMEA-nın həqiqi üzvü SİDDİQƏ MƏMMƏDOVA dünyasını dəyişmişdir.**

Azərbaycanın elmi ictimaiyyətinə ağır itki üz vermişdir. Görkəmli bioloq alim, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, Əməkdar elm xadimi, Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin Bitki Mühafizə və Texniki Bitkilər Elmi Tədqiqat İnstitutunun direktoru, biologiya elmləri doktoru, professor Siddiqə Rza qızı Məmmədova 2017-ci il avqustun 5-də ömrünün 93-cü ilində vəfat etmişdir.

Siddiqə Məmmədova 1925-ci il mart ayının 8-də Naxçıvan Muxtar Respublikasının Şərur rayonunun Şəhriyar kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra o, 1940-1943-cü illərdə Gəncə Kənd Təsərrüfatı Texnikumunda oxumuş, 1943-1947-ci illərdə isə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun aqronomluq fakültəsində ali təhsil almışdır. Siddiqə Məmmədova 1948-1951-ci illərdə həmin institutun aspirantı olmuşdur.

Əmək fəaliyyətinə 1952-ci ildən etibarən Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda başlayan Siddiqə Məmmədova 1963-cü ilədək burada assistent və dosent vəzifələrini tutmuşdur. O, 1963-cü ildə Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin Bitki Mühafizə və Texniki Bitkilər Elmi-Tədqiqat İnstitutunun direktoru təyin edilmiş və ömrünün sonunadək həmin vəzifədə çalışmışdır.

Siddiqə Məmmədova 1952-ci ildə kənd təsərrüfatı elmləri namizədi, 1971-ci ildə biologiya elmləri doktoru elmi dərəcələrini almışdır. O, entomologiya ixtisası üzrə 1983-cü ildə Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü, 2001-ci ildə isə həqiqi üzvü seçilmişdir.

Akademik Siddiqə Məmmədova respublikada kənd təsərrüfatı elmləri sahəsində uzunmüddətli səmərəli fəaliyyətinin nəticəsi olan çoxsaylı tədqiqatları ilə tanınmış və qazandığı uğurlarla Azərbaycan elminin inkişafına töhfələr vermişdir. Siddiqə xanım əsərlərində bitkilərin mühafizəsində ekoloji cəhətdən təhlükəsiz və yeni texnologiyaların tətbiqini, eləcə də kənd təsərrüfatı bitkilərinin zərərli faunasına qarşı mübarizə üsullarının işlənib hazırlanmasını xüsusilə diqqət mərkəzində saxlamışdır. Alimin aktual mövzulara həsr olunmuş araşdırmaları respublikada aqrar elmlər qarşısında duran bir sıra mühüm vəzifələrin həllinə kömək göstərmişdir.

Siddiqə Məmmədova zəngin elmi yaradıcılığı ilə pedaqoji fəaliyyətini uğurla əlaqələndirmişdir. O, uzun illər Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda yüksək ixtisaslı kadrların hazırlanması işinə böyük əmək sərf etmişdir. Alimin rəhbərliyi ilə onlarla fəlsəfə və elmlər doktorları yetişdirilmişdir.

Siddiqə Məmmədovanın bitki mühafizəsi sahəsində apardığı çoxillik araşdırmaların nəticələri 200-dən artıq elmi əsərdə, o cümlədən 3 monoqrafiya və 5 tədris vəsaitində əksini tapmışdır. Müxtəlif ixtiralara görə aldığı 10-dan artıq patent alimin gərgin əməyinin bəhrəsidir. Siddiqə Məmmədova iştirakçısı olduğu mötəbər elmi konfrans və simpoziumlardakı əhatəli çıxışları ilə Azərbaycan elmini layiqincə təmsil etmişdir.

Siddiqə Məmmədovanın ölkədə elmin inkişafı sahəsindəki xidmətləri daim yüksək qiymətləndirilmişdir. Alim bir sıra orden və medallarla təltif edilmiş, müstəqil Azərbaycan Respublikasının ali təltiflərindən "Şöhrət" və "Şərəf" ordenlərinə, "Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu"na layiq görülmüşdür.

***Görkəmli alim və tanınmış pedaqoq, səmimi insan Siddiqə Rza qızı Məmmədovanın əziz xatirəsi onu tanıyanların qəlbində hər zaman yaşayacaqdır.***

